**AZƏRBAYCAN RESPUBLİKASI**
**BAKI İSLAM UNİVERSİTETİ**

**Kitabın adı:**
**« HƏDİS ELMİ »**

**Müəllif:**
*Rüfət Şirinov*

**Elmi redaktor:**
*Fuad Quliyev*

**Dizayn:**
*Əflatun Məmmədov*

**ISBN:**
*978-9952-8121-9-2*

Bu kitab, Bakı İslam Universiteti Zaqatala korpusunda hazırlanmış və elmi şuranın 10 fevral 2011-ci il tarixli iclasının 3 saylı qərarına əsasən nəşr edilmişdir.
**Dərs kitabları №: 2**

Ünvan: **AZ6200, Zaqatala Şəhəri,**
**Heydər Əliyev prospekti №: 88**
Tel: **(+994 174) 5 32 46**
Faks: **(+994 174) 5 21 83**
e-mail: **zakatalailahiyat@gmail.com**

## ÖN SÖZ

Allaha həmd kainatın fəxri olan Peyğəmbəri Mühəmmədə və əhlinə salat və salam olsun.

İslam dinin əsas mənbələri Quran və Sünnədir. Quran günümüzə qədər həm yazılaraq həm də əzbərlənərək nöqsansız olaraq gəlib çatmışdır. Hədislər isə müəyyən zamanda əzbərlənərək daha sonra isə yazılaraq sonrakı nəslə çatdırılmışdır.

Hədislərin lazımı şəkildə anlaşılması, zamanına görə şərh edilməsi və Peyğəmbərin məsajını düzgün şəkildə anlamaq üçün ilk növbədə tarixi seyri yaxşı bilməli digər tərəfdən də bu tarixi müddət ərzində meydana gələn istilahlar (termin) bilinməlidir.

Azərbaycanda hədislərin metodologiya və anlama mərkəzli əsərlərin sayıları olduqca azdır. Biz də bu əksikliyi hiss edərək hədis istilah və qaydalarından bəhs edən kitab qələmə almağı düşündük. Bu əsər ilk növbədə din ixtisası tədris edən tələbələr üçün nəzərdə tutulmuşdur. Bununla yanaşı hədislə maraqlanan hər kəs yaraya məlhəm ola biləcək məlumatlar tapa biləcəyini ümüd edirik.

Əsər üç bölmədən ibarətdir. Birinci bölmədə hədisin tarixçəsi haqqnda məlumatlar təqdim olunmuşdur. İkinci bölmədə hədis üsulu (metodologiyası) və bəzi terminlər haqqında məlumatlar verilmişdir. Üçüncü bölmədə isə hədis ədəbiyyatından önəmli olan bəzi əsərlər tanıdılmışdır.

Əsərin hazırlanmasında ilk növbədə aşağıdakı əsərlərdən istifadə olunmuşdur; (önəm sırasına görə)

Birinci bölmə;

1. *Selman Başaran və M. Ali Sönməz,* ***Hadis Usulü ve Tarihi***
2. Ondokuz Mayıs Universiteti hədis müəllimləri Yavuz Ünal və Osman Günərin hədis dərsi konispektləri

İkinci bölmə;

1. *Mahmud Tahhan,* ***Teysiru mustalahil-hədis.***
2. İsmail Lütfi Çakan, Hadis Usulü
3. *Selman Başaran və M. Ali Sönməz,* ***Hadis Usulü ve Tarihi***
4. *Mustafa Safiyuddin, (tərc. H. Arif Heydəroğlu)* ***Hədis I, II, III,***

Üçüncü bölmə;

1. *İsmail Lütfi Çakan,* ***Hadis Edebiyatı.***

Bu əsərlərlə yanaşı hədis sahəsi ilə əlaqəli digər əsərlərdən də istifadə edilmişdir. Həmən əsərlər istifadə olunmuş ədəbiyyat qismində qeyd edilmişdir.

Bu əsəri hazırlamaqla xətasız olduğunu iddia etmə cəhalətindən Allaha sığınıram.

Əsərin hazırlanmasında əməyi olan hər kəsə təşəkkür edirəm.

Bu əsərin bu sahədə cığır açması ümid və təmənniləriylə…

*Şirinov Rüfət Tacı oğlu*
*Zaqatala*

## HƏDİS ELMİ İLƏ ƏLAQƏLİ BƏZİ TERMİNLƏR

### A. SÜNNƏ

Sünnə Lüğətdə yaxşı və ya pis olsun *təriq* (yol) və *sirə müstəmirrə* (davamlı gediş) mənasına gələn kəlmədir. Termin olaraq isə, həzrət Peyğəmbərin həyatında izlədiyi yol, hərəkət tərzləri və yaşayış hallarıdır.

Sünnə kəlməsi Qurani Kərimdə: "***Sünnətullah***"[1], ***"Sünnətüna"***[2], ***"Sünnətül-əvvəlin"***[3], ***"sünənəlləzinə min qabliküm"***[4], ***"Sünnətə mən qad ərsəlna min qablikə min rasulina"***[5] kimi ifadələrlə keçməkdədir. Adı keçən ayələri öncə və sonra gələn ayələrlə bərabər incələnəndə, bu ifadənin: **"Allahın dəyişməyən hökmü, onun dəyişməyən icrası, ilk zamanlardan günümüzə qədər dəyişmədən gələn adəti, əvvəlki ümmətlərə tədbiq edilən ilahi qanunlar"** kimi mənalar ifadə etdiyinə şahid olarıq.

Allah Təala, heç kimə fərqli davranmadığını; istər dünya nizamını işlətməkdə, istər Peyğəmbərlərə və onların ümmətlərinə davranmaqda eyni qanunun hökmünü ***"dəyişməyən icraat"*** mənasında, **"*Sünnə*"** kəlməsi ilə ifadə etmişdir.

---

1 Əhzab, 33/38, 62; Fatir, 35/43; Fətih, 48/23; Mumin, 40/85.
2 İsra, 17/77.
3 Fatir, 35/43; Ənfal, 8/38; Hicr, 15/13; Kəhf, 18/55.
4 Nisa, 4/26.
5 İsra, 17/77.

Hədisi-şəriflərdə ***"Sünnə"*** kəlməsinin fərqli istifadə şəkilləri qarşımıza çıxır. Bütün bu mətnlərdəki ortaq nöqtə, Sünnənin; ***"yol, cığır, tətbiqat"*** mənasıdır.

Bunlardan; ***"Sünnətün-Nəbi, Sünnətü Rəsulillah, əs-Sünnətün-Nəbəviyyə"*** ifadələri, həzrət Peyğəmbərin davranış üslublarını ifadə edir.

*"... Məndən sonra çətin ixtilaflarla qarşılaşacaqsınız. Belə halda, sizə, mənim Sünnəmə və doğru yolu göstərən Raşidi-xəlifələrin sünnəsinə sarılmağınızı tövsiyə edirəm..."* hədisində, Sünnə ifadəsi, ***"doğru yol, nümunə alınacaq hərəkət"*** mənasının əvəzinə istifadə edilmişdir.

Yaxşı və ya pis cığır açma, arxadan gələcəklər üçün *adət* ola biləcək bir hərəkət etmə, mənasını ifadə edən bu hədis də olduqca məşhurdur:

*"Kim İslamda yaxşı cığır açarsa* (من سن سنة حسنة) *ona, həm onun savabı, həmdə qiyamətə qədər onu işləyənlərin savabı vardır. Kim də, pis bir adət çıxararsa* (من سن سنة سيئة ) *ona da, həm onun, həm də qiyamətə qədər onu işləyənin günahı yazılar."*[6] Fərqli təriqlərlə gələn bu hədis mətnində ifadə edilən ***"Sünnə"*** ifadəsindən məqsəd, ***"bidət və zəlalət"*** terminlərinin ziddi olduğu görülür.[7]

Lüğət mənası olaraq yuxardakı şəkildə istifadə edilən Sünnə kəlməsi, İslamın ilk dövrlərindən etibarən xüsusi bir məna qazanıb, yenə də təriq (yol) və sirət (gediş) mənalarını qorumaqla bərabər, bu mənalar, sadəcə həzrət Peyğəmbərin təriq və sirətinə təxsis edilmişdir. Ancaq həzrət Peyğəmbərin təriq və sirətinin, Allahın təbliğinə məmur etdiyi "din" ilə əlaqəli olmasına bağlı olaraq, kəlmənin ifadı etdiyi "pis yol" mənası termin olaraq istifadədən qaldırılmışdır. Çünki mövzu həzrət Peyğəmbərin

6 Müslim, Elm, 15; Nəsai, Zəkat, 64.
7 Yardım Ali, *Hadis,* s. 30, 31.

sünnəsi olduqda, bu sünnənin pislənməyə layiq yol ve gediş olması qeyri mümkündür. Əksinə bu yol və gediş, təriflənməyə və nümunə alınmaya layiqdir.[8] Qurani Kərimdə yer alan bəzi ayələrdə bu mənanı açıq şəkildə görmək mümkündür; ***"Həqiqətən, Allahın Rəsulu Allaha, qiyamət gününə ümid bəsləyənlər** (Allahdan, qiyamət günündən qorxanlar) **və Allahı çox zikr edənlər üçün gözəl örnəkdir."***[9]

***"...Sən** (onunla insanları) **düz yola yönəldirsən** (islam dininə dəvət edib haqqa qovuşdurursan)**..."***[10]

Bizə görə burada əsas məsələ, həzrət Peyğəmbərin ***"mənim Sünnəm"***-deyə ifadə etdiyi ölçünün təyinidir. Belə ki, həzrət Peyğəmbərə nisbət edilən ***"Sünnə"***ifadəsinin həqiqəti nədir?

İfadə etmək yerində olar ki, həzrət Peyğəmbərə nisbət edilən ***"Sünnə"*** qavramı ilə ***"əxlaq"*** termini eyni mənada istifadə edilmişdir. Çünki hər ikisi də, həzrət Peyğəmbərin bütün həyatı boyu davam etdiyi və çox çətin mane ilə qarşılaşmayınca tərk etmədiyi hərəkətlərdir**.**

*Sünnə*, həzrət Peyğəmbər üçün ***"fitrəti saniyə"***, yəni ikinci yaradılma və dəyişməyən xarakter olmuş davranışların ifadəsidir.[11]

Sünnənin termin mənasına örnək olaraq həzrət Peyğəmbərin *"Kim mənim Sünnəmdən üz döndərərsə, məndən deyildir"*[12] hədisini göstərə bilərik.

Sünnə Allah Rəsulunun dünya görüşünü əks edir. Yəni sünnə, Allahın kitabının həzrət Peyğəmbər tərəfindən edilən hərtərəfli

8 Koçyiğit Talat, *Hadis Usulü,* s. 1-2.
9 Əhzab, 33/21.
10 Şura, 42/52; 53
11 Yardım, *Hadis I-II,* s. 31.
12 Buxari, Nikah, 1.

şərhidir. Hədislər də bu şərhin yazılı vəsiqəsidir. Sünnəsiz müsəlman olmayacağı kimi, sünnəsiz müsəlmanlıq da ola bilməz.

İslam alimləri həzrət Peyğəmbərin bu xarakterdəki Sünnələrini üç qurupda təsnif etmişdirlər.

**1. Qövlü sünnə (əs-Sünnətül-qavliyyə)**

Həzrət Peyğəmbər əleyhissalamın bütün kəlamları bu növ sünnəyə daxildir. Şəkil və rəvayət şəkilləriylə digərlərindən fərqlidir. ***Qalən-Nəbiyyu*** və ya ***Qalə Rasülullah,*** *"həzrət Peyğəmbər belə buyurmuşdu"* rəvayət terminlərilə ifadə edilir.

Bu hədis qövlü sünnəyə nümunədir:

اِيَّاكُمْ وَ الظَّنَ فَاِنَّ الظَّنَّ اَكْذَبُ الْحَدِيثِ. وَ لاَ تَحَسَّسوُا وَ لاَ تَجَسَّسوُا وَ لاَ تَنَافَسوُا وَ لاَ تَحَاسَدوُا وَ لاَ تَباَغَضوُا وَ لاَ تَدَابَروُا وَ كُونوُا عِباَدَ اللهِ اِخْوَانا.

*"Zənn bəsləməkdən uzaq durun. Çünki pis zənn, sözlərin ən yalan olanıdır. Bir-birinizin (gizli) danışığına qulaq asmayın. Bir-birinizin gizli hallarını araşdırmayın. Bir-birinizlə mənfəət yarışına girməyin. Bir-birinizə həsəd etməyin. Bir-birinizə kin bəsləməyin. Bir-birinizə arxa çevirməyin. Ey Allahın qulları qardaş olun"*[13]

**2. Feli sünnə (əs-Sünnətül-filiyyə)**

Onun bütün feil və hərəkətləri bu növ sünnədən sayılır. Feili sünnələrdə ifadələr həzrət Peyğəmbər əleyhissalama aid deyildir. Onu görən və ya hadisəyi nəql edən sahabilərdən birinə aiddir. Rəvayət şəkli olaraq dəyişik ifadələrdən istifadə olunur; ***"Kanən-Nəbiyyu*** *(həzrət Peyğəmbər belə idi, belə edərdi...)*, ***"Raəytün-Nəbiyyə***

13 Müslim, Birr, 28.

*(həzrət Peyğəmbərin belə etdiyini gördüm)...* kimi ifadələrlə başlayan mətnlər feli sünnəyə işarə edir.[14]

Feli sünnəyə nümunə olaraq bu hədisi göstərə bilərik:

رَاَيْتُ النَّبِيَّ (ص) اِذَا سَجَدَ وَضَعَ رُكْبَتَيْهِ قَبْلَ يَدَيْهِ وَ اِذَا نَهَضَ رَفَعَ يَدَيْهِ قَبْلَ رُكَبَتَيْهِ

*"Allah Rəsulunu (s) (namaz qıldığı vaxt) gördüm. Səcdəyə gedərkən dizlərini əllərindən əvvəl yerə qoydu. Səcdədən qalxarkən də əllərini dizlərindən əvvəl yerdən qaldırdı."*[15]

### 3. Təqriri sünnə (əs-Sünnətüt-təqririyyə)

Həzrət Peyğəmbərin hüzurunda başqaları tərəfindən söylənən sözlər, edilən işlər və ya özünə çatan xəbərlər qarşısında susması və bunları nə təriflməsi nədə tənqid etməsinə ***"Təqriri Sünnə"*** deyilir.

عَنْ اَبِي سَعِيدٍ اَنَّ رَجُلَيْنِ تَيَمَّمَا وَصَلَّيَا ثُمَّ وَجَدَا مَاءً فِي الْوَقْتِ فَتَوَضَّاَ اَحَدُهُمَا وَعَادَ لِصَلاَتِهِ مَا كَانَ فِي الْوَقْتِ وَ لَمْ يُعِدِ الْاَخَرُ فَسَاَلَ النَّبِيَّ (ص) فَقَالَ لِلَّذِى لَمْ يُعِدْ: اَصَبْتَ السُّنَّةَ وَاَجْزَاَتْكَ صَلاَتُكَ. وَ قَالَ لِلْاَخَرِ: اَمَّا اَنْتَ فَلَكَ مِثْلُ سَهْمِ جَمْعٍ.

Əbu Səid əl-Xudri anladır: *"Səfərə çıxan iki dostun yanlarında su yox idi. Təyəmmüm edib namazlarını qıldılar. Daha sonra vaxt çıxmadan su tapdılar. Birisi dəstəmaz alıb təyəmmümlə qıldığı namazı yenidən qıldı, digəri qılmadı. Hadisəni anlatdıqlarında Rəsulullah (s) namazını yenidən qılmayan səhabiyə; sən sünnəyə uyğun davrandın, namazın oldu. Namazını təkrar qılan səhabiyə də; "sənə də iki qat savab var"* [16] dedi.

14 Peyğəmbərimizin Şəmailinə aid hədislər də feli sünnənin rəvayət metoduna bənzər şəkildə rəvayət olunmuşdur.

15 Əbu Davud, Salat, 57.

16 Nəsai, Təharət, 433.

Bu iki səhabənin eyni mövzuda fərqli davranmalarına baxmayaraq Peyğəmbərimiz hər ikisini də təsdiqləmişdir.

Quran və sünnədə açıq hökmü olmayan mövzularda səhabənin öz rəylərinə dayanaraq etdiyi əməlləri həzrət Peyğəmbərin qəbul etməsi də təqriri sünnəyə daxildir. Misal olaraq Hüzeyfəmin rəvayət etdiyi, *"Əshab Peyğəmbərimiz ilə eyni süfrədə yemək yediklərində, Rəsulullah yeməyə başlamayınca onlar əllərini uzatmazdılar*[17], hədisini göstərə bilərik. Peyğəmbərimizin buna səs çıxarmaması bu davranışdan xoşlandığını, və beləliklə də süfrədə yeməyə böyüklərdən əvvəl başlamamanın bir sünnə olduğunu göstərir.

Sünnənin bu üç növünə (qövlü, feli, təqriri) müştərək misal olaraq bu hədisi göstərə bilərik:

-Allah özündən və atasından razı olsun – Abdullah ibn Ömər demişdi ki:

Nəbi əleyhissalam qızıl üzük taxdı, əshab da qızıl üzük taxdılar. (Birgün) Nəbi əleyhissalam;

*"Mən bir qızıl üzük taxmışdım"* –deyərək üzüyünü çıxartdı və *"Bundan sonra onu heç vaxt taxmayacam"*-dedi.

Bunu görən səhabə də qızıl üzüklərini (bir də taxmamaq niyyəti ilə) çıxardılar.[18]

Burada həzrət Peyğəmbərin üzük taxması və sonra onu çıxarıb atması feil, **"onu birdə taxmayacam"** deməsi söz, əshabın əvvəl üzük taxmalarına, sonra da özünə tabe olaraq bundan imtina etmələrinə müdaxilə etməməsi də təqriri sünnədir.

17 Müslim, Əşribə, 102.
18 Buxari, İtisam, 4.

## B. HƏDİS

Hədis kəlməsi, lüğətdə yeni, xəbər və söz mənalarına gəlir. Həzrət Aişənin Ənsara dua edərkən bu kəlməni "qədimin ziddi" yəni "yeni" mənasında işlətmişdir.

جَزَاهُمُ اللهُ فِي الْحَدِيثِ وَ الْقَدِيمِ

*"Həm köhnə həm də təzə həyatlarında Allah onları xeyirlə mükafatlandırsın."*[19]

Ayədəki (هَلْ اَتَاكَ حَدِيثُ مُوسي) *"Musanın xəbəri sənə gəldimi?"*[20] ifadəsində də hədis kəlməsi xəbər mənasında istifadə edilmişdir.

Hədis kəlməsinin termin mənası isə **söz, feil, təqrir, yaradılma və ya xasiyyəti ilə əlaqəli bir sifət olaraq həzrət Peyğəmbər əleyhissalama nisbət edilən hər şeyin onu görənlər tərəfindən müəyyənləşdirilib ifadələndirilməsidir.**

Həzrət Peyğəmbərin Əbu Hüreyrəyə xitab edərək söylədiyi sözün içində keçən "*hədis*" termini, sanki sonraki dövrlərdə həzrət Peyğəmbərin sözlərinə hədis deyilməsi üçün göstərilən işarəyə bənzəyir. Bu mətn belədir:

Əbu Hüreyrə Peyğəmbərə; "*Qiyamət günündə sənin şəfaətinə nail olacaq ən xoşbəxt şəxs kimdir ey Allahın Elçisi?*"-deyə soruşanda həzrət Peyğəmbər ona belə cavab vermişdi: *"...Ey Əbu Hüreyrə hədisə qarşı sevgini bildiyim üçün səndən öncə heç kimin bu **xəbər** haqqında mənə sual soruşmayacağını güman edirdim. Qiyamət günü mənim şəfaətimə nail olacaq ən xoşbəxt adam səmimi qəlbdən La ilahə illallah deyəndir"*.[21]

19 Əhməd ibn Hənbəl, Müsnəd, VI, 8.
20 Taha, 20/9.
21 Buxari, Elm, 33.

Hədis bir növ "həzrət Peyğəmbər bilgisi" mənasına gəlir. Tərifə görə, həzrət Peyğəmbəri tanıdan, Onun hər hansı bir cəhəti haqqında məlumat verən ilk üç nəsilə aid sözlü ifadələr də *hədis* olma vəsfini qazanmış olur. Hədis kəlməsinin cəmi əhadisdir.

**1. Sünnə ilə hədis arasindaki fərqlər**

Hədis kəlməsi, ümumiyyətlə həzrət Peyğəmbərin sözlərinə nisbət edilməklə bərabər, İslam alimləri tərəfindən kəlmənin dəlalət etdiyi məna cəhətindən bəzi fərqli görüşlər də irəli sürülmüşdür. Odur ki, bəzi usul alimlərinə görə hədis, həzrət Peyğəmbərin söz, fel və təqrirlərinə nisbət olunub ki, bu mənasıyla kəlmə, eyni mənada istifadə olunan Sünnə ilə sinonimdir. Bəzi hədis alimləri isə, hədis kəlməsini, sadəcə həzrət Peyğəmbərin sözlərinə deyil, səhabə və tabiundan nəql olunan məvquf və məqtu xəbərlərə də nisbət edir. Bu baxımdan *xəbər*in də sinonimidir. Bəziləri isə yuxarıda da qeyd olunduğu kimi, hədisi sadəcə həzrət Peyğəmbərdən rəvayət edilən sözlər üçün istifadə etmiş, başqalarından gələn sözlərə də *xəbər* demişlər. Belə olan halda, hədislə xəbər arasında müəyyən bir fərqin olduğu açıq-aydın görünür.

Hədisçilər arasında məşhur olan görüşə görə hədis, nübüvvətdən əvvəl və nübüvvətdən sonra həzrət Peyğəmbərdən rəvayət edilən bütün söz, fel və təqrirlərdən ibarətdir; ancaq müsəlmanların tabe olmaqla əmr olunduqları Sünnə, bu üç şəkildə ortaya çıxan və dinə aid olan hədislərdir. Buna görə, əgər həzrət Peyğəmbərin sünnəsi, ondan söz olaraq meydana çıxar və bizə hədis olaraq çatarsa, bu hədisin təsdiqi lazım gələr. Əgər hədis, icab, təhrim və ya ibaha cəhətindən hökm ifadə edirsə ona tabe olmaq lazımdır; çünki peyğəmbərlərin nübüvvətinə dəlalət edən ayələr, onların, Allahu Təaladan nəqlən xəbər verdikləri şeylərdə xətasız olduqlarını göstərir. Buna görə də onların xəbərləri doğru-

dur. Əsasən nübüvvətin mənası da budur. Bunun içində, Allahın peyğəmbərlərə qeybdən xəbər verməsi də mövcuddur. Bu xəbəri alan peyğəmbər, onu insanlara çattırar. Onsuz da peyğəmbərlərin vəzifəsi, xalqı dəvət və Rəbbinin risalətini onlara təbliğ etməkdir.

Həzrət Peyğəmbərin Sünnəsi feil olaraq ortaya çıxar və bu fel bizə qədər gəlib çatarsa, bu felə tabe olmaq lazımdır. Tabe olunması həzrət Peyğəmbər tərəfindən əmr olunan bəzi fellər də var ki, bunların da ayrı bir xüsusiyyətləri vardır. Məsələn; *"mən necə namaz qılıramsa siz də elə namaz qılın"*, sözü feli bir Sünnəyə tabe olunmasını əmr edən qövlü bir Sünnədir.

Həzrət Peyğəmbərin təqrirləri də yenə onun hədisi içərisində yer alır. Məsələn; Həzrət Ayişənin qızlarla oynamasını, və yaxud bayram günlərində cariyələrin mahnı söyləmələrinə bir şey deməməsi (ikrarı) buna misaldır. Bunların hamısı hədisdən sayılır və məqsəd din adına dəlil ola biləcək hökmləri müəyyənləşdirməkdir; bu isə, ancaq həzrət Peyğəmbərin söz, fel və təqrirləriylə mümkündür.

Yuxarda da qeyd etdiyimiz kimi hədisə, həzrət Peyğəmbərin nübüvvətdən əvvəlki xəbərləri də daxildir. Daha nübüvvət gəlmədən əvvəl məsələn Hira mağarasında ibadətlə məşğul olması, sirətinin (surətinin) gözəlliyi, əxlaqının yüksəkliyi, doğruluğu, oxuma yazma bilməyən bir ümmi olması kimi, onunla əlaqəli xəbərlər, onun nübüvvətinin dəlili sayıldığı kimi, hamısı da müsəlmanlar üçün bir nümunə vəsiqəsidir. Ancaq nübüvvətdən əvvəlki xəbərlər həzrət Peyğəmbəri tanımaq və ona inanmaq üçündür; bunlarla əməl etmək şərt deyil.

Hədis və Sünnə arasındakı fərqləri iki qrup halında xülasələşdirə bilərik:

**Birincisi:** Hədis, Peyğəmbərimizin (s) söz, fel və təqrirləri ilə bərabər onun sifətlərəini (şəmailini) də əhatə edir. Sünnə isə onun izlədiyi yolu ifadə edir. Bu etibarla hədis Peyğəmbərmizin (s) sözünü və felini əhatə etdiyi halda, sünnə sadəcə felinə aiddir. Hədis, Peyğəmbərimizə (s) nisbət edilən bütün rəvayətləri içinə aldığı üçün Sünnədən daha genişdir.

**İkincisi:** Sünnə, dini və hüquqi tədbiqə işarət edər, ancaq hər hədis, bir hökm və ya bir tədbiqatı içinə almaya bilər. Bunun üçün də sünnə daha çox praktik tədbiqat yönündən hədis isə sözlü nəql yönundən önə çıxır.

Hədislə sünnənin ortaq yönləri isə, ikisinin də Peyğəmbərimizə (s) aid olması və rəvayət yolu ilə bizə çatmasıdır.

## 2. Hədisin dindəki yeri

İnsan, təbii olaraq bəzi şəxsiyyətləri özünə nümunə və rəhbər olaraq seçmə xüsusiyyətinə malikdir. Nümunə alınan şəxs tarixi bir şəxsiyyət olduğu kimi, öz çevrəsindən biri də olabilər. Bu vəziyyət daha çox, insanın özündən daha fərqli və daha üstün gördüyü şəxsi nümunə alma təmayülündən meydana gəlir. Allah insanın fitri istedadına uyğun olaraq, onlara yol göstərmək və rəhbərlik etmək məqsədiylə göndərdiyi Elçilərin də yüksək əxlaqla vəsiflənmiş və insanlar üçün nümunə alınacaq bir şəxsiyyət olaraq göstərmişdir. Şuphəsiz Peyğəmbər də bir insandır, ancaq adi bir insan deyil, bir insanın ola biləcəyi ən yüksək dərəcədə mükəmməl bir insandır.

Uca Allah, yeganə din İslamı insanlara təqdim etmək və İslamın bünövrəsini meydana gətirən Quranı təbliğ etmək, açıqlamaq və tətbiqdə şəxsən göstərmək məksədiylə həzrət Mühəmmədi əleyhissalamı da mükəmməl vəsiflərə bürünmüş nümunə bir elçi olaraq göndərmişdir. O peyğəmbərlikdən əvvəlki həyatında ol-

duğu kimi peyğəmbərilik dövründə də hər yönüylə insanlara nümunəlik etmiş və Allahın iradəsinə uyğun necə yaşanacağını nümayiş etmişdir. Eyni cəmiyyətdə birlikdə yaşadığı insanlar (sahabilər) də hər zaman Onun açıqlamalarını diqqətə alaraq davranışlarını həyata keçirmişdir. Hətta bəzən onu şəklən izləyib təqlid etmişlər. Qısacası, Onun elçiliyinə və nümunəliyinə diqqət yetirmədən İslamı doğru anlamaq və düzgün bir şəkildə insanlara çattırmaq mümkün deyil.

İslamın təfəkkür və quruluşun əsasını iki ünsür təşkil edir. Bunlar: Allahın kitabı Quran və Rəsulunun həyat tərzi olan sünnəsidir. Peyğəmbərin vida həcci əsnasında son tövsiyələri olaraq dilə gətirdiyi ifadələr buna açıq bir şəkildə işarə edir:

*"Sizə, tabe olduğunuz müddət ərzində sapıtmayacağınız iki şey bıraxdım; Allahın Kitabı və Rəsulunun sünnəsi."*[22]

Buna görə ortaya qoyulacaq hərhansı görüş və ya tətbiqə, ancaq bu iki qaynağa nisbət etmək surətiylə İslami xarakteristika qazandırmaq mümkündür. Əksi halda ortaya çıxacaq tətbiqin və yaxud quruluşun İslama uyğunluğundan söz etmək olmaz. Elə isə Quranın yanında sünnə də bu dinin əsas təməlidir.

Sünnə Quranın yaşanmış təfsiri, İslamın isə tətbiqidir. Odur ki, Peyğəmbər(s) təfsir olunan bir Quran və yaşayan bir İslam idi. Odur ki, Qurani- kərimi hədislər olmadan anlamaq imkansızdır. Məsələn; Qurani kərim namazın, orucun, zəkatın və həccin fərz olduğunu bildirmişdir.[23] Peyğəmbərimiz əleyhissalam da bu ibadətləri əda edərək açıqlayır.

22 İmam Malik, Muvəttə, Qədər, 3.
23 Bəqərə, 2/43, 183; Nisa, 4/3; Ali İmran, 3/97; Həcc, 22/78.

Həmçinin Qurani Kərimdə, “Namazın zamanlı olaraq fərz qılındığı”[24] bildirilmiş, ancaq bu zamanların müəyyən olunmasını, necə namaz qılınmasını, rəkatlarını sayısını Peyğəmbərimiz əleyhissalam açıqlamış və tədbiq edərək müsəlmanlara öyrətmişdir. Digər ibadətlər və hüquqi hökmlərlə əlaqəli olaraq gələn və bunların necə yerinə yetiriləcəyini bildirən hədislər də buna daxildir. Demək olar ki, hədis Qurani Kərimin gizli (bilinməyən) və ümumi olan hökmlərini izah edir və açıqlayır.

Hədislər eyni zamanda Qurani Kərimin mütləq olan bəzi hökmlərini təqyid edib sinifləndirir. Ümum ifadə edən ayələrini də təxsis edir. Məsələn; Peyğəmbərin “qatilə miras yoxdur”[25], hədisi ilə mirası, Allahın Kitabında qeyd etdiyi mirasçılardan ancaq qatilin xaricindəkilərə xüsusiləşdirməsi (təxsis etməsi) kimi.

Hədislər, Qurani Kərimdən sonra ikinci qaynaq olduğu üçün Quranda olmayan hökmləri qoyar: Məsələn; qatır, əhilləşdirilmiş eşşəklərin, şir, pələng, it kimi heyvanlarla, şahin, qartal, çalağan kimi yırtıcı quşların ətlərinin yeyilməməsi hökmü Qurani-kərimdə bidirilməmiş, bunların haram olduğunu hədislər ortaya qoymuşdur. Dənizdən ölü olaraq çıxarılan balığın yeyilə bilməsinə də Sünnə hökm vermişdir.

Nəticə olaraq ifadə edə bilərik ki, hədis, İslamın Qurandan sonra ikinci mənbəyi olduğu üçün əhəmiyyətlidir. İslamı tam və doğru bir şəkildə yaşaya bilmək üçün hədisləri öyrənmək şərt və vacibdir.

24 Nisa, 4/103.
25 Tirmizi, Fəraiz, 17; Əhməd ibn Hənbəl, I, 49.

## C. XƏBƏR

Xəbər kəlməsinin leksik mənası, bir hadisə, bir məsələ və ya hərhansı bir hadisə ilə əlaqəli rəvayət olunan məlumatdır.

Hədis elmində xəbər hədis kəlməsiylə eyni mənada istifadə edilmiş və xəbər deyiləndə həzrət Peyğəmbərin hədisləri anlaşılmışdır. Ancaq yenə də xəbərlə hədisi ayıranlar da olmuşdur. Bunlara görə hədis sadəcə həzrət Peyğəmbərdən rəvayət olunan sözlər üçün, xəbər isə həzrət Peyğəmbərdən başqalarından rəvayət olunan sözlər üçün istifadə olunmuşdur. Həzrət Peyğəmbərin sözləriylə məşğul olanlara *"muhaddisun"*, tarix, hekayə, nağil və s. rəvayətlərlə məşğul olanlara da *"axbari"* deyilmişdir. Hər hədisin xəbər olduğu, ancaq hər xəbərin hədis olmadığını deyənlər də vardır.

Xəbər kəlməsinin cəmi "Əxbar" dır.

## D. ƏSƏR

Əsər kəlmə olaraq, iz və bir əşyanın yerində qalan qalığı mənasına gəlir. Hədis elmində isə əsər kəlməsi, xəbər ilə eyni mənadadır. Ancaq Xorasanlı fəqihlər həzrət Peyğəmbərin sözlərinə ***xəbər***, onun dostları olan müsəlmanların (sahabənin) sözlərinə də ***əsər*** demişlər. Nəvəviyə (vəfatı 676/1277) görə isə istər həzrət Peyğəmbərdən, istərsə də sahabədən və ya tabiundan rəvayət olunan sözlər olsun hamısı hədisşünasların nəzərində əsərdir. Əsərin cəmi "Asar"dır.

## E. RAVİ

Lüğətdə, "nəql edən, daşıyan və çatdıran" mənasına gələn ravi kəlməsi termin olaraq "İstər qadın istərsə də kişi olsun hədisi isnadı ilə bərabər nəql edən şəxs, mənasını ifadə edir.

### 1. Ravinin Şərtləri

Bir hədisin məqbul olması, hər şeydən əvvəl, onu rəvayət edən şəxslərin güvənilən olmaları ilə bağlı olduğundan, bir ravinin rəvayətinin qəbul edilə bilməsi üçün o ravidə bəzi şərtlərin olması lazımdır. Əsasən bunlar Ədalət və Zəbt sifəti olaraq qəbul edilmişdir. İndi bunlar haqqında məlumat verək:

#### a. Ədalət

"Ravinin ədaləti" kəlmələrinin mənası, onun din işlərində haqdan ayrılmaması, günahlardan uzaq durması və şəxsiyyətini alçaldıcı yalan, aldatma, zarafata düşkünlük, kimi hərəkətlərdən uzaq olması, yaxşılıq sahibi olması deməkdir. "Dini əmrlərini həmişə yerinə yetirən, qadağalardan da həmişə uzaq duran, davranışlarında haqqı, ədaləti və doğruluğu əsas alan, dinini və şəxsiyyətini zədələyən sözləri də ağzına almayan adama adil deyilir və bu adamın doğru sözlü olduğu qəbul edilir. Bir ravinin adil sayılması üçün bu xüsusiyyətlərə malik olmalıdır:

#### 1) Müsəlman olmaq

Ravi bidət və xurafatlardan uzaq, sağlam və möhkəm bir imana sahib və ibadətlərini yerinə yetirən bir şəxs olmalıdır. Bu sifətlər, ravinin adil qəbul edilməsinin şərtidir. Bu sifətlərə sahib olmayan heç bir şəxsdən hədis qəbul edilməz. Çünki müsəlman olmayan adamlar, İslam dininin hökmlərini dəyişdirmək, İslamı səhv tanıtmaq, bidət və xurafat olan şeyləri yaymaq, müsəlmanlar arasında fitnə çıxarmaq kimi məqsədlər güdə bilərlər və bu məqsədlə də hədislərə qəsdli olaraq başqa sözlər qarışdıra bilərlər ya da hədis uydura bilərlər. Belə hallara meydan verməmək üçün ravidə, hər şeydən əvvəl, onun müsəlman olması şərti müəyyənləşdirilir.

**2) Ağıl və yetkinlik sifətlərinə sahib olmaq**

Mühəddislərə görə ravinin ağıllı olmasında məqsəd; ravinin, təmyiz qüdrətinə, yəni yaxşı ilə pisi, doğru ilə yanlışı, faydalı ilə zərərlini bir-birindən ayıra biləcək qabiliyyətə sahib olması və rəvayət etdiyi hədisi bilməsidir. Ağıllı olan, yəni yaxşı ilə pisi, doğru ilə yanlışı, faydalı ilə zərərlini bir-birindən ayıra biləcək qabiliyyətə sahib olan, rəvayət etdiyi hədisi bilən və həddi-büluğ çağına da gəlmiş olan ravi, -digər şərtləri də daşıyırsa- hədisi öyrənib almağa və rəvayət etməyə səlahiyyətli hesab edilir.

Rəvayətə başlamağa əlverişli dəqiq yaş həddinin nə olduğu xüsusunda hədis alimləri arasında fikir birliyi olmamasına baxmayaraq, ravinin ən azı təmyiz (yaxşını pisdən ayırma) çağına gəlmiş olması mövzusunda gərəkli olması fikrində birlik vardır. Ağıllı olmayan bir adam dini və hüquqi yöndən məsuliyyətli və səlahiyyətli qəbul edilməz. Təmyiz çağına gəlməmiş olan adam da hələ uşaqlıq dövründədir. Ağıllı olmayan və ya ağıllı olsa belə təmyiz çağına gəlməmiş şəxslər, hədisi tam və doğru olaraq öyrənə bilməzlər, onu qoruya bilməzlər, tam və doğru olaraq da rəvayət edilə bilməzlər.

**3) Təqva sahibi olmaq**

Ravi, böyük günahlardan uzaqlaşmaq və kiçik günah işləməyi adət halına gətirməmək mənasına gələn təqva sifətinə malik olmalıdır. Fasiqin (günahkarın) gətirdiyi xəbərin araşdırılması Quranda da ifadə edilmişdir: *"Ey iman gətirənlər! Əgər bir fasiq sizə (pis) bir xəbər gətirsə, dərhal (onun doğruluğunu) yoxlayın, yoxsa bilmədən bir qövmə pislik edər, sonra da etdiyinizə peşman olarsınız."*[26]

26 Hücurat, 49/6.

**b. Zəbt**

Ravinin, rəvayət etdiyi hədisi tam və doğru olaraq eşitməsi, başa düşməsi, əzbərləməsi, hədisi eşitdiyi andan rəvayət etdiyi zamana qədər bu vəziyyəti qoruması və lazım olduğunda hədisin eynisini nəql edə bilməsidir. Zəbt sahibi bir ravi:

1) Hədisi əzbərindən nəql edirsə, tam olaraq əzbərləmiş olmalıdır.

2) Rəvayət etmədiyi hədis təqdim edilərdə onun özünün nəql etmədiyindən əmin olmalıdır.

3) Ravi, hədisi kitabından nəql edirsə, kitabını yaxşı mühafizə etməlidir.

4) Hədisi məna ilə rəvayət edirsə, mənanı pozan amilləri bilməlidir.

Hədisi yaxşı öyrənən ravinin zəbt sahibi olduğunu başa düşmək üçün, rəvayət etdiyi hədis, sağlam, möhkəm və siqa ravilərin hədisləri ilə qarşılaşdırılır. Əgər rəvayəti onların rəvayətlərinə çox zaman uyğun düşürsə o ravi zəbt sahibi qəbul edilir. Buna qarşılıq olaraq ravi, siqa ravilərə tez-tez müxalifət edir və rəvayət etdiyi hədislər siqa ravilərin rəvayətinə ümumiyyətlə uyğun gəlmirsə o ravi zəbt sifətini itirər və hədisi sübut üçün istifadə edilə bilməz.

Ədalət və zəbt sifətlərini özündə cəm edən raviyə **siqa ravi** deyilir. Siqa ravinin rəvayət etdiyi hədislər ilə əməl edilir. Raviləri ədalət və zəbt sifətlərinə görə incələyən elmə **Cərh və Tədil** elmi deyilir.[27]

27 Bu elm haqqında sonrakı bölmələrdə məlumat veriləcəkdir.

**2. Raviləri incələmə elmi (Cərh və Tədil elmi)**

Bir ravinin, günahkarlıq, yalançılıq və s. qüsurularına görə hədis mütəxəssisləri tərəfindən rəvayətinin rədd edilməsinə cərh deyilir. Ədalət və dəqiqlik baxımından qüsurlu olan bir ravinin rəvayətinin, hədis elmində ustad olan alimlər tərəfindən -bu qüsurların olmasına görə- rədd edilməsi prosesinə də cərh deyilir.

Tədil isə ravinin, rəvayətinin qəbul edilməsinə dair onu tanıdan sifətlətlərinin qeyd edilməsiylə təzkiyə edilməsi (ədalətli, güvənilən və möhkəm olduğunun göstərilməsi) deməkdir.

Bir hədisin sənədini meydana gətirən raviləri, lazım olan şərtləri daşıyıb-daşımadıqları və hər cəhətdən etimadlı olub-olmadıqları baxımından qiymətləndirməyə və tənqidə məruz qalmağa da cərh və tədil deyilir.

Cərh və Tədil elmi, İslamın Qurandan sonra ikinci ana mənbəyi olan sünnəyi qoruma arzusundan doğmuşdur. İslami hökmlərə mənbə təşkil edən hədislərin səhhəti, hər şeydən əvvəl onları rəvayət edən ravilərin ədalət və zəbt yönündən dürüst və etibarlı olmalarına bağlıdır. Bu səbəblə cərh və tadil alimləri ravilərin şəxsiyyətlərini, rəvayət qaydalarına bağlılıqlarını, nəql etmədəki diqqət və etinalarını, nəhayət dinin əmr və qadağalarına riayət dərəcələrini diqqətli və tərəfsiz bir gözlə tənqidə tabe tutmuşlardır. Hədis elminin bu sahəsi, ən inkişaf etmiş sahələrdən biridir. Səhabədən etibarən bir çox hədis alimi bu sahədə dəyərləndirmələr etmiş, ravilərin şəxsiyyətlərini əhatə edən əsərlər yazmışlar.

Bu sahədə səhabədən həzrət Ayşə, İbn Abbas və Ənəs ibn Malik, tabiundan Şabi, İbn Sirin, Aməş, Şubə və Malik ibn Ənəs, daha sonra Abdullah ibn Mübarək, Yəhya ibn Main və Əhməd ibn Hənbəl kimi alimlər şöhrət qazanmışlardır. Ravilərin cərh və tadi-

li mövzusunda yazılmış ən önəmli əsərlər arasında: əl-İcli (vəfatı 361/972), İbn Əbi Hatim ər-Razi (vəfatı 327/939) və İbn Hibban əl-Bustinin (vəfatı 354/965) eyni adla təlif etdikləri "Kitabul-cərh vət-tədil"ləri, Əbul Fərəc İbnul Cevzinin (vəfatı 597/1201) "Kitabud-duafası", Zəhəbinin (vəfatı 748/1347) "Mizanul-İtidal fi Nəqdir-Rical" adlı əsərini demək mümkündür.

Hədis elmləri arasında cərh və tədil elmini bilmək önəmli olduğu üçün bəzi nöqtələri qeyd etmək istəyirik:

**a. Cərh və tədilin əhəmiyyəti**

**1) Cərh və tədilin ortaya qoyulmasının səbəbi**

Səhabədən sonrakı nəsil olan tabiun dövründə hədis uydurma fəaliyyəti başlayanda, o dövrün mühəddisləri, hədis uydurulmasına qarşı tədbir olaraq bir neçə üsul və qaydalar təsbit etmişlər. Bu üsul və qaydalar, təbə-tabiun dövründə də tam olaraq sistemləşdirirlmişdir.

Belə bir yola müraciət edilməsinin, yəni uydurma rəvayətlərin müəyyən edib səhih hədislərdən ayrıla bilməsi üçün bəzi üsul və qaydaların ortaya qoyulmasının səbəbi, şübhəsiz, İslamın qorunmasıdır. Çünki hədislər, İslam dininin -Qurandan sonra- ikinci təməl mənbəyidir. Hədislərə uydurma rəvayətlərin qarışması, İslamın hökmlərinin və təməl prinsiplərinin yanlış başa düşülməsinə yol açacağından, bunun qarşısını ala bilmək üçün müəyyən prinsiplərin isbat edilərək uydurma və zəif rəvayətlərin səhih hədislərdən ayrılması məcburi hala gəlmişdir. Onsuz da, vərilən bir xəbərin doğru olub-olmadığının araşdırılması, bilavasitə Allahu təala tərəfindən bu ayə ilə əmr edilmişdir:

"Ey iman edənlər! Əgər fasiq bir adam sizə bir xəbər gətirərsə onun doğruluğunu araşdırın. Yoxsa bilmədən bir cəmiyyətə pislik edərsəniz etdiyinizə sonra peşman olarsınız."[28]

Səhih hədislərin tam və doğru olaraq müəyyən edilməsi və zəif ya da uydurma olan rəvayətlərin seçilməsi mövzusunda çox diqqətli və dəqiq davranan hədis alimləri, ravilərin hallarını araşdırıb incələmiş və hər biri haqqında qiymət vermişdir. Xüsusilə, Şabi, İbn Sirin, Aməş, Abdullah ibn Mübarək, Süfyan ibn Uyəynə və Əhməd ibn Hənbəl kimi mühəddislər bu mövzuya çox əhəmiyyət vərmişdir.[29]

**2) Cərh və tədilin dini əsaslar baxımından əhəmiyyəti**

Allah, özünə ibadət etmələri üçün yaratdığı insanlara son din olaraq İslamı göndərmiş və bütün insanları bu dinə uymaqla məsuliyyətli olmağa çağırmışdır. İslamdan başqa bir dinin gəlməyəcəyi və İslamın da qiyamətə qədər davam etdiyi diqqətə alındığı zaman, bu dinin hökmlərinin doğru olaraq öyrənib tətbiq edilməsinin və eyni şəkildə doğru olaraq gələcək nəsillərə çatdırılmasının əhəmiyyəti daha yaxşı başa düşülür.

İslamın əsas qaynağı Qurandır. Quranı ən yaxşı və ən doğru şəkildə bilib anlayan və hökmlərini də tam olaraq tətbiq edən isə Peyğəmbərimizdir. Peyğəmbərimizin dini mövzulardakı əmrləri, tövsiyələri və tətbiqləri, İslami baxımdan dəqiq bir dəlildir. İslamın bütün hökmlərinin əslinə sadiq olaraq qorunması, tətbiq edilməsi və gələcək nəsillərə öyrədilməsi, Peyğəmbərimizin sünnəsinin də qorunması və doğru bir şəkildə öyrənilməsi lazımdır. Peyğəmbərimizin sünnəsi də ondan rəvayət edilən hədislərlə müəyyən edilir. Səhih hədislərin içərisinə zəif hədislər

28 Hucurat, 49/6.
29 Zəbidi, *Təcridi Sərih*, I, 352

ya da uydurma rəvayətlər qarışdırıldığı zaman isə bu rəvayətlər dini hökmlərin yanlış anlaşılmasına və başqa sözlə də yanlış tətbiqatlara səbəb olur. Bir hədisdə meydna gələ biləcək hər hansı bir dəyişiklik də o hədisdən fərqli bir hökmün çıxarılmasına yol açar. Bu baxımdan hədislərin dəqiqliklə incələnməsi, səhih olan hədislərin zəif və uydurma sözlərdən ayırd edilməsi böyük əhəmiyyət kəsb edir. Hədislərin bu yönlərdən müəyyən edilbi siniflәndirilməsində də o hədisləri rəvayət edən adamların güvənilən olub-olmadıqlarının, hədisləri doğru olaraq öyrənib doğru olaraq rəvayət edib etmədiklərinin bilinməsi lazımdır. Cərh və tədil, hədis rəvayət edən adamların vəziyyətlərini araşdırılıb incələnərək ortaya qoyulmasında birinci dərəcəli əhəmiyyətə malikdip. Buna görədir ki, hədis imamları, bu məsələyə lazım olan əhəmiyyəti vərmişlər və bunu özləri üçün bir vəzifə qəbul etmişlərdir.

**3) Cərh və tədilin ravi yönündən əhəmiyyəti**

Cərh və tədil elmi ravinin vəziyyəti müəyyən etmə yönündən də əhəmiyyətlidir. Bu elm sayəsində ravilərin vəziyyətləri, vəsfləri, güvənilən olub-olmadıqları, rəvayət etdikdləri hədislərin qəbul edilib-edilməyəcəyi kimi xüsuslar müəyyən və təyin edilir.

## F. RƏVAYƏT

Rəvayət (الرواية) kəlməsi daşımaq, nəql etmək mənaları ifadə edir. Termin olaraq da təhammül və əda ədatlarından hər hansı biri vasitəsi ilə hədisin mənbəsini isnad etmək deməkdir. Bunu hədisin öyrənilib və öyrədilməsi deyə də ifadə edə bilərik. Rəvayət bir təlim və tədris metodu olduğuna görə müəyyən üsul, qayda, ədəb, şəkil və keyfiyyətin olması labüddür. Bu incəliklərə nəzər salaq.

**1. Rəvayətin ədəbi**

Ümumi mənada rəvayət xüsusi mənada da hədis rəvayəti bir növ arxivçilikdir. Cünkü vəsiqələrin əslinə uyğun olaraq hər növ təhlükədən uzaq bir şəkildə mühafizə edilməsi və sonrakı nəsillərə çatdırılması deməkdir. Bu mənada hədisçilər də həzrət Mühəmməd ümmətinin elmi arxiv mütəxəssisləridir.

Ədəb, hər hansı bir vəzifə mənsublarının tabe olub tətbiq etdikləri mənəvi qayda və elmi metodlar olaraq tərif edilmişdir. Bu mənada biz də hədis tələbəsinin diqqət edəcəyi ədəb qaydalarını belə sıralaya bilərik:

**a. Niyyət**

Hədis tələbəsinin hədis öyrənmədəki məqsədi Allah rizası olmalıdır. Yəni niyyəti səmimi olmalıdır. Həzrət Peyğəmbər bir hədisində belə buyurur: *"Mənim sözümü öyrənib, başqalarına çatdıranların Allah (qiyamətdə ) üzünü ağartsın."*[30] Süfyan əs-Sövri də; *"Allahın razı olmasını istəyənlər üçün hədis öyrənməkdən daha üstün bir əməl bilmirəm"*-demişdir.

Hədisi dünyəvi faydalar əldə etmək üçün deyil, Allahın razılığını qazanmaq məqsədi ilə öyrənməlidir. Həzrət Peyğəmbər *" Allahın rizasını qazanma imkanı olan bir elmi, dünyəvi bir məqsəd üçün öyrənən, Cənnətin heç iyini belə ala bilməz"*-deyə buyurmuşdur.[31]

Hədis tələbəsi, Allahdan rahatlıq tövfiq, düzgünlük və gözəl əxlaq istəməlidir. Əbu Asım ən-Nəbil *"Hədis öyrənmək istəyən, dini işlərin ən ucasına sahib olub deməkdir; özünün də insanların ən üstünü olması lazımdır"*-demiştir.

30 Tirmizi. Elm, 7; Əbu Davud, Elm, 10; İbn Macə, Müqəddimə, 18; Əhməd ibn Hənbəl. V, 183.

31 Tirmizi, Elm 6.

**b. Hədisi mütəxəssislərdən tədris etmək**

Hədis tələbəsi, bütün imkanlardan istifadə edərək bu elmi əməli və təqvası ilə məşhur hədis şeyxlərindən öyrənməyə səy göstərməlidir. Əgər yaşadığı mühitdə buna imkan yoxsa, keçmişdə olduğu kimi, elm öyrənmə səfərlərinə hazır olmalıdır.

Hədis tələbəsi ali isnad axtarmalıdır. Bölgəsindəki ali isnadı bitirincə də uzaq diyarlara bu məqsədlə səyahətlər etməlidir.

**c. Öyrəndikləri ilə əməl etmək**

Quranda, bildikləri ilə əməl etməyənlər "kitab daşıyan eşşəklərə"[32] bənzədilmişdir.

İmam Şafinin müəllimi Vəki ibn əl-Cərrah da "*hədisi öyrənmək istəyirsənsə, onunla əməl et*"-demişdir.

Abdullah ibn Məsud, səhabilərin on ayə əzbərləyəndə, əməl etdiklərini və mənalarını öyrənmədikcə, başqa ayələrə keçmədiklərini xəbər verməkdədir. Başqa bir alim də "zəkat miqdarı qırxda birdir. İki yüz hədis öyrənən bu öyrəndiklərindən zəkat vermək üçün beş dənəsi ilə əməl etməlidir."

Hətta Bişr ibn Haris əl-Xafi: "*Ey Hədis əshabı, hədisin zəkatını ödəyin. Heç olmazsa iki yüz hədisdən beş dənəsi ilə mütləq əməl edin*"-demişdir.

**d. Müəllimə hörmət etmək**

Hədis tələbəsinin, hədis müəllimlərinə qarşı, hədisə qarşı olan hörmət və ədəbdən qazandığı hiss ilə hörmət bəsləməlidir. Mücahid "*utanan ya da kibirlənən elm öyrənə bilməz*"-demişdir.

32 Cümə, 62/5.

Tələbə, hədis dinləməsini uzatmamalı, müəllimin hirslənməsinə imkan verməməlidir. Zöhri, *"Məclis (hədis toplantıları vəs.) uzanarsa şeytan da nəsibini alar"*-demişdir.

**e. Yoldaşlarına kömək etmək**

Hədis tələbəsi öyrəndiklərini gizlətməməlidir. Digər yoldaşlarının da istifadə etməsini təmin etməlidir. Öyrəndikləri hədisləri aralarında müzakirə etməlidir. Çünki hədis tədrisində müzakirə tədris əsaslarından biridir. Kim bildiklərini sadəcə özü üçün və digərlərindən üstün olmaq üçün öyrənərsə, o bildiklərindən istifadə edə bilməz. Ənəs ibn Malik *"Hədisin bərəkətindən istifadə etmək üçün hədis tələbələri bir birinə kömək etməlidir"*-demişdir.

**f. Hədis üsuluna əhəmiyyət vermək**

Hədis öyrənmək istəyən hər tələbə mütləq hədis üsulna əhəmiyyət verməlidir. Çünki öyrəndikləri hədislərdən ancaq üsul qaydalarını öyrəndikdən sonra daha yaxşı faydalana bilər. Bunun üçün də məşhur hədis üsulu kitablarından faydalanmalıdır. İlk öncə ana dilindəki bir neçe üsul əsərini oxuduqdan sonra yuxarıda məlumat verdiyimiz ilk dövr üsul əsərlərindən faydalana bilər .

**2. Rəvayət Metodları**

Alimlər hədisləri öyrənmə və başqalarına nəql etmə yollarını səkkiz qrupda müəyyənləşdirmişlər. Tabiilər də bu yollardan istifadə etmişlər.

**a. Səma** (السماع)

Alimlərin çoxuna görə hədis təhəmmül (öyrətməklə öyrənmə) yollarının ən üstünü olan səma, hədisin kəlməsini, ravinin öz şeyxinin ağzından bilavasitə eşitməsi deməkdir. Bu metodda şeyx hədisi ya əzbərdən və ya yazılı bir mətndən oxuyar, tələbə də ya əzbərləyər və ya yazar, yaxud da həm yazar həm əzbərləyər. Əgər

şeyxin oxuduğu hədisləri tələbələr yazarsa, buna "imla metodu" da deyilir.

Bu metod hədis alma yollarının ən güclüsü olaraq qəbul edilir. Çünki bu metodda, hədis tələbəsi ilə hədisi rəvayət edən şeyx üz-üzə gəlirlər. Aralarında heç bir vasitə yoxdur.

Bu metoda müasir alimlər "təqrir metodu" deyirlər. Mənəvi və sosyal elmlərdə hələ də tədbiq edilməkdədir.

Səma yoluyla hədis rəvayət edənlər; Həddəsəni (حدثني) (mənə hədis olaraq söylədi), Həddəsəna (حدثنا) (Bizə hədis olaraq söylədi), Əxbərani (أخبرني) (mənə xəbər verdi), Əxbərana (أخبرنا) (Bizə xəbər verdi), Ənbəəna (أنبانا) (Bizə xəbər verdi), Səmitu (سمعت) (Eşitdim) kimi rəvayət terminlərindən istifadə edərlər. Hədis kitablarında (حدثنا) üçün (أخبرنا) ,(نا ثنا) üçün də (أنا) şəkilində ixtisarlardan istifadə olunmuşdur.

Səhabənin həzrət Peyğəmbərdən rəvayət etdikləri hədislərin çoxu səma metoduyladır.

**b. Qiraət (ərz)** (القراءة-العرض)

Kəlmənin mənasından da göründüyü kimi, tələbənin əldə etdiyi hədislərini şeyxə oxumasına qiraət deyilir. Bu oxuma əzbərdən və ya yazılı mətndən ibarət ola bilər. Hansı halda olursa olsun, oxunan hədislərə şeyxin tamamən hakim olması, lazımsa öz kitabından izləməsi şərtdir.

Tələbənin əvvəlcədən əldə etdiyi hədisləri şeyxə oxumaq surətiylə ərz etdiyinə görə bu metoda "Ərz", Ərzus-səma və ərzul-qiraət" də deyilir.

Bu üsulda şeyx, tələbəsinin təqdim etdiyi hədisləri dinləyərək yanlışı varsa düzəldir, beləliklə tələbə hədisləri müəllimindən öyrənmiş olur və başqasına da rəvayət edə bilər.

Səma və qiraət metodlarından hansının daha güclü olduğu haqqında İslam alimləri arasında ixtilaf vardır, amma ikisinin də bərabər olduğunu söyləyənlər daha çoxdur.

Səma metodunda olduğu kimi qiraər metodunun da həzrət Peyğəmbər zamanında istifadə edildiyi ifadə edilməkdədir. Məsələn, Bəra ibn Azib həzrət Peyğəmbərdən öyrəndiyi, yatarkən oxunan duanın təkrar Rəsulullaha ərz etmiş, həzrət Peyğəmbər də onu dinləmiş və oxuyanda etdiyi xətaları düzəltmişdir.[33]

Günümüzdə pedaqoqlar bu metoda, **aktif metod** deyirlər. Bu metoda görə, tələbə əvvəlcədən lazımi bilikləri toplayır və müəlliminə təqdim edər və müəllimdə yanlışlıqlar varsa düzəldər.

Qiraət yoluyla hədis rəvayət edənlər; (قرأت على فلان و هو يسمع) (filankəsin hüzurunda oxudum o da dinlədi) ləfzindən istifadə olunur. Əgər tələbə hədisi bir başqası oxuyanda dinləmişsə (قرئ على فلان و أنا أسمع) (filankəsə oxundu, mən də dinlədim) ifadəsin işlədir.

**c. İcazət** (الإجازة)

Şeyxin öz hədislərini rəvayət etmək üçün tələbəsinə icazə verməsidir. Səma və qiraət metoduyla hədis almaq mümkün olmayınca bu metoda müraciət edilmişdir.

Bu şəkildə bir icazətin məqbul ola bilməsi üçün, icazət verən şeyx, tələbənin önündə bunu açıq şəkildə söyləməlidir. Əgər sözlə ifadə etmədən sadəcə yazaraq icazət verərsə, bu mövzuda dəqiq davranan alimlərə görə bu icazət məqbul sayılmaz. Ancaq bunu məqbul hesab edənlər də vardır. Hətta, bilavasitə şeyxin yanında olmayan bir tələbəyə qiyabən verilən icazətləri etibarlı hesab edərlər.

33 Buxari, Vüdu, 75; Müslim, Zikr, 56,57.

İcazət metodunun bir neçə növü vardır. Müəyyən şeyxin müəyyən bir tələbəyə, müəyyən kitabı rəvayət etmək üçün icazə verməsi, müəyyən bir şəxsin müəyyən bir şəxsə məüyyən olmayan rəvayətlərini nəql etməsi üçün icazə verməsi, müəyyən bir şəxsin bilinməyən şəxslərə müəyyən hədis kitablarını rəvayət etmək üçün icazə verməsi, müəyyən şeyxin müəyyən olmayan rəvayətlərinin rəvayət edilməsi üçün hərkəsə icazə verməsi kimi.

İcazət yoluyla hədis raviləri, dərəcə baxımından səma və qiraətdən sonra üçüncü sırada yer alır. Bu yolla rəvayət edənlər, ümumiyyətlə, (حدثنى فلان إجازة) (bizə filankəs icazət yoluyla hədis nəql etdi), (أجازنى فلان) (mənə filankəs iczət verdi) ifadələrini işlədirlər.

İcazət metodu məşhur hədis alimləri tərəfindən etibarlı qəbul edilməmişdir.

**d. Münavilə** (المناولة)

Münavilə[34] "əldən vermə" mənasına gəlir. Şeyxin, özündən nəql və rəvayət etməsi üçün tələbəsinə bir kitab və ya yazılı bir neçə hədis səhifəsini əlinə verməsidir.

Münavilə icazətin bir növü olmaqla bərabər, kəlmənin ifadə etdiyi mənadan başa düşüldüyü kimi, buradakı əsas xüsus, yazılı hədis mətnlərinin əldən verilməsidir. Bu əldən verilmə məsələsi bəzən icazəli bəzən də icazəsiz olmaqdadır. Buna görə də münavilə metodu iki qisimdə incələnmişdir.

**1) İcazətli Münavilə:** Münavilənin ən yüksək və ən qüvvətli şəkli, şeyxin tələbəsinə kitabı və ya yazılı hədisi verərkən; "Bu kitab mənim filankəsdən rəvayətimdir. Sən də onu mənim adıma

34 Münavələ kəlməsi Azərbaycan dilinə münavilə şəklində keçdiyi üçün bu şəkildə istifadə etməyi uyğun gördük.

başqasına rəvayət edə bilərsən. Onun rəvayəti üçün sənə icazə verdim" deməsidir.

**2) İcazətsiz Münavilə:** Bu metoda görə şeyx yenə tələbəsinə: "Bu kitabın içindəkilər, mənim filankəsdən eşitdiyim və ya rəvayət hüququnu aldığım hədislərimdir"-deyər. Ancaq ona: "bunu mənim adıma rəvayət et, bu xüsusda sənə icazə verdim" deməz. Bu növ münavələ ümumiyyətlə mötəbər sayılmamışdır.

Rəvayət icazələri olub münavələ metoduyla hədis rəvayət edənlər (حدثنا فلان مناولة و إجازة) (bizə filankəs, münavələ və icazət yoluyla hədis nəql etdi) ifadəsini istifadə etdikləri kimi, icazət metodundakı ifadələri də istifadə edə bilərlər.

**e. Kitabət** (الكتابة)

Nəvəvi və Qazı İyaz kimi alimlərin kitabət deyə ifadə etdikləri bu metod, kəlmənin ifadə etdiyi mənadan da başa düşüldüyü kimi, Şeyxin, hədislərin bir qismini və ya hamısını əliylə yazaraq və ya yazdıraraq tələbəsinə verməsi və ya göndərməsidir.

Münavilə metodunda olduğu kimi kitabət metodu da icazəli və icazəsiz olaraq iki qismə ayrılır. Bu iki metod arasında mahiyət fərqi yoxdur. Sadəcə şəkil olaraq fərq var. Birində əldən verilən yazı, digərində poçt vasitəsi ilə göndərilir.

Bəzi alimlər kitabət metodunun mötəbər qəbul edilə bilməsi üçün icazətli olmasını şərt qoşsalar da, Buxari, Müslim kimi böyük mühəddislər, icazətsiz də olsa bu metodla hədis rəvayət etmişlər.

Bu metodla alınan hədisləri rəvayət edərkən bu ləfzlərdən istifadə olunur:

Kitabətlə edilən rəvayətdə كتب إلى فلان (mənə filankəs yazdı), أخبرنى فلان بالمكاتبة filankəs mükatəbə yoluyla xəbər verdi.

**f. İlam** (الإعلام)

Şeyxin, hədis yazılı mətni və ya hədis kitabını tələbəsinə göstərib, rəvayətinə icazə verdiyini ifədə etmədən "bu mənim filankəsdən rəvayətimdir" söyləməsidir. Bu üsul, bəzi ixtilaflarla bərabər alimlərin əksəriyyətinə görə məqbul qəbul edilmişdir. Bunu qəbul edən alimlərdən Malik və Zahirilərə görə şeyx tələbəyə, "Bunları rəvayət etməyə icazə vermirəm" desə də tələbənin bu kitab və ya rəvayətləri rəvayət etməsi caizdir. Şafiilərə görə isə şeyxin bu sözündən sonra tələbə o rəvayətləri nəql edə bilməz".

Bu metodla alınan hədisləri rəvayət edərkən, حدثنى فلان بالإعلام (filankəs mənə ilam yoluyla rəvayət etdi) ləfzindən istifadə olunur.

**g. Vəsiyyə** (الوصية)

Şeyxin, ölümü yaxınlaşanda və ya səyahətə çıxma əsnasında kitabı tələbəsinə vəsiyyət yoluyla bıraxmasıdır. Bu şəkildə əldə edilən kitabın rəvayət edilib edilməməsində alimlər ixtilaf etmişlərsə də alimlərin əksəriyyəti belə rəvayətin caiz olmadığı fikrini qəbul etməkdədir. Şafiilər isə bu metodla alınmış bir hədislə, "sənədinin sağlam olması şərtiylə əməl edilə bilər"görüşündədir.

**h. Vicadə** (الوجادة)

Bir şəxsin, bir şeyx ilə görüşüb yazısına heyran olduğu, özünü yaxşıca tanıyıb etimad etdiyi bir şeyxin xəttiylə (əl yazısıyla) yazılmış bir hədis kitabını tapması və ya əldə etməsidir. Hədis alimlərinin çoxu bu yolla əldə edilən kitabları ümumiyyətlə qəbul etməmişlər. Ancaq tapan şəxs, tapılan hədisləri rəvayət edəcək olarsa, hədislərin isnadını zikr etməsi və "filankəsin xətti ilə yazılmış olaraq tapdım"-deməsi şərtdir.

Əhməd ibn Hənbəlin *Müsnəd*ində və Müslimin *Cami*sində, vicadət metoduyla əldə edilən hədislər, (vicadət metoduyla rəvayət edildiyi bildirilərək)yer almaqdadır.

Bu gün səhih hədis kitablarından nəql etməmiz bir növ vicadətdir.

Tabiilər dövründə başlayan və sonrakı nəsillərdə mükəmmələşən bu metodların məqsədi, o dövrdə yayğınlaşan hədis uydurma fəaliyyətlərinin qarşısını almaqdır.

**3. Rəvayət şəkilləri**

Rəvayət şəkilləri ifadəsi ilə Peyğəmbər əleyhissalamdan eşidildiyi kimi mi yoxsa mənası ilə mi rəvayət edildiyi açıqlanmağa çalışılmışdır. Günümüzə qədər rəvayətlər iki şəkildə rəvayət olunmuşdur. Ləfzən və mənən rəvayət. İndi də bu mövzunu incələyək:

**a. Ləfzən rəvayət**

Ləfzən rəvayət, bir hədisin Peyğəmbər Əfəndimizin söylədiyi şəkildə və eyni ifadələrlə rəvayət edilməsidir.

İslam dininin Qurandan sonra ikinci qaynağı sünnə olduğu üçün sünnənin yazıldığı kimi rəvayət edilməsi əsasdır. Həzrət Peyğəmbər bir hədisdə belə buyurmuşdur: *"Bizdən bir hədis öyrənərsə və öyrəndiyi kimi başqalarına çatdırarsa Allah onun üzünü ağartsın"*[35].

Hətta bir dəfəsində nəbi kəlməsi yerinə rəsul kəlməsini işlətdiyi üçün Bəra ibn Azibə xəbərdarlıq etmişdir.

Hədis ləfzən rəvayət edilərkən həmin hədisin sözlərinin yerləri dəyişdirilməz, bir kəlmə çıxarılıb onun yerinə -eyni mənaya da

35 Tirmizi, Elm 7; Əbu Davud, Elm, 10; İbn Macə, Müqəddimə, 18; Əhməd ibn Hənbəl. V, 183

gəlsə- başqa bir söz qoyulmaz. Peyğəmbərimiz o hədisi necə söyləmişsə o şəkildə rəvayət edilir.

Hədisləri Peyğəmbərimizdən ilk öyrənən adamlar, səhabilərdir. Səhabilərin həzrət Peyğəmbərdən sonra ilk qaynaq olmaları etibariylə, hədis rəvayəti baxımından əhəmiyyəti böyükdür. Onlar, Rəsulullaha aid söz, fel, təqrir və davranışları təsbit edə bilmək və bu mövzuda səhv etməmək üçün böyük səy göstərmişlər. Öyrəndikləri hədislərin, zehinlərinə yaxşı şəkildə yerləşməsini təmin etmək üçün qarşılıqlı və toplu olaraq günlərcə müzakirəsini etmişlər. Rəsulullahın vəfatından sonra da hədislər mövzusunda eyni dəqiqliyi göstərən səhabələr, rəvayət etdikləri hədislərdə hər hansı bir nöqsanlıq etməmək üçün çox diqqətli davranmışdılar. Onların böyük əksəriyyəti, hədislərin ləfzən, yəni Peyğəmbərimiz necə söyləmişsə eyni şəkildə rəvayət edilməsini şərt qəbul etmişlər.

Ancaq dörd məzhəb imamları da daxil alimlərin əksəriyyəti dil və ədəbiyyat bilgisi olan şəxsin mənən rəvayət edə biləcəyini ifadə etmişlər. Buda bir həqiqətdir ki ləfzən rəvayət edilən hədislər mənən rəvayət edilən hədislərə nisbətən daha azdır.

Başqa bir nöqtədən baxarsaq, ləfzən rəvayətin şərt qoşulması bu işin çətinləşdirilməsi deməkdir. Halbuki, ümumiyyətlə əsas olan ləfz deyil mənadır.

**b. Mənən rəvayət**

Məna ilə rəvayət; ravinin, ifadələrini yaddaşında tam olaraq tuta bilmədiyi bir hədisin mənasını, öz ifadələrilə əslinə tam uyğun bir şəkildə izah etməsidir.

Həzrət Peyğəmbər özünə müraciət edib hədisləri əzbərlədikləri halda vaxt keçdikcə hədisləri xatırlamaqda çətinlik çəkən sə-

habələrə belə demişdir: *"Haramı halal, halalı da haram etməyəcək şəkildə mənanı pozmadığınız müddətcə, hədisləri fərqli kəlmələrlə (mənən) rəvayət etməkdə heç bir problem yoxdur."*[36]

Məna ilə hədisin rəvayətini caiz görənlər bu görüşlərinə dəlil olaraq ərəb olmayanlara dinin öz dillərində başa salınmasının ittifaqla caiz olmasını göstərirlər.

Hədislərin məna ilə rəvayətini hədisin mənasını dəyişdirməmək şərtilə caiz görənlər, bu şəkildə rəvayət edən bir ravidə, İslam, ədalət, zəbt, ağıl və həddi-büluğ şərtlərindən başqa bu vəsflərin də olmasını şərt qoşmuşlar:

1. Hədisi məna ilə rəvayət edən şəxs Ərəb dilini bütün incəlikləriylə bilməlidir.

2. Lüğət elminə tam olaraq bələd olmalıdır.

3. Kəlmənin bütün mənaları bilməlidir

4. Hədisi, mətnindəkindən fərqli sözlərlə rəvayət etdikdə, o hədisdən çıxan mənanı qoruyaraq doğru bir şəkildə ifadə etməlidir.

5. Dəyişdirilən kəlmələrin yerinə sinonimlərdən istifadə etməlidir. Məsələn; **quud** yerinə **culus** kimi.

6. Rəvayət etdiyi hədisi və mənasını doğru olaraq bilməlidir.

7. Məna ilə rəvayət edilən hədis, ləfizləri ilə ibadət edilən hədis olmamalıdır. Məsələn, təhiyyat (əttəhiyyatu) duası kimi. Bunun kimi ləfizlərlə qulluq, dini göndərənin muradına daxildir.

8. Hədis, sifət(Allahın sifətləri kimi) hədisləri kimi mütəşabeh olmamalıdır.

9. Cəvamiul-kəlim növündən olmamalıdır.

36 Xətib, *Kifayə*, s. 199-200.

10. Hədisin əsli əzbərində varsa məna əsas alınaraq rəvayət etmək caiz deyildir.

Bu xüsusiyyətlərdən hər hansı birinə sahib olmayan ravi, məna ilə rəvayət etmiş olmaz; rəvayət etsə də onun rəvayəti məqbul hesab edilməz.

## G. SƏNƏD

**Leksik mənası:** Lüğətdə "dayanılan şey, möhkəmlik, qüvvətli söz, güvənilən kəs" mənalarına gəlir

**Termin mənası:** Hədis elmində "hədisin mətninə çatdıran yoldur" ki, hədisin, silsilə halında gələn ravilərin sıra ilə adları deməkdir. Sənəd , "hədisin ilk qaynağına çatıncaya qədər təqib etdiyi yolu xəbər vermək" vəya "hədisi nəql edən ravilərin isim zənciri" kimi də tərifi verilə bilər. Misal:

حَدَّثَناَ مُحَمَّد ُ بْنُ بَشَّار قَال حَدَّثَنَا شُعبَة قَالَ حَدَّثَنِى أَبُو التَّيَّاح عَنْ أَنَس عَنْ النَّبِيّ (ص) قَالَ

İfadəsi sənədə nümunədir.

Sənəddə adları keçən şəxsə ravi deyilir. (حدثنا) və (عن) ləfizlərinə də rəvayət ləfizləri deyilir.

Sənədin raviyə, bir başqa ifadə ilə həzrət Peyğəmbərə nisbət etməyə isnad (sənəd zikr etmə) deyilir. Müasir dövrdə sənəd ilə isnad eyni mənalar üçün istifadə edilməkdədir. Ravilərin hədis nəql etməsinə rəvayət, rəvayət edilən hədisə də mərviy deyilir.

Sənədə, "tariq (yol), vəch (yön, tərz)" də deyilə bilər. Hədis kitablarında "bu hədis bu təriqdən səhihdir" kimi ifadələr təsadüf etmək mümkündür.

**1. Sənədin açıqlaması**

Sənədin bir başlanğıcı, bir də bitimi (sonu) vardır. Başlanğıcı, hədisi rəvayət edən ravidir; sonu isə, rəvayətin sona çatdığı şəxsdir. Bu da Rəsulullah (s) və ya bir səhabə yaxud da bir tabiundan ibarət olur.

Sənəddə yer alan bəzi xüsusiyyətləri anlamaq üçün yuxarıda nümunə olaraq təqdim etdiyimiz hədisin sənədini təhlil edək:

Rəsulullah (s) (vəfatı 11/632)



Ənəs ibn Malik (vəfatı 93/745). Səhabə dövrü



Əbut-Təyyah (vəfatı 128/745). Təbiun dövrü



Şöbə ibn əl-Həccac (vəfatı 160/776). Tabiun dövrü



Yəhya ibn Səid əl-Kəttan (vəfatı 197/812). Ətbaut-təbiun dövrü



Məhəmməd ibn Bəşşar (vəfatı 252/866)



əl-Buxarı (vəfatı 256/869)

Bu sənədin ibtidası yəni başlanğıcı Buxari, müntəhası yəni son qismi Rəsulullahdır. Başqa bir sözlə bizə ən yaxın qismi sənədin ibtidası, bizə ən uzaq qismi də müntəhası olaraq ifadə edə bilərik.

Bu hədis Buxariyə görə xuması yəni sənədində beş ravisi olan bir hədisdir. Əgər hədisi Buxari, Yəhya ibn Kəttandan o da Əbu Təyyahdan almış olsaydı, hədis sülasi yani üç ravi ilə nəql edilmiş hədis olardı.

**2. Sənədin oxunması**

Sənəd hər hədis kitabında yuxardakı şəkildə deyildir. İxtisar etmək məqsədilə rəvayət ləfizlərindəki قال kəlmələri yazılmamış, rəvayət ləfizləri də ixtisar şəklində yazılmış ola bilər. Bu kimi hallarda hədis sənədlərinin düzgün və tam şəkildə oxunmalıdır. Bunu nəzərə alaraq biz də bəzi hədis sənədlərini üsuluna uyğun olaraq oxunmasını göstərmək istəyirik.

Birinci örnəyi Tirmizidən təqdim edirik:[37]

حدثنا سعيد بن يعقوب الطالقاني حدثنا إبن المبارك أخبرنا حميد الطويل عن أنس بن مالك قال:
قال رسول الله عليه و سلم:...

Bu sənəd belə oxunmalıdır:

قال الترمذي حدثنا سعيد بن يعقوب الطالقاني قال حدثنا إبن المبارك قال أخبرنا حميد الطويل عن
أنس بن مالك قال: قال رسول الله عليه و سلم:...

Demək olar ki, bütün hədis kitablarında az çox buna bənzər sənədlərlə rastlaşmaq mümkündür. İndi də qarşılaşa biləcəyimiz hədis rəvayət ləfizlərinin ixtisar şəkillərini qeyd edək.

**3. Hədis sənədlərində keçən bəzi ixtisarlar**

Hədis səndlərində qarşımıza çıxan, hədisin şeyxdən hansı metodla rəvayət edildiyini göstərən rəvayət ləfizləri müəyyən vaxt ərzində bəzi ixtisarlarla yazılmışdır. Bunlardan bəziləri hədisçilər tərəfindən istəfadə edildiyi kimi bəziləri də unudulmuşdur. Biz, hədisçilər arasında istifadə halında olan ləfizlərdən bəzilərini qeyd edəcəyik:

1. (حدثنا) ləfzi ümumiyyətlə (نا) (ثنا) şəklində ixtisar edilir. (حدثني) ləfzi də (دثني) və (ثني) şəklində ixtisar edilmişdir.

37 Tirmizi, İman 2.

2. (أخبرنا), ləfzi (أنا) şəkilindən ixtisar edilmişdir.

3. (أنبأني) (أخبرني) və (أنبأنا) ləfizlərinin ixtisar edilmiş şəkillər yoxdur. Çünki onların istifadəsi digərlərinə nisbətən daha azdır.

4. عن kəlməsi xaricində qalan (سمعت), (حدثني), (أخبرنا), (حدثنا) və (أنبأنا) kimi kəlmələrin başında mütləq قال kəlməsi gəlir. Ancaq ümumiyyətlə bu kəlmə yazılmır. Ancaq hədis oxuyanda mütləq ifadə edilməlidir.

5. Sənədlərdəki أنه kəlməsi də yazılmır, ancaq oxunur.

6. Sənədlərin arasında bəzən qarşılaşılan ح hərfi də o nöqtədən sonra başqa sənədin gəldiyini ifadə edir. Bu ixtisardan hədisin bir neçə sənədini bir yerə cəm etmək üçün istifadə edilir.

**4. Sənədin önəmi**

Hər hansı bir hədisin qəbulu və rəddində yaxud da səhih, mövzu, zəif, həsən, ahad kimi siniflәndirməyə tabe tutulmasında əvvəlcə sənədə baxılır və sənəddə yer alan ravilərin güvənilirlik, dürüstlük, ədalətli olma, zəbtinin qüvvətli olması və s. vəziyyətlərə görə hədis dəyərləndirilir. Əgər ravilər lazımi şərtləri daşıyırsa və hədisin mətnində də bir qüsur yoxsa o hədis səhih hədis qəbul edilir.

Bütün bunlardan məlum olur ki, sənədin əhəmiyyəti iki nöqtədə qarşımıza çıxmaqdadır. Hədisin səhhətini təyin edib müəyyənləşdirmək üçün imkan hazırlamaq və rəvayət anarxiyasının qarşısını almaq.

Deməli, sənəd, hədis üçün çox əhəmiyyətlidir.

## H. İSNAD

İsnadın lüğətdəki mənası; dayandırmaq, dayanaq etmək, dəstəkləməkdir. İsnad kəlməsinin bir də güvənmək mənası vardır.

Bir hədis termini olaraq isə, “hədisin mətnini söyləyən kəsə xüsusi sözlərlə aid etməyə, nisbət etməyə deyilir. Bir digər ifadəylə isnad, bir hədisin sənədində yer alan ravilərin adlarını, bəzi sözlərdən istifadə etməklə sıralamaqdır” İsnad sözü bəzən sənəd mənasında da işlədilmişdir. Buna görə sənəd və isnad “bir mətnin sonrakı nəsillər tərəfindən mənbəsinə çatdırılmasıdır”

Sözü mənşəinə çatdıran şəxsə “müsnid”, mənbəsinə qədər çatdırılmış xəbərlərə də “müsnəd” deyilir.[38]

Tabiilər dövründə hər hədis mətninin başında, o mətni bir-birinə nəql edən ravi isimlərindən ibarət bir zincir vardır. Hər bir ravi bu zincirin bir halqasını təşkil edir. Bu ravilər nə qədər sağlam olarsa, zincir də o qədər sağlam olar. Buna görə də rəvayət zincirinə, hədisin səhhətini təmin etdiyi üçün “sənəd” adı verilmişdir.

### 1. İlk İsnad Tədbiqi

İlk zamanda hədislər “həzrət Peyğəmbər buyurdu ki” ifadəsi ilə nəql edilirdi. Səhabə dövründə hədislər belə nəql edilincə sağlamlığında heç bir şübhə yaranmırdı. Ancaq tabiilər dövründə vəziyyət tamamilə fərqli idi. Bir tabii, həzrət Peyğəmbəri görmədiyi üçün nəql etdiyi hədisi başqa birisindən eşitmişdir. Dinlədiyi şəxs ya özü kimi tabii və yaxud bir sahabi idi. Buna görə də hədisin kimdən dinlədiyinin bilinməsi mütləq idi. Məhəmməd ibn Sirindən (vəfatı 110/728) gələn bir rəvayətdə bu hadisə belə əks olunmaqdadır: *“İlk zamanlarda isnad soruşulmurdu. Nə vaxt ki Müsəlmanlar arasında fitnə çıxdı, bizə rəvayəti dinlədiyimiz şəxsin adını soruşmağa başladılar. Nəticədə baxırdılar, əgər rəvayət əhli sünnədən*

38 Hədisləri, ravilərini əsas alaraq hərf sırasına görə sıralayan hədis kitablarına da müsnəd deyilir.

*idiysə alırlardı, əksinə bidat əhlindən idiysə onların hədislərini rədd edirdilər”.* [39]

Bu xəbərdə də gördüyümüz kimi, isnad, müsəlmanlar arasında fitnənin zühurundan sonra soruşulmuşdur. Bu fitnənin hansı olduğu haqqında ixtilaflar vardır. Çoxunun qəbul etdiyi görüşə görə bu fitnənin həzrət Əli ilə həzrət Müaviyə arasında meydana gələn müharibədir. Çünki bu müharibənin sonunda müsəlmanlar qruplara ayrılmış və müəyyən siyasi həm də etiqadi məzhəblər meydana gəlmişdir. Görüşləri Quran və sünnəyə uyğun olmadığı üçün hədisçilər bu məzhəbləri “əhli bidət” olaraq qəbul etmişlər. Yuxarıda zikr etdiyimiz xəbərdə də bu təbir yer almışdır.

Tabiilər dövründə başlayan bu isnad tədbiqinin, o dövrdə həyatda olan səhabilər tərəfindən də mənimsəndiyi görülməkdədir. İbn Abbasın, “Rəsulullah buyurdu ki...”-deyə isnadsız olaraq hədis rəvayət etməyə çalışan tabiilərdən Büşeyr əl-Ədəviyi dinləməməsi və yaxşı tanımadığı şəxslərdən hədis almaması bunun açıq misalıdır.

Zühri də Mədinədə İshaq b Abdillahın sənədsiz olaraq “Rəsulullah buyurdu ki...” deyərək hədis rəvayət etdiyini görəndə ona müdaxilə edərək, “ Allaha qarşı bu cürətin nədir?. Hədisini isnad et. Bizə ipi, halqası olmayan hədislər rəvayət edirsən” deyərək onu təhdid etmişdir.

Göründüyü kimi sağlam hədislərin əsilsiz uydurma sözlərdən ayırmaq üçün hədis alimləri hədisləri nəql edənlərdən sağlam, güvənli sənəd istəməyə tabiilər dövründə başlamışlar. Bu dövrdən sonra sənədsiz hədislərə etibar edilməməyə və heç bir dəyər verilməməyə başlandı.

39 Muslim, Müqəddimə, 5.

## 2. Dində İsnad

Xəbəri mənşəinə qədər çatdırma metodu, yəni isnad sadəcə İslam dininə aid olan bir metoddur. İslamdan əvvəl belə tətbiqata təsadüf edilməmişdir. İbn Həzm bu mövzuda belə demişdir: "Etibarlı bir şəxsin yenə etibarlı bir şəxsdən kəsiksiz sənədlə xəbəri həzrət Peyğəmbərə nisbət etməsi digər dinlərin əksinə olaraq Allahın sadəcə müsəlmanlara nəsib etdiyi lütfüdür...".

Əbu Hatim ər-Razi (vəfatı 275/888) belə demişdir: " Peyğəmbərlərə aid xəbərləri, Allahın Adəmi yaratdığı vaxtdan bəri, bu ümmətdəkilərdən başqa heç bir ümmətdə mühafizə edən şəxslər olmamışdır".

Məhəmməd ibn Hatim ibn Müzəffər isə bu mövzu haqqında belə demişdir: "Allah bu ümmətə isnadı lütf etmiş, ümməti bununla şərəfləndirmişdir. İstər qədim, istərsə də müasir millətlərdən heç birində isnad müəssisəsi yoxdur. Onların əllərində sadəcə səhifələr vardır. Allahın özlərinə endirdiyi kitablara öz xəbərlərini qarışdırmışlar. Allahın Peyğəmbərlər vasitəsi ilə göndərdiyi Tövrat və İncilə isə tərifə layiq insanların sözləri qarışıibn Əlavə etdikləri bu ifadələri bir-birindən ayıra biləcək ölçüləri belə yoxdur.

Hədis rəvayətində İsnadın həqiqətən böyük önəmi var. Bunu alimlər belə ifadə etmişlər:

İbn Sirin: "Bu elm dindəndir. Dinini kimdən öyrəndiyinə diqqət et"[40]- demişdir.

Süfyanüs-Səvri (vəfatı 161/778): "İsnad möminin silahıdır. Yanında silahı yoxsa düşmanı ilə necə savaşacaq?"[41]

40 Müslim, Müqəddimə, 5.

41 Qasimi, *Qavaidut-təhdis*, s. 186; Xətib əl-Bağdadı, *Şərəfu əshabil-hədis*, s. 43.

Abdullah ibn Mübarək (vəfatı 181/797): "İsnad dindəndir. Əgər isnad olmasaydı din haqqında kim nə istəsə söyləyərdi"[42]. Yenə Abdullah ibn Mübarək: "Dini məsələləri isnadsız olaraq öyrətmək istəyən kimsə, nərdivansız dama çıxmaq istəyənə bənzəyir" demişdir.

İmam Şafi (vəfatı 204/819): "Sənədsiz hədis öyrənmək istəyən şəxs gecə qaranlığında odun toplayana bənzəyir. O gecə odun zənn edib zəhərli ilanı da toplayar və bundan xəbəri olmaz"-demişdir.

Bunu da ifadə etmək lazımdır ki, sənədin yerini bu gün yazılı qaynaqlar əvəz etmişdir. Dünən, "Kimdən eşitmisən?"-deyə soruşulurdu, bu gün isə "Hansı hədis qaynağında yer almaqdadır?"-deyə soruşulmaqdadır. Demək ki, bu gün bizim üçün sənəd, o hədisin sənədinin yer aldığı etibarlı hədis kitabıdır.

Elm adamlarının fikirlərinə görə: Quran xaricində, insanlıq tarixində heç bir hadisə, İslam Peyğəmbərinin sözləri qədər dərin, geniş, doğru və sağlam olaraq müəyyən edilməmişdir.

### 3. İsnadin Növləri

İsnad, ravi sayının az və ya çox olmasına görə ali isnad (الاسناد العالي) və nazil isnad (الاسناد النازل) olmaqla ikiyə ayrılır:

#### a. Ali isnad

Son ravi ilə həzrət Peyğəmbər (s) arasındakı ravilərin sayı ən az olan isnaddır. Rəvayəti qısa yoldan qaynağına götürdüyü üçün yanılma ehtimalı azdır və nazil isnada nəzərən daha mötəbərdir.

İsnad, iki ravi ilə Rəsulullaha çatırsa belə ali isnada sünai (ikili) isnad**;** (İmam-Malikin ali isnadı bu şəkildədir və bir tabiun və

42 Müslim, Müqəddimə, 5

bir səhabədən əmələ gəlmişdir); əgər üç ravi var isə buna da sülasi (üçlü) isnad deyilir.

Ancaq, ali isnad deyiləndə sağlam isnad başa düşülməlidir. Əgər ravilər arasında zəif və ya yalançılar varsa, sənəd nə qədər ali olarsa olsun xəbərin heç bir dəyəri yoxdur. Mühəddislərin, hədis üçün səyahətlərdə olmalarının səbəbi də sağlam ali isnadla rəvayət edən kəslərdən hədis ala bilməkdir.

**b. Nazil isnad**

Sənədində ravi sayı çox olan isnaddır. Ravi sayı artdıqca yanılma ehtimalı da artmış olacağına görə, bu növ isnadların, ali isnadla müqayisədə dəyəri aşağıdır.

Sənəddə, eyni dövrdə yaşamış birdən çox ravinin olması o isnadı ali olmaqdan çıxarır.

Məsələn, sənəddəki bir tabiun, hədisi bir səhabədən almalı ikən öz çağdaşı olan başqa bir tabiundan almışsa, eyni nəsildən iki dənə ravi olduğu üçün bu isnad, nazil vəziyyətinə düşər.

Bir hədis eyni səhabədən müxtəlif isnadlarla rəvayət edilmiş ola bilər. Belə olduğu halda ravi sayı az olan isnad, digərinə görə ali isnad olar. Misal:

حَدَّثَناَ مُحَمَّدُ بْنُ يُوسُفَ قَالَ حَدَّثَنَا سُفْيَانُ عَنْ عَمْرِو بْنِ عَامِرٍ قَالَ سَمِعْتُ اَنَسَ اْبنِ مَالِكٍ يَقوُلُ:

كَانَ النَّبِيُّ (ص) يَتَوَضَّأُ عِنْدَ كُلِّ صَلاَةٍ قُلْتُ: كَيْفَ كُنْتُمْ تَصنعُونَ ؟

قَالَ: يُجْزِئُ اَحَدَنَا الْوُضوُءُ مَالَمْ يُحْدِثْ.

**Bizə Məhəmməd ibn Yusuf hədis olaraq nəql etdi və dedi ki: Bizə Süfyan Əmr ibн Amirin belə dediyini nəql edib dedi ki: "Ənəs ibn Maliki bunu söyləyərkən eşitdim**: *"Nəbi (s) hər namaz vaxtında dəstəmaz alardı."* Mən "bəs siz necə edərdiniz?"-deyə soruşdum. Ənəs; "Bizə hadəs gəlməyincə (dəstəmazımız pozul-

madıqca bir vaxtdan çox namaz üçün) bir abdəst kifayət edərdi."-dedi.[43]

Eyni hədisin Tirmizidəki rəvayətinə gəlincə:

حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَشَارٍ حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ قَالَ حَدَّثَنَا سُفْيَانُ بْنُ سَعِيدٍ عَنْ عَمْرِو بْنِ عَامِرِ الْانْصَارِيِّ قَالَ: سَمِعْتُ اَنَسَ بْنِ مَالِكٍ يَقُولُ: كَانَ النَّبِيُّ (ص) يَتَوَضَّأُ عِنْدَ كُلِّ صَلاَةٍ قُلْتُ: فَأَنْتُمْ مَا كُنْتُمْ تَصْنَعُونَ ؟ قَالَ: كُنَّا نُصَلِّي الصَّلَوَاتِ كُلَّهَا بِوُضُوءٍ وَاحِدٍ مَالَمْ نُحْدِثْ.

**Bizə Məhəmməd ibn Bəşar hədis olaraq söylədi və dedi ki: Bizə Yəhya ibn Səid nəql etdi və dedi: Bizə Süfyan ibn Səid, Əmr ibn Amirin belə dediyini bildirdi: Ənəs ibn Malikin belə dediyini eşitdim**: *"Nəbi (s) hər namaz vaxtında dəstəmaz alardı"* Ona: Siz nə edərdiniz?" deyə soruşanda, Ənəs: "Biz, dəstəmazımız pozulmadıqca bütün namazları bir abdəst ilə qılardıq"-dedi.[44]

Eyni səhabədən rəvayət edilən və eyni mövzuda olan bu iki hədisdən birincisini Buxari; Məhəmməd ibn Yusuf, Süfyan, Əmr ibn Amir və Ənəs ibn Malik olmaqla dördlü bir isnadla; Tirmizi isə Məhəmməd ibn Bəşar, Yəhya ibn Səid, Süfyan ibn Səid, Əmr ibn Amir və Ənəs ibn Malikdən əmələ gələn beşli bir isnadla rəvayət etmişlər. Buna görə Buxarinin isnadı Tirmizinin isnadına görə daha alidir.

Bir isnadın (ali isnadın) nazil isnaddan üstünlüğünü seçmək üçün yalnız ravi ədədini diqqətə almaq lazım deyil. Ravi sayı çox olan bir nazil isnaddakı ravilər, ali isnadda yer alan ravilərdən daha mövsuq (güvənilən) və ya hədisi əzbər və qorumaları daha qüvvətli, yaxud da daha fəqih isə, bu kimi hallarda nazil isnad ali isnaddan üstün hesab edilir.

43 Buxari, Vudu, 54.
44 Tirmizi, Təharət , 60; Əbu Davud, Təharət, 171

İsnadı meydana gətirən ravilər hədisləri bir – birindən alanda necə gəldi deyil, müəyyən üsul və qaydalara rəayət edərək almışlar. İndi bu qaydalara nəzər salaq.

## I. MƏTN

**Leksik mənası:** Mətn kəlməsi lüğətdə "möhkəm yer, sərt və yüksək torpaq parçası" mənasına gəlməkdədir.

**Termin mənası:** Mətn, termin olaraq "hədisin, bir məna ifadə edən son və əsl bölümüdür." Bir digər təriflə mətn, "sənədin özündən sonrakı sözlü bölməsidir". Hədisin ən əhəmiyyətli qismi olan mətnə Rəsulullah əleyhissalamın sözləri daxil olduğu kimi, onun felləri və təqrirləri də daxildir.

Mətnə Nümunə:

اَنَّ النَّبِيَّ (ص) قَالَ: اَيَةُ اْلمُنَافِقِ ثَلاَثٌ, اِذَا حَدَّثَ كَذَبَ وَ اِذَا وَعَدَ اَخْلَفَ وَ اِذَا اؤْتُمِنَ خَانَ.

Rəsulullah əleyhissalam buyurdu ki: *"Münafiqin əlaməti üçdür: Danışanda yalan söylər, vəəd etdiyi zaman sözündə durmaz, ona bir şey əmanət ediləndə ona xəyanət edər.*[45]

Əslində hədis mətndən ibarətdir. Sənəd o mətnin həzrət Peyğəmbərə aid olub olmadığını incələməyə imkan verən ravilər zənciridir.

Alimlər hədis mətnlərini üsul və filologiya cəhətindən, hətta lazım gələrsə kitab və sünnənin məntiqinə uyğun olub olmadığı yönündən incələyirlər. Bu dəyərləndirmədə tarix, sosyologiya və psixologiya elminə həqiqi mənada ehtiyac hiss edilir.

Hədis alimlərinin sənəd incələməsinə əhəmiyyət verərək mətn incələməsini diqqətə almadıqları zənninə düşməmək lazımdır.

45 Buxari, İman 24, Şəhadət 28, Vəsayə 8, Ədəb 69; Müslim, İman, 107-108.

Onsuz da sənədin çox diqqətli incələnməsinin məqsədi mətn üçün və ondan düzgün nəticələr çıxarmaq üçündür. Ancaq bu da bir həqiqətdir ki, sənədlə məşğuliyyət mətnə nəzərən daha çoxdur. Bunun səbəbini də belə açıqlaya bilərik:

Hədisçilər, ilahi vəhy alan, cəvamiul-kəlim[46] xüsusiyyətinə və qanun qoyma səlahiyyətinə sahib bir peyğəmbərin ifadələri ilə üz-üzə olduqlarını bilirdilər. Bu sifətlərə sahib peyğəmbərin əsirdaşlarının fikirlərinə zid fikirlər söyləməsi və xəbər verməsi çox təbii bir hadisədir. Buna mane olacaq heç bir qanun yoxdur. O qanun maddələri kimi, xülasə sözlərlə hüquqi qaydalar da qoya bilər. Sözləri məcazi bir məna da gələcəklə əlaqəli məlumat da ifadə edə bilər.

Bütün bunlara görə hədisçilər, başqa insanlara tətbiq etdikləri tənqidləri həzrət Peyğəmbərin hədisləri üçün tətbiqdə daha ehtiyatlı hərəkət ediblər. Dərhal inkar etməyərək müəyyən zamana tərk etmişlər.

Ancaq hədislərin sənədlərində yer alan ravilərin isə, özləri kimi insan olduqlarını unutmamışlar. Onları araşdırmaq daha rahat və təhlükəsizdir. Buna görə də hədis alimləri raviləri çox dəqiq şəkildə incələyərək, onların ifadə etdikləri xəbərlərin həzrət Peyğəmbərə aid olub olmadığını müəyyən etməyə səy göstərmişlər. Buradan da məlum olur ki hədisçilər sənəd incələməsi qədər mətn incələməsinə də əhəmiyyət vermişlər.

46 Az sözlə çox məna ifadə etmək.

## I. HƏZRƏT PEYĞƏMBƏRİN DÖVRÜ

Həzrət Peyğəmbər[47] dövründə hədisini doğuşu və cəmiyyətə əks olunma şəklini qeyd etmədən, o dövrü ümumi olaraq

47 **Peyğəmbərin Vəzifələri**

Uca Allah bütün Peyğəmbərlərinə müəyyən məsuliyyətlər vermişdir. Bu məsuliyyətləri üç qrupta cəm edəbilərik.

*Birincisi:* İlahi əmrlərin təbliği.

*İkincisi:* Bu əmrlərin şəxsən tətbiqi.

*Üçüncüsü:* Bu əmrlərin insanlara açıqlanması.

Bizim Peyğəmbərimiz həzrət Mühəmmədə də verilən bu məsuliyyətləri ayələrdən müəyyənləşdirməyə çalışaq:

**a. Quranı təbliğ etmək**

İlahi vəhyə muxatab olan Allah elçisinin ilk vəzifəsi özünə vəhy olunanları insanlara təbliğ etməkdir. Təbliğ, Peyğəmbərliyin əsasıdır. Qurani Kərimdə buna belə işarə edilməkdədir:

يَا اَيُّهَا الرَّسُولُ بَلِّغْ مَا اُنْزِلَ اِلَيْكَ مِنْ رَبِّكَ وَاِنْ لَمْ تَفْعَلْ فَمَا بَلَّغْتَ رِسَالَتَهُ

*"Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə nazil ediləni (Quranı) təbliğ et. Əgər (bunu) etməsən, (Allahın) risalətini (sənə həvalə etdiyik elçilik, peyğəmbərlik vəzifəsini) yerinə yetirmiş olmazsan…"*

Həzrət Peyğəmbər təbliğ vəzifəsini yerinə yetirməklə məsuldur, ancaq insanların bunu qəbul etməmələrindən məsul deyildir. Çünki bu xüsus aşağıdaki ayədə açıq olaraq bildirilməkdədir:

وَاَطيعُوا اللّهَ وَاَطيعُوا الرَّسُولَ وَاحْذَرُوا فَاِنْ تَوَلَّيْتُمْ فَاعْلَمُوا اَنَّمَا عَلى رَسُولِنَا الْبَلَاغُ الْمُبينُ

"Allaha və Peyğəmbərə itaət edin. Əgər (itaətdən) boyun qaçırsanız, bilin ki, Peyğəmbərimizin vəzifəsi yalnız açıq bir təbliğdir (Quranı açıq-aydın təbliğ etməkdir)."

**b. Quranın əmrlərini özündə tətbiq etmək**

Həzrət Peyğəmbərin ikinci vəzifəsi Allahdan aldığı əmrlərə özünün tabe olmasıdır. Bəzi ayələrdə Uca Allah vəhyə tabe olmasını Peyğəmbərinə əmr edərək belə buyurmuşdur:

اِتَّبِعْ مَا اُوحِىَ اِلَيْكَ مِنْ رَبِّكَ لَا اِلَهَ اِلَّا هُوَ وَاَعْرِضْ عَنِ الْمُشْرِكينَ

"(Ya Rəsulum!) Rəbbindən sənə vəhy edilənə (Qurana) tabe ol. (Sən yəqin bilirsən ki) Ondan başqa heç bir tanrı yoxdur. Müşriklərdən isə üz çevir!"

dəyərləndirmək, mövzunu daha yaxşı anlamaq üçün labüd olduğuna inanırıq.

Həzrət Peyğəmbərə risalət vəzifəsi verilmədən əvvəl, Ərəblər dərin bir cəhalət içərisində üzürdülər. Cahiliyyət Ərəbləri öz əlləri ilə ettikləri daş və torpaqdan hazırlanmış bütlərə şitayiş edir, yoxsulluq və eyiblənmə qorxusuyla qız uşaqlarını diri diri torpağa basdırırdılar. İqlim quraq və sərt olduğu üçün, məişətlərini torpaqdan əldə edə bilməyən bu insanlar, həddindən artıq qəbilə təəssübkeşliyindən ən sadə səbəblərlə belə bir birilərinə basqınlar edərək barışığı mümkün olmayan düşmanlıqların doğulmasına səbəb olurdular. Qəbilələr arasında ortaya çıxan bu əsəbiyyət mübərizəsi, hər Ərəbin könlündə dərin izlər bıraxır, bir birinə qarşı qürur və kibirin həd nöqtəyə çatdığı cəmiyyət sisteminin hökm etməsinə səbəb olurdu. Qısaca cahiliyyət dövrü ərəbləri, sonu gəlməyən bir fitnə və qarışıqlıq içində son dərəcə yoxluğunu hiss ettikləri maddənin əsiri olmuşlar və həyatlarını, onu əldə etmək üçün böyük bir tamah halına gətirdikləri duyğuların əzici təzyiqi altında tənzim etmək məcburiyyətində qalmışdı.

Həzrət Mühəmməd əleyhissalamın yeni bir din təbliğ etməklə vəzifələndirilməsindən sonra cahiliyyət Ərəblərinin, bu mədəniyyətdən uzaq cəmiyyətdə ağla sığmaz bir inkişafı olmuşdur. Tövhid inancına gizli bir dəvətlə başlayan yeni din başlanğıcda Peyğəmbərin yaxınlarından bir neçə nəfər tapıb, ancaq Mədinədə dəvətin aşikar icrasından sonra qurtuluş və yüksəkliklərini Onun dinində görən ərəblər, dəstə-dəstə yeni

---

**c. İlahi əmrləri açıqlama**

Həzrət Peyğəmbərin üçüncü vəzifəsi özünə endirilən Quran ayələrini insanlara açıqlamaqdır. Quranda Peyğəmbərin bu vəzifəsi belə ifadə olunur:

وَمَا اَرْسَلْنَا مِنْ رَسُولٍ اِلَّا بِلِسَانِ قَوْمِه لِيُبَيِّنَ لَهُمْ

*"Biz hər bir peyğəmbəri yalnız öz millətinin dilində (danışan) göndərdik ki, (Allahın əmrlərini) ona izah edə bilsin..."*

dinə girməyə başlamışdılar. Bəşəri sevginin üzərində bir duyğuyla Peyğəmbər əleyhissalama bağlanan bu ilk Müsəlmanlar, Onun gətirdiyi Quran ayələrini və həyat anlayışı demək olan sünnəsini mühafizə etməyi, müqəddəs bir vəzifə kimi qəbul etmişdilər.

Bu bir həqiqətdir ki, həzrət Mühəmməd özünə verilən risalət vəzifəsini hər mərhələsində əmr edildiyi kimi lazımınca yerinə yetirmişdir. Allahın vəhylə cızdığı yolla getmiş və o yolun hüdudlarını əsla keçməmişdir. İslami prinsiplər ən açıq şəkildə onun dövründə ortaya qoyulmuş, insanların ictimai həyatını tənzim edən bu yeni nizam hər cəhətdən, Onun sağlığında həyata keçirilmişdir. Müəllimi həzrət Məhəmməd, proqramı Quran və Sünnə, tələbəsi də Səhabə olan bu yeni tərbiyə sistemi, qısa vaxtda müvəffəq nəticələr vermişdir. Heç şübhəsiz, bu vəziyyət o dövrə aid bilgilərin cəmiyyətdə yayılması və qorunması ilə mümkün olmuşdur. Belə olmasaydı onun qorunub sonrakı nəsillərə çattırılması çətinləşər, hətta imkansız olardı. Halbuki, Onun yaşadığı həyat bütün incəliklərinə qədər müəyyənləşdirilib qorunmuşdur.

## A. HƏDİSLƏRİN CƏMİYYƏTƏ ÇATMASINI TƏMİN EDƏN ƏSASLAR

Bu mərhələdə Peyğəmbər əleyhissalamın dövrünün elmi və mədəni vəziyyətini əks edən və eyni zamanda bu zəngin elm mirasının yəni hədislərin cəmiyyətə çatmasını təmin edən müxtəlif amillərdən söz etmək mümkündür.

### 1. Həzrət Peyğəmbərin elm və hədis öyrənməyə təşviq etməsi

İlk əmr **“Oxu!”**[48] olan son və mükəmməl din İslamın elmə və elm öyrənməyə göstərdiyi əhəmiyyət, mübahisəsiz bir həqiqətdir. Allah Təala (c.c.), Qurani-kərimdəki müxtəlif ayələrində elmin

48 Ələq, 96/1.

öyrənilməsini əmr etmiş,[49] bilinməyən xüsusların bilənlərdən soruİmasını istəmiş[50] bilənlə bilməyənin, alimlə cahilin bir olmayacağını göstərərək,[51] elm adamının dəyərini ucaltmışdır.[52] Bununla yanaşı Allah Təala, sadəcə elmi öyrənməklə kifayətlənməməyi, öyrənilənlərin başqalarına da öyrədilməsinin lazım olduğunu bildirmiş, həmçinin elmi gizləyənlərin cəzalandırılacaqlarını da bəyan etmişdir. Çox hədis rəvayət etdiyi üçün tənqid edilən Əbu Hüreyrə, bu tənqidlərə cavab olaraq: "Əgər Qurandakı bu iki ayə olmasaydı tək bir dənə də olsa hədis rəvayət etməzdim "*Endirdiyimiz Kitabda insanlara aşkar etdiyimiz dəlillərdən sonra göndərdiyimiz nişanələri və doğru yol göstərən ayələrimizi gizlədən kimsələr Allahın lənətinə düçar olar və bütün lənət edə bilənlər də onlara lənət oxuyar"* [53]-deməsi, səhabə arasında sünnə və hədisin rəvayətilə əlaqədar fikrinin əks edilməsi nöqtəyi nəzərdən olduqca maraqlıdır.

Hətta Peyğəmbər əleyhissalam cihada gediləcəyi zaman belə, elm təhsil edib digərlərinə təbliğ və təlimdə olmaları üçün möminlərdən bir qisminin müharibəyə getməmələrini əmr etmişdir.[54] Peyğəmbərlik vəzifəsi Allahın (c.c.) hökmlərini təbliğ və tətbiqlə əlaqədar olduğu üçün; bəndələrini elmə və elm öyrənib öyrətməyi bu cür təşviq edən Allah Təalanın onlara öz içlərindən seçib göndərdiyi elçisi, Peyğəmbərimiz əleyhissalam da ümmətinə

49 "...De ki: Ya Rəbb! Mənim üçün elmi artır" (Taha, 20/114)

50 "...Əgər siz bilməyən kimsələr isəniz, o təqdirdə bilən şəxslərdən soruşun"(Ənbiya, 21/7)

51 "...De ki; heç bilənlərlə bilməyənlər bir olarmı?" (Zümər, 39/9)

52 "Fəqət onlardan elmdə mütəxəssis olanlar və sənə endirilmiş olana və səndən əvvəl endirilmiş olana inanan, namazı dos-doğru qılan və zəkatı verən və Allaha və axirət gününə iman edən möminlər var ki; onlara əlbəttə böyük bir mükafat verəcəyik" (Nisa, 4/162)

53 Bəqərə, 2/159-160.

54 "Bütün möminlərin birdən toplanıb səfərə çıxmaları doğru deyildir. Onların hər bir firqəsindən bir zümrə dində faqih olmağa çalışmalı və qövmlərinə dönüncə də onları inzar etməlidirlər. Ümid edilir ki, onlar da çəkinərlər" (Tövbə, 9/122).

elm öyrədirdi. *"Necə ki, sizin içinizdən bir rəsul göndərdik ki, sizə bizim ayələrmizi oxuyur və sizləri təzkiyə edir və sizlərə xitab, hikmət təlim edir, və sizlərə bilmədiyiniz şeyləri öyrədir"*[55] *ayəsi, bu həqiqəti ifadə edir.*

Əshabına elm öyrədən, bildiklərini özü şəxsən yaşayan və bu yaşayışı ilə örnək olan Rəsulullah əleyhissalam, səhabələrini də elm öyrənmə və öyrətməyə təşviq edirdi. Peyğəmbər əleyhissalamın bu hədisləri, onun elmə və elm təhsilinə verdiyi əhəmiyyəti göstərir:

*"Allah, kimin xeyrini murad edərsə, onu dində faqih (anlayış sahibi) edər."*[56]

" Alimlər Peyğəmbərlərin mirascılarıdır."[57]

*"İki adamdan başqasına qibtə edilməz: Allah tərəfindən özünə mal ehsan edilib o malı haqq yolunda sərf edən kəs ilə, özünə yenə Allah tərəfindən hikmət (elm) verilib, onunla hökm edən və onu başqalarına öyrədən kəs".*[58]

*Hər kim elm axtarmaq məqsədiylə bir yola çıxarsa, Allah, ona cənnətə çatan yolu asanlaşdırar."*[59] *kimi sözlərlə şəxsən özü elm öyrənməyə təşviq etmişdir.*

*Rəsulullah əleyhissalmın gündəlik yaşayışını və onun davranışlarını öz həyatlarında əhəmiyyətli hesab edən səhabə də Peyğəmbərimizdən həm Allahın ayələrini, həm də Rəsulullahın tətbiq etdiyi sünnəsini və söylədiyi hədisləri öyrənib, başqalarına da öyrədirdilər.*

*Səhabələr, bu fəaliyyətlərini böyük bir coşqu və bir ibadət şövqü içərisində davam etdirirdilər.*

55 Bəqərə, 2/151.
56 Buxari, Elm, 13 , İtisam, 10 ; Müslim, İmarə, 175.
57 Buxari, Elm, 10.
58 Buxari, Elm, 15.
59 Buxari, Elm, 10 ; Tirmizi, elm, 19 ; İbn Macə, Müqəddimə, 17.

*Peyğəmbər əleyhissalmın bu sözləri də onun hədis öyrənmə və başqalarına da öyrətmə xüsusundakı davranış və təşviqlərini göstərir:*

*"Mən sizə bir hədis söylədiyim zaman onu əzbərləyib mühafizə edin"*

*"Sizə hədis söyləyirəm. Burada olanlar, olmayanlara təbliğ etsin."*[60]

*"Siz, qövmlərinizə gedib mənim hədislərimi təbliğ edəcəksiniz. Məndən bir şey eşidib əzbərləyən –həqiqəti söyləmək şərti ilə- onu mütləq başqasına çatdırsın."*

Həzrət Peyğəmbər əleyhissalam hədislərin rəvayət edilməsini sadəcə səhabədən istəmir, onlardan sonra gələnlərin də bu hədisləri öyrənərək başqalarına öyrətmələrini xüsusilə istəyirdi.

## 2. Səhabənin hədis öyrənmə və rəvayət etmə əzmi

Həzrət Peyğəmbər əleyhissalmın ətrafında olan səhabələr, onun hədislərini öyrənə bilmək, etdiyi hərəkətləri görə bilmək üçün böyük səy göstərirdilər. Peyğəmbərimiz əleyhissalmadan öyrəndiklərini dərhal yoldaşlarına rəvayət edir, ən çətin şəraitdə belə olsa hədisləri rəvayət etmə işini davam etdirirdilər. Əbu Zərr əl-Qifarinin bu sözü, səhabənin bu mövzudakı əzm və səyini ifadə edir: "Qılıncı boynuma qoysanız, mən də qılınc məni kəsmədən əvvəl Rəsulullahdan eşitdiyim bir sözü təbliğ və rəvayət etməyə vaxt tapacağımı bilsəm, bunu mütləq edərəm."[61]

Əbu Dərda vəfat etmədən əvvəl, ətrafındakılara özünü qalıdırıb yatağında oturtmalarını rica etmiş, oturduqdan sonra da onlara, "Rəsuli-Əkrəmin dəstəmaz aldıqdan sonra iki rükət namaz qılmağına" dair hədisini rəvayət etmiş və namaza aid bəzi tövsiyələr etmişdir.[62]

60 Buxari, Elm, 10; Müslim, İmarət, 175; Tirmizi, Elm, 4.
61 Buxari, Elm, 10.
62 Əhməd ibn Hənbəl, IV, 443.

Səhabə Peyğəmbər əleyhissalama və Onu dinləməyə o qədər istəkli idilər ki, Əbu Səid əl-Xudri onların Peyğəmbər əleyhissalamın məclisindəki vəziyyətlərini: “Sanki başlarına bir quş qonmuş kimi susqun idilər”[63] şəklində ifadə etmişdir. Təbii ki bu istək sadəcə məclislərə aid bir vəziyyət deyildir. Peyğəmbər əleyhissalam onlardan biri kimi yaşadığı üçün, həyatın təbii seyri içərisində, evdə, yolda, bazarda və səfərdə də davam etmişdir. Sözsüz ki, bu anlayış, Ona olan inanc və bağlılığın bir bəhrəsidir.

Səhabədən, hələ kiçik yaşlarda eşitdikləri hədisləri rəvayət edənlərin və buna həvəsli olanların sayı çoxdur. Ənəs İbn Malik, Abdullah ibn Abbas, Əbu Səid əl-Xudri, ilk zamanlarda bəri hədisləri təbliğ işinin öndərlərindən olmuşlar.

Səhabə içində, hədisləri öyrənib rəvayət etmək üçün kiçikdən böyüyə geniş bir fəaliyyət vardı. Bu gün hədis kitablarımızı dolduran bu qədər hədis, onların əzmlərinin bəhrəsidir.

### 3. Həzrət Peyğəmbər əleyhissalamın xanımları

Sahəbədən bir çox qadın, kişilər kimi məscidə gəlib Peyğəmbər əleyhissalamı dinləyərdi. Xüsusən bayram namazı kimi ümuma xitab edən mərasimlərdə qadınlar da məscidə gedərdilər. Peyğəmbər ön cərgədəki kişilərə xitab etdikdən sonra, qadınların olduğu səflərə keçərək onlara xitab edərdi.[64]

Hədislərin topluma yayılıb, digər insanlar tərəfindən öyrənilməsində Rəsulullah əleyhissalamın xanımlarının əhəmiyyətli xidmətləri olmuşdur. Xüsusilə həzrət Aişə bu mövzuda öndə gəlir. Evlilik həyatına, qadınların xüsusi hallarına aid məlumatlar, Peyğəmbərimizin xanımları tərəfindən digər qadınlara çatdırılmışdır.

63 Buxari, Cihad, 37; Əbu Davud, Tıbb,1
64 Buxari, İdeyn, 7; 16.

Həzrət Aişə, hədisləri rəvayət etməklə kifayətlənməmiş, bəzi səhabələr tərəfindən əksik qalan bir sıra rəvayətlərin düzəldilməsində də iştirak etmişdir. Qısaca belə deyə bilərik, sünnənin yayılmasında xanımların və xüsusi ilə Peyğəmbərimizin xanımlarının xüsusi yeri olmuşdur.

**4. Diplomatik fəaliyyətlər və elçilər**

Peyğəmbərimiz əleyhissalam, yeni müsəlman olmuş cəmiyyətlərə Qurani-Kərimi və Islamın əsaslarını öyrətmek üçün bəzi səhabələri vəzifələndirirdi. Muaz ibn Cəbəl və Əbu Musa əl-Əşarinin də içində olduğu elçilər[65] topluluğu getdikləri yerlərdə Islamı təbliğ etmə və öyrətmə vəzifəsini davam etdirərkən bununla birlikdə hədisləri də xalqa çatdırmışdırlar.

**5. Xaricdən gələn elçilər**

Müsəlman olmaq və Islam dinini öyrənmək üçün və ya Peyğəmbərimiz əleyhissalamın dəvətinə uyaraq bəzi yerlərdən Mədinəyə müxtəlif heyətlər gəlib, Peyğəmbərimiz əleyhissalam və səhabə ilə görüşüb, onlardan bir çox şey öyrənirdilər. Bu kəslər, ölkələrinə qayıdarkən oradakı digər insanlara da öyrəndiklərini çatdırırdılar.

## B. HƏZRƏT PEYĞƏMBƏR DÖVRÜNDƏ HƏDİS ÖYRƏTMƏ METODLARI

Buraya qədər hədislərin cəmiyyətə necə keçdiyindən bəhs ettik, bu bölmədə Peyğəmbər əleyhissalam dövründə hansı metodlarla səhabəyə oyrədildiyi və səhabənin hansı metodlarla həzrət Peyğəmbərdən hədis öyrəndikləri mövzusu haqqında məlumat vermək istəyirik. Cünkü dinin bünövrəsi sayılan hədislərin ilk zamanlarda hansı metodlarla əldə edilib mühafizə edildiyi xüsusu,

65 Müslim, İman, 19

bütün yönləri ilə ortaya qoyulacaq qədər əhəmiyyətli bir mövzudur. Bu məqsədlə sadəcə Peyğəmbər dövrünə aid olan bəzi vacib metodlar açıqlancaqdır.

İlk zamanlarda həzrət Peyğəmbər təlim üçün müəyyən bir vaxt ayırmamışdır. O həm ev camaatının həm də digər müsəlmanların lideri və müəllimi idi. Evdə, küçədə, məsciddə öyrənmə ehtiyacı hiss edən hərkəs ona yaxınlaşır, soruşur və oyrənirdi. Həzrət Peyğəmbərin təlim (öyrətmə) metodları açıqlandıqda bunları görərik;

**1. Həzrət Peyğəmbərin hədis öyrətmə metodları**

**a. Hadisələrə görə danışması**

Həzrət Peyğəmbər əleyhissalam hədislərini ümumiyyətlə bir hadisəyə bağlı olaraq söyləmiş və beləcə sözlərinin daha tez başa düşülməsini və bənzəri hadisələrin təkrarında daha rahat xatırlanmasını təmin etmişdir. Məsələn; Bir adam Rəsulullaha gələrək məhəllə imamının namazı uzun qıldırdığından və bu səbəblə özünün sübh namazına getmədiyini şikayət etmiş, buna bağlı olaraq həzrət Peyğəmbər camaata dönüb belə demişdir: *"Ey camaat! Həqiqətən içinizdə nifrət etdirənlər var. Bundan sonra kim camaata imam olarsa namazı xəfif (qısa) qıldırsın. Çünki arxasında yaşlı və zəiflər və ehtiyac sahibləri də var"*.[66]

Bir başqa hadisə də belə meydana gəlmişdir: Müsəlmanlar həzrət Peyğəmbərlə birlikdə Məkkədən Mədinəya qayıdarkən yolda ikindi namazı üçün dəstəmaz aldılar. Bəzilərinin topuqları quru qalmışdı. Bunu görən Allah Rəsulu əleyhissalam belə buyurdu: "*Cəhənnəmdə yanacaq bu topuqların vay halına!*".[67]

66 Buxari, Elm, 28; Müslim, Salat, 182.
67 Buxari, Elm, 30; Müslim, Təharət, 27.

**b. Sual soruşaraq mövzuya diqqət cəlb etməsi**

Həzrət Peyğəmbər müsəlmanların diqqətlərini cəlb etmək və maraqlarını artırmaq üçün onlara suallar soruşardı. Bu suallar təsadüfi suallar deyil, əksinə həmsöhbəti xəbərdar edən, onların zehinlərini oyrənməyə hazırlayan suallar idi.

Məsələn, bir dəfə həzrət Peyğəmbər əleyhissalam ətrafındakılara: "Sizə orucdan, namazdan və sədəqədən daha üstün bir ibadətin nə olduğunu söyləyim?"-deyə soruşdu. Onlar: "Bəli ey Allahın Rəsulu, de!"-dedilər. Bunun üzərinə Rəsulullah: *"Araları pozulmuş (küsülü) iki şəxsi barışdırmaqdır"* [68] buyurdu.

**c. Suallara cavab verməsi**

Müsəlmanlar öyrənmək istdikləri xüsusları həzrət Peyğəmbərdən soruşardılar. Həzrət Peyğəmbər də bu suallara cavab verər və bu sözlərin daha yaxşı yaddaşlarında həkk olmasını təmin edərdi.

Məsələn Sufyan ibn Abdullah: " Ey Allahahın Rəsulu! İslam haqqında mənə elə bir söz söyləki, onu səndən başqa birisinə soruşma ehtiyacı hiss etməyim"-dedi. Bunun üzərinə Allah Elçisi belə dedi: *"Allaha iman etdim de və doğru ol!"*[69]

Bir adam Peyğəmbərə: "necə (hansı) müsəlmanlıq daha xeyirlidir?"-deyə soruşanda, həzrət Peyğəmbər də: *"yemək yedirməyin, tanıdığın tanımadığın hamıya salam verməyindir"*-buyurmuşdur.[70]

---

68 Əbu Davud, Ədəb, 50.
69 Müslim, İman, 62 ; Tirmizi, Zühd, 60.
70 Buxari. İman, 6.

### d. Yavaş-yavaş və təkrarlayaraq danışması

Həzrət Peyğəmbər sözlərinin yaxşı anlaşılsınvə rahat öyrənilməsi üçün kəlmələri yavaş-yavaş və dənə-dənə söyləyərdi. Həzrət Aişənin rəvayətinə görə, həzrət Peyğəmbər elə açıq danışırdı ki, hər kim onun kəlmələrini saymaq istəsəydi saya bilərdi.[71]

Həzrət Peyğəmbərin öyrətmə metodlarından biri də, söylədiyi sözləri bir neçə dəfə təkar etməsidir. Beləcə hədisin həm məzmunu daha yaxşı qavranacaq, həm də rahat əzbərlənəcəkdir.

Ənəs ibn Malik bu xüsusu belə ifadə edir; "həzrət Peyğəmbər bir söz söylədiyi zaman yaxşıca başa düşsünlər deyə üç dəfə təkrar edərdi".[72] Bəzən də əhəmiyyətini bildirmək üçün üç dəfədən çox təkrar edərdi. Məsələn böyük günahların ən böyüyünü bildirərkən "Bir də yalan yerə şahitlik etməkdir", sözünü o qədər təkrar etmişdi ki, dinləyənlər "Keşkə sussa!" demək məcburiyyətində qalmışdılar.[73]

### e. Ehtiyac olduğu qədər danışması

Abdullah ibn Məsud bir gün həzrət Peyğəmbərə: "Ey Allahın Elçisi! Allahın ən çox xoşuna gələn əməl hansıdır?"-diyə soruşmuşdu. Həzrət Peyğəmbər: *"Vaxtında qılınan namazdır"*-diyə cavab vermişdir.

-Sonra hansıdır?

*-Ana – ataya yaxşılıq etmək*

-Sonra hansıdır?

*-Allah yolunda savaşmaq.*

71 Buxari, Mənakib, 23; Müslim, Zühd, 63.
72 Buxari, Elm, 30.
73 Buxari, Şəhadət, 10; Müslim, İman, 143.

İbn Məsud sözlərinə belə davam edir: “Əgər soruşmağa davam etsəydim daha çox şey söyləyəcəkdi.”[74]

Bu misalda görüldüyü kimi həzrət Peyğəmbər qarşısındakının ehtiyacı qədər məlumat vermişdir.

**f. Təlimi asanlaşdırması**

Bir dəfə Nəcid xalqindan bir adam Rasulullahin huzuruna gəldi və ona İslamın nə olduğunu soruşdu. Allahın elçisi:

-*“Bir qün bir gecə beş vaxt namaz qılmaqdır”*- dedi:

-Bu namazlardan başqa edəcəyim bir şey varmı?

-*“Xeyr, nafilə olaraq qılmaq istəyirsənsə o başqa. Bir də ramazan orucu var.”*

-Üzərimdə bundan basqası da olacaqmı ?

-*“Xeyr, ama istəyərsənsə nafilə oruc tuta bilərsən.Yalniz bir də zəkat var.”*

-Ediləcək basqa bir şey varmı?

- *“Xeyir, nafilə olaraq sədəqə verə bilərsən*.”

Bunun üzərinə Nəcidli qalxıb gedərkən, “Vallahi bundan nə çox, nə də əksik bir şey etməyəcəm”-dedi. Həzrət Peyğəmbər də: *“Əgər doğru söyləyirsə cənnəti qazandı”*- buyurdu.[75]

Bu nümunədə də görüldüyü kimi həzrət Peyğəmbər İslamı yeni öyrənən şəxsə son dərəcə rahatlıq göstərmişdir. Dinin bütün prinsiplərini sayaraq onu ürkütməmişdir. Müsəlmanlara da belə etməyi tövsiyə etmişdir. Bu haqda belə demişdir: *“Siz asanlaşdırı-*

74 Buxari, Məvaqit, 5; Ədəb, 1.
75 Buxari, İman, 34; Müslim, İman, 8-9.

*cılar olaraq göndərildiniz. Çətinləşdiricilər olaraq deyil,"*[76] *"Asanlaşdırın çətinləşdirməyin, sevdirin nifrət etdirməyin".*[77]

### g. Bezdirməməyə diqqət etməsi

Təlim tərbiyədə əsas prinsiplərindən biri də şübhəsiz muxatabı bezdirməməkdir. Həzrət Peyğəmbər də bu xüsusa diqqət yetirərək hər gördüyü insana hər anda tövsiyələr etmək əvəzinə müsəlmanlara həftənin müəyyən günlərində məlumat verməyi uyğun görmüşdür.

Yuxarıda saydıqlarımızdan əlavə həzrət Peyğəmbər fürsətləri dəyərləndirmə, suallara cavab vermə, hədis təlimini ümumiləşdirmə kimi metodlardan da istifadə etmişdir.

Peyğəmbərimizin bu metodlardan istifadə etməsi hədis təliminin daha faydalı və uzun müddətli yadda qalmasını təmin etmək üçündür. Təbi ki, müəllimin keyfiyyətli olması və ya müasir metodlardan istifadə etməsi kifayət deyil. Tələbələrin də bu metodlara açıq olması, dinləyici və istəfadə edici olaraq özünə metodlar yaratması zəruridir. həzrət Peyğəmbərin tələbələri olan səhabə də özləri üçün müəyyən metodlar kəşf etmişdilər.

## C. HƏDİSLƏRİN YAZILMASI

Həzrət Peyğəmbər öz sözlərini ətrafındakılara rahatca öyrətmək üçün tədbiq etdiyi metolardan biri də hədisləri yazdırması idi. Ancaq o dövrdə yazmağı bilənlər və səhvsiz yaza bilənlər çox az idi. Buna görə də həzrət Peyğəmbər ilk zamanlarda, hər kəsin hədis yazmasını uyğun görməmişdi. Bunun səbəblərinə keçmədən əvvəl o dövrdə yazının hansı səviyyədə olduğuna nəzər salmaq lazımdır.

76 Buxari, Ədəb, 80; Əbu Davud, Təharət, 136.
77 Buxari, Elm, 11; Müslim, İman, 31.

**1. Cahiliyyət dövründə və İslamin ilk illərində oxuyub-yazma**

Cahiliyyət dövründə Ərəblər qonşu İran və Bizansa nəzərən daha az inkişaf etmişdi. Xarici ölkələrlə ticarət münasibətləri səbəbiylə Məkkəlilər, Mədinəlilərə nəzərən daha irəli bir vəziyyətdə idi. İbn Səd bu vəziyyəti "Məkkəlilər oxuyub-yaza bilirdilər, ancaq Mədinəlilər bilmirdilər"-deyərək ifadə edir. Bəzi rəvayətlərdə, İslamın ilk dövrlərində Qureyşlilər arasında on yeddi nəfər oxuyub-yaza bilirdi. Bunlardan başqa həzrət Peyğəmbərin vəhy katibliyini edən bəzi şəxslər də vardı. Rəvayətə görə ilk vəhy katibi Abdullah ibn Səd ibn Əbi Serh idi. Həzrət Peyğəmbər Mədinəyə gələndə bu vəzifəyi Übey ibn Kab öhdəsinə almışdır. Übey olmayanda katibliyi Zeyd ibn Sabit edərdi.

Ərəblər arasında oxuyub-yazma qıtlığı o qədər idi ki, həzrət Peyğəmbərin göndərdiyi məktublar, bəzən qəbilələrdə oxuyacaq adam tapmaq olmurdu. Bir rəvayətdə həzrət Peyğəmbərin Umman kəndlərindən birinə göndərdiyi məktubunu oxyacaq adamın tapılmadığını və nəticədə çətinliklə zənci bir kölənin oxuduğu söylənir.

Amma bunu da ifadə etmək lazımdır ki, İslamdan əvvəlki dövrdə Məkkədə və hətta Mədinədə oxuyub-yaza bilənlər də vardı. Hətta nəzərlərində əhəmiyyət qazanan ədəbi mətnlər, qəbilələr arasında meydana gələn sazişlər yazılaraq mevsuk (kabənin divarından asılma) hala gətirilməktəydi. Məsələn: Muallaqatu Səba deyilən Kabəyə asılmış mükafatlandırılmış şerlərin və Məkkə müşrüklərinin həzrət Peyğəmbərin nəslinə qarşı qəbul etdikləri baykot sazişinin yazılaraq kabə divarına asılması, kimi.

**2. Hədislərin Yazılmasina İcazə Verilməsi**

Bununla bərabər həzrət Peyğəmbər əleyhissalam bəzi səhabəyə ondan eşitdikləri hədisləri yazmaq üçün icazə vermişdir. Həzrət Əli, Abdullah ibn Abbas, Abdullah ibn Əmr kimi səhabilər hədisləri yazırdılar. Hədis yazma izni nə zaman verildiyi, hədisləri yazma qadağanın bütün səhabəyəmi, yoxsa doğru yaza bilməyənlərəmi verildiyi bilinmir. Ancaq bəzi səhabənin həzrət Peyğəmbər əleyhissalamdan hədisləri yazmaq üçün icazə istədikləri; onun bir qisim səhabəyə icazə verdiyi halda bir qisminə vermədiyi tarixi bir həqiqətdir. Peyğəmbər əleyhissalamın icazə verdiyi səhabələr hədisi yazır, vermədikləri isə əzbərdən rəvayət edirdilər.

Abdullah ibn Əmr əl-As (r) demişdir ki: "həzrət Peyğəmbər əleyhissalamdan eşitdiyim hər şeyi yazardım. Mənə mane olmaq istədilər. Dedilər ki*: 'Sən hər şeyi yazırsan, həzrət Peyğəmbər əleyhissalam insandır riza halında da qəzəbli halında da söz söyləyir".* Bu tənbeh üzərinə bir müddət hədis yazmadım. Nəhayət məsələni həzrət Peyğəmbər əleyhissalama ərz etdim. Barmağını ağzına qoyaraq; *"Yaz!"*-dedi. *"Allah Təalaya and olsun ki, buradan (ağzımdan) haqq sözdən başqası çıxmaz."*[78]

Əbu Hüreyrədən gələn rəvayətdə belə ifadələr yer almaqdadır:

"Ənsardan biri həzrət Peyğəmbər əleyhissalamdan hədis dinləyir və xoşuna gəlirdi. Ancaq eşitdiklərini mühafizə edə bilmirdi. Bu halını həzrət Peyğəmbərə şikayət edərək; "Ya Rəsulallah! dedi.; səndən hədis eşidirəm, xoşuma gelir. Amma heç cürə öyrənə bil-

78 Əbu Davud, Elm, 3.

mirəm. (Nə edim?) Bunun üzərinə Allah Rəsulu əleyhissalam əli ilə yazı işarəsi edərək *"Sağ əlindən faydalan"*[79]- buyurdu.

Səhabədən Rafi ibn Hadic (r.a.) demişdir ki: *"Ya Rəsulallah! Biz səndən bir çox şeylər eşidirik, bunları yazaqmı?"*-deyə soruşdum. *'Yazın"* buyurdular.*"*[80]

Bu hədislərdən anlayırıq ki, həzrət Peyğəmbər əleyhissalam əvvəllər ancaq yazı yaza bilənlərə güvəndiyi, hədisləri yanlış yazmayacağı və ya Qurani-kərimin ayələri ilə qarışdırmayacağına əmin olduğu şəxslərin hədisləri yazmalarına icazə vermiş; hədis yazmağı qadağan edərkən çəkindiği təhlükə ortadan qalxınca da tamamən icazə vermişdi.

Hədislərin yazılmasını qadağan edən hədislərlə icazə verən hədislər arasındakı ziddiyət belə həll edilmişdir. Bununla bərabər qadağan edən hədislərin icazə hədisləri ilə nəsx edildiyini söyləyənlər də vardır.

Həzrət Peyğəmbər əleyhissalamın şəxsən özünün yazdırdığı sənədlər vardır. Bunları belə sıralamaq olar.

### 3. Hədislərin yazılmasının qadağan edilməsi

Həzrət Peyğəmbər əleyhissalam zamanında hədis daha çox əzbərdən nəql olunurdu. İslam qaynaqları həzrət Peyğəmbər həyatda ikən başlayan hədislarin yazılmasını ikiyə ayırırlar; Birincisi hədis yazmaq üçün özünə müraciət edənlərə icazə vermədiyi, İkincisi də bu qadağaya icazə verdiyi dövrdür. Hədis yazmayı qadağan edən ən məşhur hədis Əbu Səid əl-Xudri tərəfindən rəvayət edilmişdir. Hədisdə *"Məndən (Qurani Kərim xaricində) başqa bir şey yazmayın. Hər kim məndən Qurani-Kərimdən başqa bir şey yazmışsa*

79 Tirmizi, Elm, 16.
80 Rəmahurmuzi, *əl-Mühəddisul-Fasıl*, I,. 36

*onu yox etsin. Sözlərimdən istədiklərinizi yazmadan rəvayət edin. Buna icazə var. Hər kim bilə-bilə mənim adıma yalan danışarsa (Hədis uydurarsa), cəhənnəmdəki yerinə hazırlaşsın"*[81]-buyuraraq, buyuraraq sadəcə Qurani-Kərimin yazılmasına icazə vermiş; hədislərin yazılmasına icazə verməmişdir.

Hədislərin yazılmasına icazə verilmədiyini göstərən bir hədis də belədir: Əbu Səid əl-Xudri (r) demişdir ki: *"həzrət Peyğəmbər əleyhissalamdan hədis yazmaq üçün icazə istədim, mənə icazə verməkdən imtina etdi"*[82]

Əbu Hüreyrənin hədis yazdığını görəndə də həzrət Peyğəmbər, ona mane olmuş və belə demişdir: "*Allahın kitabından başqa kitab istəyirsən? Sizdən əvvəlki millətlər Allahın kitabı yanında başqa kitablar meydana gətirdikləri üçün doğru yoldan ayrıldılar*."[83]

**Qadağan edilməsinin səbəbləri**

Hədislərin yazılmasına icazə verilməməsi, aşağıdakı səbəbdən irəli gəlirdi:

**1) Yazı yazmağı bacaranların az olması və yazı texnikasının yaxşı olmaması səbəbi ilə yanlış yazma qorxusu.**

Nazil olan ayələri də yazırdılar, ancaq bu ayələrdə xəta etmə ehtimalı yoxdu. Çünki bu iş həzrət Peyğəmbərin nəzarətində və etimadlı katiblər tərəfindən həyata keçirilirdi. Vəhy katibləri istəyərək bu işi görənlər deyildi, həzrət Peyğəmbər tərəfindən vəzifələndirilmişdi. Bu vəzifəyi kim istərsə icra etmirdi. Ancaq yazısı düzgün olanlar bu vəzfəyə təyin edilirdi. İlk vaxtlarda, sayıları az olan oxuyub-yazmağı bilənlərin hamısı bu işə cəlb edilmişdilər. Bu vəziyyət, belə bir qadağanın qoyulmasına imkan yaratmışdı.

81 Müslim, Zühd, 72; Əhməd ibn Hənbəl, III, 12.
82 Raməhurmuzi, *Mühəddisul-fasıl*, s. 5.
83 Əhməd ibn Hənbəl, *Müsnəd*, III, 12.

**2) Kağızın qıt olması.**

Müsəlmanlar kağız qıt olduğu üçün Rəsulullahdan eşitmiş olduqları hədisləri bəzi anlarda Mushafı Şərifin səhifələrinin boş yerlərinə qeyd edirdilər. Bunu görən həzrət Peyğəmbər, vaxt keçdikcə Quran və hədisin bir-birinə qarışabiləcəyini, bunun isə müxtəlif şübhə və dedi-qodulara yol açabiləcəyini düşündüyü üçün, Mushafı Şərifin kənarına hədis də olsa hər hansı bir şeyin yazılmasını qəti qadağan etdi. Vəhyin davam etdiyi dövrdə belə qərarın alınması yerində bir qərar idi. Əgər Peyğəmbər buna göz yumsaydı din düşmənləri üçün Qurana qarşı istifadə edəcək ləvazimat olardı.

**3) Qurandan başqa şeylərlə məşğul olma qorxusu.**

Yazının tam inkişaf etməməsi, yazanların uşaq ola biləcəyi, maarif sistemindəki kifayətsizlik, Qurandan başqa şeylərlə məşğul olarkən, Quranın ehmal edilməsi, yazıya çox maraq göstərərək hafizənin zəifləməsi kimi səbəblər də, qadağan edilməyə yol açan səbəblərdən olabilər.

Qadağan hədisinin söylənmə tərzi incələnəndə, Qurani Kərimlə hədislərin bir-birinə qarışdırılmasından qorxulduğu açıq-aşkar görülür.

Bu səbəblərə görə səhabə hədisləri daha çox əzbərdən rəvayət edirdi. Əslində Qurani-kərim bir tərəfdən əzbərlənib digər tərəfdən yazıldığı üçün yanlış yazılma qorxusu yoxdu. Ancaq hədislər elə deyildir. Onları hamı yazmır, bütün əshab da əzbər bilmirdi. Bunun üçün də həm Qurani-kərimlə həm də bir-biri ilə qarışmaq ehtimalı var idi.

## II. SƏHABƏ DÖVRÜ

Allahdan vəhy alan həzrət Peyğəmbər aldığı bu əmrləri öz həyatında tədbiq edərək ətrafındakı insanlara çatdırmışdır. Həzrət Peyğəmbərə inanan və ondan öyrəndiklərini daha sonrakı nəsillərə çatdıran bu insanlara ümumi olaraq səhabə deyilmişdir.

### A. SƏHABƏNİN TƏRİFİ

Ərəbcə bir kəlmə olan səhabə (الصحابة), sahib (الصاحب), və ya sahabi (الصحابي) kəlmələrinin cəmi olaraq istifadə olunduğu kimi, yoldaşlıq etmək, bərabər (bir yerdə) olmaq mənasına gələn "sahibə" (صحب), felinin məsdəri olaraq da istifadə olunur. Sahib (صاحب), kəlməsinin cəmi əshab (الأصحاب) və ya səhabə (الصحابة) olaraq da istifadə olunur.

Səhabə və ya əshab, həzrət Peyğəmbərin müasirlərinə verilən addır. Termin olaraq **"Müsəlman olaraq Rəsuli Əkrəmi görən və bu imanla yaşayıb vəfat edən şəxs"** deməkdir. Sağını solunu ayıra bilən və ya sözü başa düşüb cavab verə bilən uşaqlar ilə korlar da –həzrət Peyğəmbəri görmək şərtiylə- sahabi olaraq qəbul edilir.

Bu təriflərlə bərabər, bir şəxsin sahabi ola bilməsi üçün həzrət Peyğəmbərdən hədis rəvayət etməsini və ya Onunla müharibələrdə iştirak etməsini yaxud da bir iki il yanında olmasını şərt qoşanlar da olmuşdur.

Bu tərifə uyğun olaraq bir nəfər üçün "sahabi" cəm üçün " əshab" və ya " səhabə" kəlməsi istifadə olunur.

### B. SƏHABƏNİN FƏZİLƏTİ

Səhabə nəsli həzrət Peyğəmbərin şəxsini və peyğəmbərlik nişanəsi olan möcüzələrini gözləriylə görmüş bəxtiyar inasanlar-

dır. İslamın yayılıb inkişaf etməsində çox böyük rolları olduğu üçün Allah Təala onları tərifləyərək zikr etmişdir;

لِلْفُقَرَاءِ الْمُهَاجِرِينَ الَّذِينَ اُخْرِجُوا مِنْ دِيَارِهِمْ وَاَمْوَالِهِمْ يَبْتَغُونَ فَضْلًا مِنَ اللّٰهِ وَرِضْوَانًا وَيَنْصُرُونَ اللّٰهَ وَرَسُولَهُ اُولٰئِكَ هُمُ الصَّادِقُونَ

وَالَّذِينَ تَبَوَّؤُ الدَّارَ وَالْاِيمَانَ مِنْ قَبْلِهِمْ يُحِبُّونَ مَنْ هَاجَرَ اِلَيْهِمْ وَلَا يَجِدُونَ فِى صُدُورِهِمْ حَاجَةً مِمَّا اُوتُوا وَيُؤْثِرُونَ عَلٰى اَنْفُسِهِمْ وَلَوْ كَانَ بِهِمْ خَصَاصَةٌ وَمَنْ يُوقَ شُحَّ نَفْسِهِ فَاُولٰئِكَ هُمُ الْمُفْلِحُونَ

*"(Bu qənimət) yurdlarından qovulub çıxardılmış, Allahdan mərhəmət və riza diləyən, Allaha və Onun Peyğəmbərinə kömək edən yoxsul mühacirlərə məxsusdur. Onlar (imanlarında, sözlərində və işlərində) doğru olan kimsələrdir! Onlardan (mühacirlərdən) əvvəl (Mədinədə) yurd salmış və (Mühəmməd əleyhissəlama qəlbən) iman gətirirmiş kimsələr (ənsar) öz yanlarına (şəhərlərinə) mühacirət edənləri sevər, onlara verilən qənimətə görə ürəklərində həsəd (qəzəb) duymaz, özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün tutarlar. (Allah tərəfindən) nəfsinin xəsisliyindən (tamahından) qorunub saxlanılan kimsələr - məhz onlar nicat tapıb səadətə (Cənnətə) qovuşanlardır!"*[84]

لَقَدْ رَضِىَ اللّٰهُ عَنِ الْمُؤْمِنِينَ اِذْ يُبَايِعُونَكَ تَحْتَ الشَّجَرَةِ فَعَلِمَ مَا فِى قُلُوبِهِمْ فَاَنْزَلَ السَّكِينَةَ عَلَيْهِمْ وَاَثَابَهُمْ فَتْحًا قَرِيبًا

*"(Ya Peyğəmbər!) And olsun ki, (Hüdeybiyyədə) ağac altında sənə beyət etdikləri zaman Allah möminlərdən razı oldu. (Allah) onların ürəklərində olanı (sənə sadiq qalacaqlarını, əhdə vəfa edəcəklərini) bildi, onlara (öz dərgahından) arxayınlıq (rahatlıq, səbir, səbat, mənəvi qüvvə) göndərdi və onları yaxın gələcəkdə qazanılacaq bir qələbə (Xeybərin fəthi) ilə mükafatlandırdı."*[85]

84 Həşr, 59/8-9.
85 Fəth, 18.

*"(İslamı) ilk əvvəl qəbul edib (bu işdə başqalarından) irəli düşən mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedən kimsələrə gəldikdə, Allah onlardan, onlar da Allahdan razıdırlar. (Allah) onlar üçün əbədi qalacaqları, (ağacları) altından çaylar axan cənnətlər hazırlamışdır. Bu, böyük qurtuluşdur (uğurdur)!"*[86]

وَالسَّابِقُونَ الْاَوَّلُونَ مِنَ الْمُهَاجِرِينَ وَالْاَنْصَارِ وَالَّذِينَ اتَّبَعُوهُمْ بِاِحْسَانٍ رَضِىَ اللّٰهُ عَنْهُمْ وَرَضُوا عَنْهُ وَاَعَدَّ لَهُمْ جَنَّاتٍ تَجْرى تَحْتَهَا الْاَنْهَارُ خَالِدِينَ فيهَا اَبَدًا ذٰلِكَ الْفَوْزُ الْعَظيمُ

Əshabın ədalət və fəzilətinə dair müxtəlif ayələrlə bərabər həzrət Peyğəmbərin hədisləri də vardır;

خَير أمَّتِي قَرْنِي ثُمَّ الَّذِينَ يَلوُنَهُم ثُمَّ الَّذِينَ يَلوُنَهُم

*"Ümmətimdən ən xeyirli nəsil mənim də içində olduğum nəsildir. Sonra onlardan sonra gələnlər, sonra da onlardan sonra gələnlərdir."*[87]

لا تسبوا أصحابي فلو أن أحدكم أنفق مثل احد ذهبا ما بلغ مد أحدهم و لا نصفه

*"Əshab haqqında pis danışmayın. Sizdən biriniz Allah yolunda Uhud dağı boyunda qızıl sədəqə versə də, onların bir müd və ya onun yarısı qədər infaqların dərəcəsinə çatmaz."*[88]

أصحابي كالنجوم فبأيّهم اقتديتم اهتديتم

*"Əshabım ulduzlar kimidir. Hansına tabe olsanız doğru yolu taparsınız."*[89]

## C. SƏHABƏNİN BİLİNMƏ YOLLARI

Bir şəxsin səhabə olduğu bu yollarla bilinir:

86 Tövbə, 100. Bundan başqa, Bəqərə, 143; Ali İmran, 110; Ənfal 64.
87 Buxari, Şəhadət, 9; Tirmizi, Fitən, 45.
88 Buxari, Fəzailül-Əshab, 5; Müslim, Fəzailül-Əshab, 221,222.
89 Əcluni, *Kəşful-xəfa*, I, 118.

**1. Təvatür yolu ilə:** Yalan söyləmələri və yalan söyləmək üçün bir araya gəlmələri əqlən mümkün olmayan doğru sözlü və güvənilən insanların, bir şəxsin səhabə olduğuna şahidlik etmələridir. həzrət Əbu Bəkir, həzrət Ömər, həzrət Osman, həzrət Əli, Abdullah ibn Məsud kimi səhabələr, səhabə olduqları təvatür yoluyla bilinənlərdən bəziləridir.

**2. İstifada (və ya şöhrət) yoluyla:** Bir kəsin səhabə olduğunun təvatür dərəcəsindən daha aşağı bir yolla bilinməsini ifadə edər. Dimam ibn Saləbə, Ukkaşə ibn Mihsanın səhabilikləri bu yolla bilinməkdədir.

**3. Bir səhabənin şahidliyi ilə:** Məsələn, Humamənin Peyğəmbərimiz əleyhissalam ilə görüşdüyünü və səhabə olduğunu Əbu Musa əl-Əşari xəbər vermişdir.

**4. Adil və doğru sözlü olduğu sabit olan bir kəsin, özünün səhabə olduğunu bildirməsiylə.** Burada diqqət ediləcək bir xüsus vardır. Son ölən səhabənin vəfat tarixi (Xələf ibn Xəlifə) hicrətin 110-cu ili olduğu üçün, bu ildən sonra "Mən səhabəyəm" deyənin sözünə etibar edilməz. Peyğəmbərimiz əleyhissalam da vəfatından bir ay əvvəl: *"Yüz il sonra bu gün, yer üzündə canlı olaraq heç bir kəs sağ qalmayacaqdır"*[90]- buyurmuşdur ki, həzrət Peyğəmbərin h. 11 ildə vəfat etdiyini nəzərə alsaq bu tarix hicrətin 110- cu ilinə təsadüf edir.

## D. SƏHABİLƏRİN DƏRƏCƏLƏRİ

Fəzilət dərəcələrinə görə bütün səhabilər eyni səviyyədə deyildir. Hakim ən-Neysaburi (vəfatı 405/1014) fəzilət vəziyyətlərinə görə səviyyələri on iki təbəqəyə ayırmışdır:

90 Müslim, Fəzailus-Sahabə, 217, 218, 220.

**1. Məkkədə ilk müsəlman olan səhabilər**. Bunlar; həzrət Əbu Bəkr, həzrət Ömər, həzrət Osman, həzrət Əli və əşərəyi mübəşşərədən digər səhabilərdir. Qadınlardan həzrət Xədicə, qullardan Bilal, azad edilmişlərdən Zeyd ibn Haris və.s.

**2. Darun-Nədvədə müsəlman olanlar**. Bunlar həzrət Ömərin müsəlmanlığını açıqlamasından sonra Dar ən-Nədvə deyilən iclas yerində müsəlman olub həzrət Peyğəmbərə bəyat edənlərdir.

**3. Həbəşistana hicrət edənlər**. Bunlar on bir kişi və dörd qadın, cəmi on beş nəfərdən ibarət qurupdur.

**4. Birinci Əqəbədə həzrət Peyğəmbərə bəyat edənlər**. Bunlar on iki nəfərdir.

**5. İkinci bəyata qatılanlar**. Bunların əksəriyyəti Mədinəlilərdən ibarətdir. Bu bəyatda yetmişdən çox şəxs qatılmışdır.

**6. Həzrət Peyğəmbərə Kubada,** (hələ Mədinəyə çatmadan əvvəl) **qatılan mühacirlər.**

**7. Bədir müharibəsində iştirak edən səhabilər.** Bunların fəzilətini həzrət Peyğəmbər belə dilə gətirmişdir; *"Allah Bədir müharibəsində iştirak edənlərə işarə edərək, "İstədiyinizi edin. Mən sizi bağışladım."*[91]

**8. Bədir müharibəsi ilə Hüdeybiyə müqavilə sazişi arasında Mədinəyə hicrət edənlər.**

**9. Hüdeybiyədəki ağac altında həzrət Peyğəmbərə beyət edənlər.** Fətih surəsinin 18-ci ayəsində bunların fəzilətinə işarə edilir.

**10. Hüdeybiyə sülh müqaviləsi ilə Məkkənin fəthi arasında hicrət edənlər.**

91 Buxari, Məğazi, 9; Müslim, Fəzailüs-Səhabə, 161.

**11. Məkkənin fəthi günü müsəlman olanlar.** Bunların sayıları minə yaxındır.

**12. Məkkənin fəthi günü və ya Vida həccində Rəsulullahı görən və beləcə səhabi qəbul edilən uşaqlar.** Məsələn; Əbu Tüfeyl, Əbu Cüheyfə, həzrət Peyğəmbəri təvəf edərkən zəmzəm quyusu ətrafında görmüşlər.[92]

## E. SƏHABƏNİN SAYISI

Səhabilərin sayını dəqiq olaraq söyləmək mümükün deyildir. Sayıları 40000 ilə 120000 arasında ifadə edilməkdədir. Əshabın biyoqrafiyalarına həsr edilmiş əsərlərin ən həcmlisində 12000-ə yaxın səhabinin həyatından söz edilir. Əshabı kiramın həyatlarından bəhs edən əsərlərin ən məşhurları bunlardır;

1. İbn Abdilbərr əl-Qurtubinin (vəfatı 463/1071) 3500 səhabidən bəhs edən *əl-istiab fi marifətil-əshab;*

2. İbnül-Əsir əl-Cəzərinin (vəfatı 630/1233) təqribən 8000 səhabiyi tanıdan *Üsdül-ğabə fi marifətis-səhabə;*

3. İbn Həcər əl-Əsqalani (vəfatı 852/1448) 12000 yaxın səhabənin tərcüməyi halını əhatə edən *əl-İsabə fi təmyizis-səhabə.*

Bu rəqəmlərə həzrət Peyğəmbərin vəfatı əsnasında uşaq olanlarla bərabər, səhabi olub olmadığı şübhəli olanlar da daxildir. Bu rəqəm diqqətə alınanda adları bilinən səhabilər, bütün səhabilərə nisbətlə təqribən 10% təşkil edir. həzrət Peyğəmbərə sual soruşanlar, müharibələrdə komandir olanlar və qəhrəmanlıq göstərənlər, xəlifəlik, valilik, zəkat məmurluğu, elçilik, müəllimlik kimi rəsmi məqamlarda vəzifə alanlar və bunun xaricində müxtəlif vəsilələrlə adını eşitdirənlər bir yerə cəm edilərək bu on faizlik rəqəm əldə

92 Səhabələrin təbəqələri üçün bax. Hakim Nisaburi, *Marifətu ulumil-Hədis,* s. 22-24.

edilmişdir. Buna görə səhabənin 90%-nin adı naməlum olaraq qalmaqdadır.

## F. SƏHABƏNİN HƏDİS ÖYRƏNMƏ METODLAR

Yuxarıda da qeyd etdiyimiz kimi həzrət Peyğəmbər, hədislərin rahat bir şəkildə öyrənilməsi üçün müəyyən metodlardan istifadə etmişdir. Bu metodlardan əlavə səhabə də həzrət Peyğəmbərdən eşitdiyi hədisləri çətinlik çəkmədən mühafizə etmək üçün müəyyən yollaradan istifadə etmişlərdir. Bu yollardan ən əsasları aşağıdakılardır:

### 1. Müzakirə

İlk dövrlərdə hədislərin yazılması Qurani-Kərimə qarışar narahatçılığı ilə həzrət Peyğəmbər (s) tərəfindən qadağan edildiyi üçün[93], hədisləri öyrənib zehnlərə yerləşdirmək və beləliklə mühafizəsini təmin etmək, ancaq müzakirə ilə mümkün idi. Bunu çox yaxşı bilən səhabə, müzakirəni əhəmiyyətli görür və eşitdikləri hədisləri öz aralarında müzakirə edirdilər. Çünki İslamın ikinci qaynağı olan hədislərin unudulmayıb yaxşıca öyrənilməsi, onların qayəsi idi. Bu mövzuda Ənəs ibn Malik belə deyir: *"Biz, Rəsulullahın (s) yanında olub, hədisləri Ondan dinləyərdik. Oradan ayrıldıqdan sonra, eşitdiyimiz hədisləri əzbərləyincəyə qədər aramızda müzakirə edərdik.* [94]

### 2. Yazma

Həzrət Peyğəmbərin (s) hədislərin yazılmasına icazə verməsindən sonra səhabələr, əzbərləmiş olduqları hədisləri yazıya keçirmişdilər. **Ənəs ibn Malik, Abdullah ibn Əmr ibn Əl-As, Abdul-**

93 Əhməd ibn Hənbəl, III, 12, 21.
94 Əhməd ibn Hənbəl, X, 21-22.

**lah ibn Ömər, Zeyd ibn Sabit, həzrət Əli** hədis yazan səhabələrdən bəziləridir.

Peyğəmbər əleyhissalamın sağlığında hədis yazılması qadağan edilmədən öncə bəzi səhabilər hədisləri yazmış və "hədis səhifəsi" bugünkü ifadə ilə hədis kitabçaları meydana gətirmişlər. Hədis yazmağın qadağan olduğu dövrdə isə Peyğəmbər əleyhissalamdan xüsusi icazə alan səhabələr hədis yazmağa davam etmişlər. Yazma işi tamamən sərbəst olduqdan sonra səhifələr çoxalmışdır.

Bu ilk səhifələri yazan səhabələr bunlardır: həzrət Əbu Bəkir, Abdullah ibn əl-Amr ibn əl-As (kitabçığının adı, əs-Səhifətüs-Sadiqədir), Əbu Hüreyrə (əs-Səhifətüs-Səhihə), Cabir ibn Abdullah, Süleyman ibn Qeys, Əli ibn Əbi Talib, Səmurə ibn Cündəb, Abdullah ibn Abbas, Səd ibn Ubadə və Abdullah ibn Ömər.

### 3. Elm Məclisləri

Həzrət Peyğəmbər əleyhissalm, məsciddə oturduğu zaman səhabələr onun ətrafında halqa kimi oturar və Rəsulullah əleyhissalamın söylədiyi hədisləri təkrar edərək əzbərləyərdilər. Bu elm məclisləri üçün müəyyən bir gün və ya zaman təyin edilməsə də ümumiyyətlə namazlardan sonra edilərdi. Rəsulullah əleyhissalam, əshabına Quran, sünnə, fərazilər və axirətlə əlaqədar mövzulardan dərslər verər, səhabələrin suallarını cavablandırardı.[95] Elm öyrənmək üçün səhərin sübh çağlarını tövsiyə edən Rəsulullah əleyhissalam,[96] əshabına bezginlik verməmək üçün vəziyyətlərinə baxır, dərslərini fasiləli olaraq edər, söylədiklərinin bir qismini üç dəfə təkrar edər, beləliklə ətrafındakıların yaxşıca başa düşmələrini təmin edərdi.

95 Heysəmi, *Məcmauz-Zəvaid*, I,159.
96 Əhməd ibn Hənbəl, I,154.

Həzrət Peyğəmbər əleyhissalam, qadınların tədris və təhsilini də ehmal etməz, onlara da ayrı bir gün təyin edər və həmin gündə elm öyrədərdi. Bəzən də qadınlar şəxsən Rəsulullah əleyhissalamınyanına gəlib, məsələlərini ərz edər və suallar soruşardılar, Rəsulullah əleyhissalam da onların suallarına cavab verərdi. Bəzən də, özünün izah etmək istəmədiyi məsələləri izah etmək üçün zövcələrindən birini göndərərdi.

**4. Sual Soruşma**

Səhabə, İslamın hökmlərini öyrənmək, çətinlik çəkdikləri məsələlərdə həqiqəti, İslamın qaynağı olan həzrət Peyğəmbərdən (s) ala bilmək üçün Rəsulullaha (s) suallar soruşur, onun verdiyi hökm və etdiyi izahatları ehtiva edən hədisləri dərhal öyrənirdilər. Beləliklə həm məsələlərini həll edir, həm də başqalarına və özlərindən sonrakılara, qarşılaşmaları mümkün olan eyni mövzu ilə əlaqədar hədisləri nəql etmə imkanı olurdu. Sual soruşanlar ümumiyyətlə həzrət Peyğəmbərin elm məclislərinə davamlı şəkildə iştirak edə bilməyənlər, yaxud yeni müsəlman olan və yaxud da uzaq yerlərdə yaşayıb, bəzən həzrət Peyğəmbərin (s) yanına gələnlərdi. Rəsulullah (s) soruşulan bir məsələni ətraflıca izah edər; bəzi suallar qarşısında da (məsələn ruh haqqında) soruşulan suallar kimi bu zaman vəhyin gəlməsini gözləyər, ondan sonra cavab verərdi. Qurani-Kərimdə "yəsəlunəkə (sənə soruşurlar)" deyərək başlayan ayələrdəki, hamısı 13 dənədir–bu cür sualların cavablarını təşkil edər.

**5. Təqib**

Səhabələrin bir qismi davamlı olaraq həzrət Peyğəmbərin yanında olur, ondan hədis öyrənirdilər. Bu səhabələr, bəzən özləri bir dərs halqası qurub və Rəsulullahdan (s) öyrəndiklərini başqalarına çatdırardılar. Məsələn; bunların ən məşhuru Rəsulullahdan

ən çox hədis rəvayət etmiş olan Əbu Hüreyrə (r), cümə namazından öncə, Abdullah ibn Məsud isə çərşənbə günləri hədis öyrənərdi. Həzrət Peyğəmbərin (s) yanında həmişə olmayanlar isə, bəzən gəlib günlərcə qalır, bir qismi də növbələşərək hədis öyrənirdilər, sonra da getdikləri yerlərdə təbliğ edirdilər.

## G. SƏHABƏNİN HƏDİS RƏVAYƏTİ

Əshabın müxtəlif yollarla əldə etdikləri hədisləri başqalarına öyrətmək üçün də böyük səy göstərmişdir

### 1. Hədis Rəvayətində Səhabənin Əhəmiyyəti

Səhabənin ilk nəsil olması səbəbiylə hədis rəvayətində mühüm yerə sahibdir. həzrət Peyğəmbəri görən, Onun sözlərini eşidən, davranışlarını yaxından tanıma şərəfinə sahib olanlar onlardır. Din sahəsində bildiklərimizin hamısını onlara borcluyuq. Onlar olmasaydılar nə Quran bizə qədər çatardı, nə də dinin tədbiqatı haqqında bu qədər biliklərə sahib ola bilərdik. Bu günə gəlib çatan bütün hədislər onlar vasitəsi ilə rəvayət olunub bizə çatmışdır. Onlardan ən az birinin imzası olmayan hədis, hədis alimləri tərəfindən səhih, sağlam hədis kimi qəbul edilmir. Onların bu əhəmiyyətinə bələd olan alimlər onlara böyük əhəmiyyət vermişdir. Şəxsi bacarıqları nə olursa olsun onların hamısını hədis rəvayətində (adil) sağlam, güvənilir qəbul etmişlər. Çünki səhabilər hədis rəvayət etməyi mühüm bir vəzifə olaraq qəbul etmişlər və bu mövzuda çox həssas və dəqiq hərəkət etmişlər.

### 2. Səhabənin Hədis Rəvayətinə Bağlılıqları

Səhabilər həzrət Peyğəmbərdən öyrəndikləri hədisləri ən çətin şərtlərdə belə başqalarına nəql etmə işini sürdürmüş və bu mövzuda heç bir fədakarlıqdan boyun qaçırmamışlar.

Əbu Zərr əl-Qifari (vəfatı32/652):*"Boynumu vurmaq üçün başımda qılıncla gözləsəniz və mən də bilsəm ki qılınc məni kəsmədən əvvəl Rəsulullahdan eşitdiyim sözü rəvayət edə biləcəm, mütləq bunu edərdim"* [97] demişdi.

Əbud-Dərda (vəfatı 32/652) son nəfəsində belə yanındakıların köməyi ilə yatağında oturaraq həzrət Peyğəmbərin namazla əlaqəli bir hədisini rəvayət etmişdir.[98]

Muaz ibn Cəbəlin də Allahdan başqa ilah olmadığına və Məhəmmədin onun elçisi olduğuna şəhadət edənin Cəhənnəmə girməyəcəyinə dair hədisi, həzrət Peyğəmbərin *"bunu heç kimə söyləmə, ona güvənib ibadətlərində laqeyidlik göstərərlər"*-deyə xəbərdarlıq etməsinə baxmayaraq, vəfat edəcəyi zaman, üzərimdə məsuliyyət qalar düşüncəsi ilə, ətrafındakılara rəvayət etməsi, onun hədis rəvayətinə olan bağlılığını göstərməkdədir.[99]

Nəticə olaraq deyə bilərik ki, səhabə hədisləri öyrənib təbliğ etmək üçün əllərindən gələn bütün fəaliyyətləri göstərmişlər. Bu gün əlimizdə mövcud olan hədis ədəbiyyatı onların səylərinin məhsuludur.

### 3. Səhabənin hədis rəvayətində ehtiyatlı davranmaları

Səhabə, bir yandan başqalarına az hədis rəvayət etməyi tövsiyə etmiş və özləri də əllərindən gəldiyi qədər az rəvayət etməyə çalışmışlar. Bundan başqa hədis rəvayət edənlər üçün də ehtiyatı əldən verməmişlər. Hədis rəvayət edənin hafizə və zəbtində şübhə olmadığından əmin olsalar, onun hədisini qəbul edərlər, başqa bir dəlil və ya şahid tələb etməmişlər. İndi bu hadisəni aydınlaşdıran bəzi rəvayətləri nəql edək;

97 Buxari, Elm, 10.
98 Əhməd ibn Hənbəl, VI, 443.
99 Buxari, Elm, 49.

Həzrət Əbu Bəkr xəbərlərin qəbulu mövzusunda ehtiyatlı davrananlardan ilkidir. İbn Şihabın nəql etdiyinə görə, bir nənə özünə nəvəsindən miras ala bilib bilməməsini öyrənmək üçün həzrət Əbu Bəkrin yanına gəlmişdi. Əbu Bəkr də: *"Allahın kitabında bunun haqqında bir şey yoxdu. həzrət Peyğəmbərin sözlərində də səninlə əlaqəli bir şey bilmirəm"*-dedi. Sonra çevrilib yanındakılara soruşdu. Bunu eşidən Muğirə ayağa qalxdı və: *"həzrət Peyğəmbər nənəya altıda bir hissə verirdi"*-dedi. Əbu Bəkr ona: "Səni təsdiq edəcək kimsə varmı"-deyə soruşdu. Məhəmməd ibn Məsləmə də ona şahidlik edincə, xəlifə Əbu Bəkr nənə üçün bu hökmü tətbiq etdi.[100]

Zəhəbi, möminlərin xəlifəsi həzrət Ömər üçün belə deməkdədir, "Muhaddislər üçün hədis nəqlində təhqiq cığırını açan Ömərdir. Çox vaxt bir şəxsin verdiyi xəbərdə tərəddüd edərsə o an qəbul etməz, onu araşdırardı."[101] Əbu Səidin nəql etdiyinə görə Əbu Musa, həzrət Ömərin qapısına gəlib içəri girmək üçün icazə istəmiş, həzrət Ömər cavab verməyincə geri dönmüşdü. Bunun üzərinə həzrət Ömər onun arxasınca bir şəxs göndərdi və "nə üçün döndün?"-deyə soruşdu. O da: " Rəsulullahın belə dediyini eşitdim. Sizdən biriniz üç dəfə salam verib cavab almazsa geri dönsün"-deyincə, həzrət Ömər, "bunun üçün bir şahid gətirməlisən, yoxsa mən sənə nə edəcəyimi bilirəm"-demişdi. Əbu Musanın Əbu Səidi şahid göstərdikdən sonra üzərinə həzrət Ömər belə demişdir: "İnanın, mən səni yalanlamaq üçün deyil, sırf insanların Rəsulullah adına yalan uydurmalarından qorxduğum üçün belə etdim."[102]

Möminlərin xəlifəsi həzrət Əli də belə demişdir: "həzrət Peyğəmbərdən özüm bir hədis eşidəndə, o hədisdən Allahın

100 Zəhəbi, *Təzkirə,* I, 2.
101 Zəhəbi, e.a.ə. I, 6.
102 Buxari, Buyu, 9; Müslim, Ədəb, 35,36.

istədiyi qədər faydalanıram. Fəqət başqa biri Peyğəmbərdən bir hədis rəvayət edərsə ona and içdirirəm. And içərsə doğru dediyinə inanıram."[103]

Möminlərin anası həzrət Ayişə də həzrət Peyğəmbərin Merac gecəsində Rəbbini gördüyünü bildirən hədisini, ***"Gözlər onu görməz, O, bütün gözləri görər"***[104] ayəsinin xarici mənasını diqqətə alaraq rədd etmiş və belə demişdir: "Kim Məhəmmədin Merac gecəsində Rəbbini gördüyünü söyləyərsə Allaha ən böyük iftira atmış olar."[105]

Bütün bu rəvayətlər bizə səhabənin hədis nəqlində nə qədər ehtiyyatlı davrandıqlarını göstərir. Onlar həm ravini həm də onun nəql etdiyi hədisi sağlam elmi tənqid metodlarıyla dəyərləndirmişlər.

Bu xüsus da göz ardı edilməməlidir ki, səhabilərin hədisi Peyğəmbərdən eşidildiyinə dair başqa bir ravi tələb etmələri ya da hədisi rəvayət edən raviyə and içirmələri həmişə etdikləri iş deyildir. Belə bir yola, ancaq ravinin zəbtindən şübhə etdiklərində müraciət etmişlərdir. Bəzi hədisləri rəvayət edən ravinin hifzindən əmin olunca da onun rəvayətlərini də olduğu kimi qəbul etmişlər. Məsələn: həzrət Ömər, Dahhak ibn Sufyanın Rəsulullahın özünə yazdığı bir yazıda Əşyəm əd-Dəbabinin diyətinə xanımının mirasçı ola biləcəyini bildirən xəbərini qəbul etmiş və bu mövzuda Dahhakdan harhansı bir dəlil tələb etməmişdir.[106]

103 Zəhəbi, e.a.ə, I, 10.
104 Ənam, 6/103.
105 Buxari, Təfsir, 53.
106 Hədis üçün bax. Əbu Davud, Fəraiz, 18.

### 4. Səhabənin fərqli sayda hədis rəvayət etmələrinin səbəbləri

Səhabənin hamısı Peyğəmbərdən hədis rəvayət etməmişdir. Ən böyük hədis (məcmuəsi) əsəri olaraq tanınan Baki Məxlədin (vəfatı 276/889) Müsnədinin sadəcə 1300 səhabi tərəfindən rəvayət edilən hədisləri əhatə etdiyi bilinməkdədir.

Həmçinin verilən rəqəmlərə görə bunlardan minə yaxınının ən çox iki hədis rəvayət etdiyi nəzərə alınarsa geriyə əsil hədis rəvayət edənlərin sayısı qalır ki, bu da üç yüzdür. Fəqət bu üç yüz nəfərdən ancaq yeddi nəfərin mindən, dörd nəfərin beş yüzdən və iyirmi yeddi nəfərin yüzdən artıq hədis rəvayət etdiklərini qəbul edəndə cəmi otuz səkkiz nəfərin həqiqətən bu işlə məşğul olduğu söylənə bilər. Halbuki daha əvvəl də işarə etdiyimiz kimi Əshabın sayısı 120 000-ə yaxın idi. Buradan da başa düşmək olar ki, hədis rəvayət edən səhabənin sayı ümumi saya nisbətən olduqca azdır.

Təbii ki belə olmasının müəyyən səbəbləri vardır. Bunlardan bir qismi xüsusi səbəblərdir ki, bu səbəbləri ancaq səhabinin həyatını araşdırmaqla bilmək olar. Bir qismi də ümumi səbəblərdir. Əvvəlcə çox hədis rəvayət edənləri və bunun səbəblərini, daha sonra da az hədis rəvayət edənləri və bunun səbəblərini incələməyə çalışaq:

#### a. Çox hədis rəvayət edənlər (Muksirun)

Rəvayət etdikləri hədis sayısına görə səhabilər iki qrupa ayrılmışdır. Bunlardan birincisi mindən çox hədis rəvayt edənlər, ikincisi isə mindən az rəvayət edənlərdir. Mindən çox hədis rəvayət edənlərə **muksirun** mindən az rəvayət edənlərə isə **muqillun** deyilir. Əvvəlcə muksirunu qeyd edək;

**1) Əbu Hüreyrə**

Muksirun içərisində ən çox hədis rəvayət edən Əbu Hüreyrədir. 5374 hədisi rəvayət etmişdir.

Əbu Hüreyrə, Hicrətin yeddinci ilində (həzrət Peyğəmbərin vəfatından üç il əvvəl) müsəlman olmuş, hicri 57-ci ildə vəfat etmişdir. Əsl adı Əbdürrəhman ibn Sahrdır. Rəsulullahın (s) məscidində sadəcə ibadətlə məşğul olan Əhli-Suffənin[107] ən nüfuzlu siması idi

Ömər ibn Xəttabın xilafəti dövründə Bəhreyn valisi idi. Bir müddət sonra həzrət Ömər onu vəzifədən almışdır. Əbu Hüreyrəni sonralar həzrət Muaviyə, Mədinə əmirliyinə təyin etmişdir. Həzrət Ömər –hədis rəvayətində göstərdiyi həssaslıq səbəbiylə- Əbu Hüreyrənin çox hədis rəvayət etməsini xoş görməmiş və onu: "Ya çox hədis rəvayət etməyəcəksən, yaxud da səni Devsə göndərəcəyəm!"-deyə təhdid etmişdi. Həzrət Əbu Hüreyrə də ona Rəsuli-Əkrəmin; **"***Mənim söyləmədiyim bir sözü bilə-bilə mənə isnad edən kəs cəhənnəmdəki yerinə hazırlaşsın"* hədisini oxuduğu zaman, həzrət Ömər, onun hədis uydurmayacağını və rəvayət etdiyi hədislərin həqiqətən Peyğəmbərimizə (s) aid olduğunu qəbul etmiş və "o təqdirdə get, rəvayətinə davam et"-demişdir.

**2) Abdullah ibn Ömər**

İbn Ömər, 2630 hədis rəvayət etmişdir.

Abdullah ibn Ömər, ikinci xəlifə Ömər ibn Xəttabın oğludur. Fitva verməklə məşhur dörd Abdullahdan (Abadilə) biridir. (Digər üç Abdullah isə, Abdullah ibn Abbas, Abdullah ibn Əmr ibn əl-As və Abdullah ibn Zübeyrdir)

107 Süffə, Məscidi-Nəbəvidə kölgəlik bir yerdir. Zahid səhabilər orada məskunlaşmışdılar.

Abdullah ibn Ömər H. 73-cü ildə 87 yaşında ikən vəfat etmişdir. Deyildiyinə görə Həccac ona sui-qəsd hazırlamış, zəhərli bir mizrağı bir adam vasitəsilə ayağına düşürmüş, İbn Ömər də bunun vasitəsilə ölmüşdür. Ölümünün təbii olduğu da söylənməkdədir . Ancaq bu xəbər doğru deyildir.

**3) Ənəs ibn Malik**

Müksirunun üçüncüsü olan Ənəs ibn Malik, 2286 hədis rəvayət etmişdir.

Ənəs daha on yaşında ikən həzrət Peyğəmbərə xidmət etmə şərəfinə nail olmuşdur. Buna görə də Onun çox söz və davranışlarına şahid olmuşdur. Həzrət Peyğəmbər (s) ona, "iki qulaqlı: (zülüzüneyn)"-deyə zarafat edirdi; ona heç bir zaman, ağa-xidmətçi münasibəti göstərməmişdir. Bu etibarla Ənəs deyir ki:

"Etdiyim hər hansı bir şey üçün Rəsuli-Əkrəm, niyə bunu etdin və ya etmədiyim bir şey üçün də bunu niyə etmədin, deyə məni danlamırdı, sadəcə "Allahın dilədiyi olur, diləmədiyi olmaz"-deyərdi**.**

Onun haqqında Əbu Hüreyrə bunları söylər: **"**Qıldığı namaz, Rəsuli-Əkrəmin namazına Ənəsinki qədər bənzəyən birini hələ görmədim."

Həzrət Peyğəmbərin vəfatından sonra 83 il yaşamışdır. Bəsrə yaxınlarında hicrətin 93-cü ilində vəfat etmişdir. Vəfat etdiyi gün Müvərrik belə demişdir: "Elmin yarısı getdi. Bir bidatçı bizə müxalifət etdiyi zaman ona; "gəl, həzrət Peyğəmbəri (s) dinləyənin yanına gedək" deyərdik!"

**4) Möminlərin anası həzrət Ayişə**

Muksirunun dördüncüsü olub özündən 2210 hədis rəvayət edilmişdir.

Rəsuli-Əkrəmin zövcəsi olan həzrət Ayişə, Rəsulullah əleyhissalamın dostu və ən çox sevdiyi insan həzrət Əbu Bəkirin qızıdır. Hələ çox kiçik yaşda ikən İslama girdi; on doqquzuncu müsəlman odur. Rəsuli-Əkrəm əleyhissalam ilə hicrətin ikinci ilində evlənmişdir.

Həzrət Peyğəmbərin vəfatından sonra 39 il yaşamışdır. Bu vaxt ərzində həzrət Peyğəmbərdən duymadığı hədisləri atası həzrət Əbu Bəkir, həzrət Ömər, Səd ibn Əbi Vəqqas kimi səhabilərdən öyrənmişdir. Həzrət Ayişə (r) h. 57-ci ilində vəfat etmişdir.

**5) Abdullah ibn Abbas**

Həzrət Peyğəmbərin əmisi oğlu olan İbn Abbas 1660 hədis rəvayət etmişdir.

Hicrətdən üç il əvvəl doğulmuşdur. Rəsuli-Əkrəm (s) onun haqqında belə dua etmişdir: "*Allahım! Onu dində fəqih qıl və Quran elmini öyrət*." Cənabı-Haqq, Rəsulunun duasını qəbul etmişdir. Bu səbəblə İbn Abbas, elminin çoxluğu və fiqhinin dərinliyi ilə şöhrət qazanmış elm yolçuları ondan fitva almaq və hədis rəvayət etmək üçün uzaq diyardan gəlmişdir.

Rəsuli-Əkrəm (s) ona, **Tərcümanül-Quran** ləqəbini vermişdir.

Ömrünün son günlərində gözləri kor oldu. Daha əvvəl atası və babası da eyni dərdə tutulmuşdu. İbn Abbas, Taifdə, hicrətin 68-ci ilində vəfat etmişdir.

**6) Cabir ibn Abdillah**

Muksirunun altıncısıdır. 1540 hədis rəvayət etmişdir. Həzrət Peyğəmbərin vəfatından sonra 67 il ömür sürmüşdür.

Ömrünün sonlarına doğru Cabirin gözləri kor olmuş və Mədinədə hicrətin 74-cü ilində vəfat etmişdir.

**7) Əbu Səid əl-Xudri**

Bu sahabidən 1170 hədis rəvayət edilmişdir. Həzrət Peyğəmbərin vəfatından sonra 64 il yaşamışdır.

Əbu Səid 80 yaşında ikən h. 74-cü ilində Mədinədə vəfat etmişdir.

**5. Səhabənin fərqli sayıda hədis rəvayət etmələrinin səbəbləri**

İfadə edildiyi kimi mindən çox hədis rəvayət edənlər muqsirun olaraq adlandırıldığı kimi mindən az sayıda hədis rəvayət edənlər də muqillun olaraq adlandırılırlar. Eyni dönəmdə yaşamalarına baxmayaraq fərqli sayıda hədis rəvayət etmələrini belə sıralamaq olar:

**a. Mindən çox hədis rəvayət etmələrinin səbəbləri**

*Birinci Səbəb*, həzrət Peyğəmbərlə müəyyən səbəblərlə olan yaxınlıqlarına görə, gecə-gündüz Onunla birlikdə olmalarıdır. Məsələn: həzrət Aişə onun həyat yoldaşı idi. İbn Abbas əmisi oğlu, Əbu Hüreyrə, Ənəs və Cabir onun hizmətçiləri idi. İbn Ömər də onun qayını idi.

*İkinci Səbəb,* bu səhabilərin son dərəcə zəki və özlərinin hədis rəvayətinə həsr etmiş olmaları idi.

*Üçüncü Səbəb,* həzrət Peyğəmbərin vəfatından sonra uzun müddət yaşamış olmaları və bu müddət ərzində öyrəndikləri hədisləri rəvayət etmə fürsətlərinin olmasıdır.

*Dördüncü Səbəb,* həzrət Peyğəmbərdən özlərinin duyduqları hədislərlə kifayətlənməyib, eşitmədiklərini də digər səhabilərdən almalarıdır.

*Beşinci Səbəb,* bunlardan bəzilərinin (Əbu Hüreyrə, İbn Abbas) həzrət Peyğəmbərin duasını almaları və bunun nəticəsində hafizələrinin güclənməsidir.

*Altıncı Səbəb,* dövlət məmurluğu kimi zaman alıcı işlərlə məşğul olmamalarıdır.

*Yeddinci Səbəb,* bəzilərinin hədisləri yazması. Əbu Hüreyrə, Cabir, İbn Ömər, İbn Abbas kimi.

**b. Mindən az hədis rəvayət etmələrini səbəbləri**

Bu səbəblərə keçmədən əvvəl önəmli bir nöqtəyə diqqət çəkmək istəyirik. Səhabələri sünnə bilgiləri rəvayət etdikləri hədis sayısına görə ölçmək olmaz. Çünki hədis rəvayətinə təsir edən bir çox səbəb vardır.

*Birinci Səbəb;* Bəzi səhabənin xəlifəlik, valilik, qazilik kimi dövlət işləriylə məşqul olmaları. Əsasən ilk dörd xəlifənin vəziyyəti belə idi. Bunlar həzrət Peyğəmbərlə uzun müddət bərabər olduqlarına baxmayaraq məşğuliyyət səbəbiylə çox hədis rəvayət edə bilməmişlərdir.

*İkinci Səbəb;* Əshabın bəzilərinin həzrət Peyğəmbər dövründə və ya onun vəfatından qısa müddət sonra vəfat etmiş olmaları.

*Üçüncü Səbəb;* Həzrət Peyğəmbəri bir neçə dəfə görmə şərəfinə nail olub söhbətindən çox istifadə etmə imkanı olmaması.

*Dördüncü Səbəb;* Bəzi səhabilərin daha çox ibadətlə məşğul olmaları. Hal belə olunca da təbii olaraq xalqla ünsiyyətdə qopuqluqlar olur.

*Beşinci Səbəb;* Həzrət Peyğəmbərdən eşidilənlərin ləfzi olaraq rəvayət edə bilməmə qorxusu.

*Altıncı Səbəb;* Əshabın çox olması səbəbiylə özlərinin hədis rəvayət etməsinə ehtiyac olmadığı düşüncəsi.

*Səkkizinci Səbəb;* Bəzi səhabilərin də özünün hədis rəvayət etməsinə baxmayaraq, daha sonrakı nəsillərə sağlam yollarla çatmadığı üçün hədislərin kitablara alınmaması. Məsələn: Əbu Übeydə ibn Cərrahın hədisləri zəif ravilər tərəfindən nəql edildiyi üçün Buxari və Müslimin səhihlərində yer almamışdır.

*Doqquzuncu Səbəb;* Bütün səhabilərin elm öyrənmə və öyrətmədəki səviyyələrin eyni olmaması.

## III. TABEUN DÖVRÜ

Hədisləri bizə nəql edən ikinci təbəqə Tabeun nəslidir. Bu dövrdə bütün islami elmlər xüsusiylə də hədis elmi sahəsində bir çox tərəqqiyə imza atılmış və gələcək elmi sahələr üçün elmi təməllər hazırlanmışdır.

### A. TABEUNUN TƏRİFİ

Tabei (التابعي) lüğətdə "təbia" (تبع) izləmək, arxasından gəlmək, tabe olmaq feelindən ismi mənsubdur. İzləyən, arxasından gələn tabe olan qrupa mənsub şəxs, onlardan biri mənalarına da gəlməktədir.

Hədis termini olaraq isə, *həzrət Peyğəmbərin əshabından hərhansı biriylə, mömin olaraq görüşən, onunla danışıb elm təhsil edən və mömin olaraq vəfat edən şəxsə taei* deyilir. Cəmi "tabeun"-dur.

### B. TABEUNUN FƏZİLƏTİ

Müsəlmanlar içində əshabdan sonra ən üstün olan nəsil tabiun nəslidir. Həzrət Peyğəmbərin tərbiyəsində böyüyən, yetişən və onunla görüşmə şərəfinə nail olan əshab, tabiun nəslinə

müəllimlik etmiş, həzrət Peyğəmbərdən özlərinə keçən nuru və bilgini onlara nəql etmişdirlər.

Qurani-Kərimdə uca Allah: *"Dində hamını qabaqlamış ilk mühacirlərdə, ənsarlardan və xeyir əməllərdə onların ardınca gələnlərdən Allah razıdır və onlar da Ondan razıdırlar...*[108] ayəsindəki *"xeyir əməllərdə onların ardınca gələnlər"* (و الذين اتبعوهم باحسان) ifadəsi ilə tabiun nəslindən bəhs etmiş və onlardan razı olduğunu bildirmişdir.

Həzrət Peyğəmbər əleyhissalam da:

خَير أمَّتي قَرْني ثُمَّ الَّذينَ يَلوُنَهُم ثُمَّ الَّذينَ يَلوُنَهُم

*"Ümmətimdən ən xeyirli nəsil mənim də içində olduğum nəsildir. Sonra onlardan sonra gələnlər, sonra da onlardan sonra gələnlərdir."*[109] buyuraraq əshabından sonra ən xeyirli nəslin tabiun nəsli olduğuna işarə etmişdir.

Tabeilər arasında ən fəzilətlisı Kufəlilərə görə Üveys əl-Qərani, Məkkəlilərə görə Ata ibn Əbi Rəbah, Mədinəlilərə görə Səid ibn əl-Müsəyyib (əl-Müsəyyəb), Bəsrəlilərə görə də Həsən əl-Bəsridir. Tabiilərin ən böyüyü və fəzilətlisi haqqında hər bölgəyə görə fərqli qəbul edilməsinə baxmayaraq ümumiyyətlə Səid ibn Müsəyyəb qəbul edilmişdir.

Tabeun nəsli hədis rəvayətində səhabə nəsli kimi tənqid xaricində tutulmamışdır. Onların dövründə müxtəlif siyasi böhranlar, etiqadı fərqliliklər baş verdiyi üçün və bunlardan hər hansı birisinin bu hərəkətlərə qatılma ehtimalı olduğu üçün, hər biri hədis alimləri tərəfindən tənqid ələyindən süzülmüşdür. Hədis rəvayətində gərəkli şərtlərə malik olanlar güvənilir qəbul edilmiş,

108 Tövbə, 9/100.
109 Buxari, Şəhadət, 9; Tirmizi, Fitən, 45.

bu şərtlərdən hər hansı birisinin əksik olduğu müəyyənləşdirilən ravinin hədisi zəif olaraq qəbul edilmişdir. Buna görə də tabiun nəsli səhabə nəsli kimi bütünlükdə adil qəbul edilməmişdir.

## C. TABEUNUN HƏDİS ELMİNƏ XİDMƏTLƏRİ

Vəhyin başlaması ilə İslamın iki əsasından biri olan sünnə, həzrət Peyğəmbər əleyhissalamın ən yaxın dostları olan səhabə tərəfindən tam bir diqqət və incəliklə qorunmuş, bəzən əzbər, bəzən də yazı yolu ilə tabiuna çatdırılmışdır. Tabiun, ustadları olan səhabələrdən öyrənib təslim aldıqları sünnəni eyni saflığı ilə qorumağa çalışmışlar. O dövrdə ortaya çıxan hədis uydurma və İslamın saf ruhunu bulandırma fəaliyyətləri, tabiunun Qurani-Kərim və sünnəyə daha möhkəm sarılmaları nəticəsini vermişdir. Xüsusilə də İslamın təməlini təşkil edən etiqad və fiqh sahəsində Qurani-Kərim və sünnəyə daha möhkəm bağlanmışlar. Bu iki qaynaqda hökmü açıq olan xüsuslarda öz rəylərinə yer verməmişlər, hökmü ictihad və rəy ilə müəyyənləşdirmək lazım olanda isə öz fikirləri ilə ictihad edərkən Qurani-Kərim və sünnənin ruhuna sadiq qalmağa diqqət etmişlər. Onlar bu davranışları ilə həm elm həm də əməl (praktika) halında İslamın həqiqətini mühafizə etmişlər.

Bu nəsil, səhabə ilə görüşərək hədis topladıqları və müxtəlif növdə qruplaşdırdıqları, bu hədisləri müzakirə edərək həm öz aralarında həm də sonrakı nəslə çatdırmaq surətiylə hədislərin itməməsini təmin etdikləri üçün hədis tarixində mühüm dəyərə sahibdirlər.

Tabeun, səhabədən sonra, həyatlarını elm və mədəniyyət yoluna vəqf etmiş ikinci nəsildir. **Təfsir, Hədis, Fiqh, Kəlam** kimi İslami elmlərin çoxunun onların dövründə ortaya çıxıb sistemləşməyə başlaması, onların elmə verdikləri əhəmiyyətin və bu barədə çox

çalışdıqlarının sübutudur. Tabeun, hədis təhsilinə böyük əhəmiyyət vermiş, və bu yolda böyük nailiyyətlər əldə etmişdir. Onların hədis təhsilindəki əzmkar fəaliyyətlərinin əsl səbəblərini bu şəkildə sadalamaq olar:

a. Sünnənin, Qurani-Kərimdən sonra ikinci əsas olması.

b. Sünnənin, Qurani-Kərimlə birgə digər İslami elmlərə qaynaqlıq etməsi.

c. Tabiun dövründə Hədis uydurma fəaliyyətinin ortaya çıxması.

d. Tabiunun, Sünnəni və Hədisi olduğu kimi mühafizə etmək əzmi olması və bunu özlərinə vəzifə bilmələri.

e. Elm öyrənməyə arzu və həvəsləri.

f. Hədislərin toplanmasının (tədvin) zəruri hala gəlməsi.

Tabiun dövrü hədis və hədis elmi cəhətindən bu xüsusiyyətləri ilə fərqlənir:

a. Hədislər dağınıq vəziyyətdə idi.

b. Müsəlmanlar arasında baş verən ixtilaf və bölünmələr uydurma rəvayətlərin ortaya çıxmasına səbəb olmuşdur.

c. Hədislərin toplanmasına başlanmış və bu səbəblə səyahətlər edilmişdir.

d. Səhih Hədisləri uydurma olanlardan ayırmaq üçün ravilərin tərcümeyi-halları araşdırılmış və isnad metodundan istifadə edilməyə başlanmışdır.

e. İnsanların hafizələri zəifləmişdi. Bu xüsusa Zəhəbi *Təzkiratül- huffaz*ında yer verməkdədir.

f. Hədis sənədlərinin, zamanın uzanması və ravilərin çoxalmasına görə hədis təriqləri də artmışdı. Belə ki, hədisi hər səhabidən çox sayıda insan alaraq müxtəlif bölgələrə dağıldılar və beləcə hədislərin sayıları da artdı. Rivayətlərə gizli-aşikar bəzi illətlər və zəiflik girmiş oldu.

g. Siyasi olaraq rafizi və xarici, etiqadi yöndən də mötəzilə, cəbriyyə doğru yoldan uzaqlaşmış, Səhabə və Tabiunun izlədiyi üsuldan ayrılmış firqələr peyda olmuş və çoxalmışdı.

## D. ELMİ SƏYAHƏTLƏR və SƏBƏBLƏRİ

Səhabə dövrünü incələyərkən hədisləri yaymaq və bilmədikləri hədisləri digər səhabilərdən öyrənmək üçün edilən səyahətlərdən bəhs etmişdik. Bu fəaliyyət səhabə dövründə olduğu kimi tabiun zamanında da öz əhəmiyyətini sürdürmüşdür. Burada tabiin dövründəki səyahətlər haqqında az da olsa bəhs etmək istəyirik.

“ər-Rıhlə fi tələbil-Hədis” adı ilə şöhrət qazanan bu səyahətlər səhabələr arasında olduğu kimi, tabiunlar arasında da get-gedə artmış və hədis toplamağın üsullarından biri olmuşdur. Hədislə məşğul olan bir çox tabiun, ilk qaynaq olan, müxtəlif ölkələrə yayılan səhabələri bir-bir ziyarət edərək onlardan, Peyğəmbərimizdən (s) eşidib rəvayət etdikləri hədisləri toplamağa başlamışlar. Səid ibn əl-Müsəyyəbin lazım olduğunda bir hədis üçün günlərlə yol getdiyini söyləməsi, Məsruq ibn əl-Əcdanın bir hərf üçün də olsa səyahət etməsini bildirməsi hədislərin toplanması və doğru olaraq müəyyənləşdirilməsi üçün sərf olunan əmək və diqqəti göstərən dəlillərdəndir. Bu insanlar; Aməşin ifadəsi ilə “Hədisə bir vav (و), bir əlif (أ), bir dal (د) artırmaqdan və ya yerlərini dəyişdirməkdənsə göylərin öz başlarına yıxılmağına üstünlük verirdilər.”

Səhabələrin hər biri adil olmasına və yalana qəti qarşı olmalarına baxmayaraq tabiun imamları eşitdikləri bir hədisi başqa səhabədən də öyrənirdilər. Bu xüsusda tabiunun böyük imamlarından Əbul-Aliyə belə buyurur: *“Biz harada olursaq-olaq, Rəsulullahın (s) səhabələrindən bir şey eşitdiyimiz zaman onunla kifayətlənməz, oraya köçər, işi qaynağından araşdırıb, başqa səhabələrə də soruşar və beləliklə rəvayəti qüvvətləndirərdik.”*[110]

Hədis toplamaq üçün edilən səyahətlər bir tərəfdən hədislərin daha geniş ölkələrə yayılmasını təmin etdiyi kimi, digər tərəfdən bir hədis mətninin müxtəlif rəvayət şəkillərinin də ortaya çıxmasına səbəb olmuşdur. Çünki bir hədisçi bəzən yaşadığı şəhərdə öz şeyxindən eşitdiyi bir hədisi bir başqa yerdə və başqa bir şeyxdən daha başqa bir şəkildə eşidə bilərdi. Bu isə bir tərəfdən hədisçilər arasında hədislə əlaqəli müzakirə qapısını açarkən, digər tərəfdən də “filankəs hədisi belə rəvayət etdi, filankəs də belə...” ifadəsinin təbii bir nəticəsi olaraq isnad fikrinin yerləşib inkişaf etməsində əsas amillərdən biri olmuşdur.

Elm tələb etmək üçün səyahət etmənin bir neçə səbəbi var. Bunlardan ən əhəmiyyətlilərini belə sıralaya bilərik:

1. Səhabə dövründə rihlə, bəzən səhabinin həzrət Peyğəmbərdən eşitmədiyi bir hədisi dinləmək məqsədi ilə edilirdi. Bəzən də, səhabinin bildiyi, ancaq yaşadığı şəhərdə bu hədisi özündən başqa heç kim bilmədiyi üçün, bu hədisi dəqiqləşdirmək üçün edilirdi.

2. Səhabənin müxtəlif bölgələrə dağılması səbəbiylə eyni səfərlər tabiun dövründə də davam etdi. Səhabənin hər biri nəbəvi mirasdan bir pay daşıdığı üçün onların elminə ehtiyac vardı. Bu səbəbə görə də özlərindən hədis almaq və ya möcvud hədisləri

110 Darimi, *Sünən*, I, 114.

dəqiqləşdirmək üçün onların məskunlaşdıqları yerlərə səfərlər edilirdi.

3. Hədis uydurma hərəkətinin başlaması.

4. Ali sənəd axtarışı. Ali sənəd tələbi üçün də səfərlərə çıxılmışdır. İmam Əhmədin bildirdiyinə görə, "Ali sənəd tələbi, sələfdən qalan bir sünnədir.

## E. MUXADRAM

Tabiinin tərifində ifadə etdik ki, bir şəxsin bu nəsildən sayılması üçün hərhansı bir səhabi ilə görüşməsi, qarşılaşması və bir nəfərin səhabi ola bilməsi üçün də həzrət Peyğəmbərlə görüşməsi, şərtlərdən biri idi. Fəqət həzrət Peyğəmbər dövründə yaşayıb müsəlman olduğu halda onunla görüşmə şərəfinə nail olmayan, onunla həyatında və ya vəfatından sonra səhabilərdən bir və ya bir neçəsi ilə görüşən şəxslər üçün yeni bir tərif yaradılmış və bu qrupa daxil olan müsəlmanlara "**muxadram"** deyilmişdir.

Muxadramlar səhabə ilə görüşdükləri üçün tabiunlar arasında yer alırlar. Bunlar Peyğəmbərimizi (s) görmədikləri üçün səhabə sayılmırlar. Bu şəxslər səhabədən aldıqları hədisi-şərifləri rəvayət etmişlər. Muxadramlardan qırx qədərinin adları müəyyənləşdirilmişdir. Bunlardan ən məşhurları bunlardır: Üveys əl-Qərani, Əbu Amr əş-Şeybani, Əbu Rəca əl-Utarıdi, Süveyd ibn Gafələ, Amr ibn Məymun, Əbu Osman ən-Nəhdi, Əbu Müslim əl-Həvlani, əl-Əhnəf ibn Qeys.

Muxadram kəlməsinin cəmi "muxadramun" (المخضرمون) dur.

## IV. ƏTBAUT-TABEİN DÖVRÜ

Ətbaut tabiin həzrət Peyğəmbərin hədislərini nəql edən üçüncü nəsli təşkil edir. Bunların dövrü hədis alma və nəql etmə üsullarının ən mükəmməl hala gəldiyi dövrdür.

### A. ƏTBAUT-TABEİNİN HƏDİS ELMİNƏ XİDMƏTLƏRİ

Bu dövrün Hədis elmi yönündən önəmini iki halda izah etmək olar:

Hədis elminin əsas qollarından biri olan Cərh və Tədil bu dövrdə sistemləşmişdir.[111] Bilindiyi kimi tabiun zamanında hədislərin müxtəlif şəkildə rəvayət olunması, uydurma rəvayətlərin meydana çıxması, hədis elminin təşəkkül etməsinin əsasını qoymuşdur. Bununla bərabər cərh və tədil metodu ilə isnad üsulundan istifadə olunmağa başlanmışdır. Tabiunlar səhih Hədisləri doğru və nöqsansız bir şəkildə təsbit etmək və uydurma rəvayətləri ayırmaq üçün müxtəlif üsul və qaydalardan istifadə etmişlər. Təbə-tabiun dövründə isə bu qaydalar inkişaf etmiş və ən mükəmməl şəklini almışdır. Artıq təbə-tabein mühəddisləri:

a. Hədis təliminin üsul və qaydalarını,

b. Hədis rəvayətinin əsaslarını,

c. Ravilərin hallarını və bir ravidə olması lazım olan şərt və vəsfləri,

d. Hədislərin sağlamlıq dərəcələrini tam olaraq sistemli bir şəkildə bilirdilər. Ancaq hədis elmini təşkil edən bu xüsuslar, bu mərhələdə yazıya keçirilməmişdir.

Hədislər, səhabə dövrünün sonu ilə tabeun dövrünün ilk illərində toplanmağa başlamış, tabiunun uzun və yorucu, ancaq

111 Cərh və tədil mövzusu daha sonra müstəqil olaraq incələnəcəkdir.

dəqiq və səmimi çalışmaları nəticəsində bu dövrün sonlarına doğru tədvin (hədis toplama) işi böyük ölçüdə tamamlanmışdır. Toplanan hədislər yazıya keçirilsə belə sinifləndirilməmişdir.

Təbə-tabiun mühəddisləri, toplanan hədisləri mövzularına görə təsnif edib, "müsənnəf" əsərlər meydana gətirmişlər. İmam Malikin Muvəttası bunun ən gözəl örnəyidir.

## V. DÖVRLƏRİN XRONOLOGİYASI

| DÖVRLƏR | BAŞLAMA TARİXİ | BİTMƏ TARİXİ |
|---|---|---|
| Peyğəmbər dövrü | Bisətin başlaması 610-cu il | Hicrətin 11-ci il |
| Səhabə dövrü | Hicrətin 11-ci il | Hicrətin 110-cu il |
| Tabiun dövrü | Hicrətin 110-cu il | Hicrətin 180-ci il |
| Ətbaut-Tabiin dövrü | Hicrətin 180-ci il | Hicrətin 220-ci il |

## I. HƏDİS ÜSULU

Hədis üsulu adı altında incələdiyimiz mövzu əslində Hədis üsulu elmidir. Hədis elmini Dirayətül hədis və Rivayətül hədis diyə iki qrupa ayırmışdıq. Hədis üsulu bu elmin Dirayətül hədis qoluna mənsubdur.

### A. HƏDİS ÜSULU TERMİNİ

Hədis üsulu termini adından da məlum olduğu kimi hədis və üsul sözlərindən meydana gəlmişdir. Hədis kəlməsinin hansı məna ifadə etdiyini əvvəlki fəsildə ifadə etmişdik.[112]

Üsul (الاصول), əsil (الاصل) kəlməsinin cəmidir. Əsillər, köklər, mənbələr mənasına da gəlməkdədir. Termin olaraq yol, metod, nizam, qayda mənalarını ifadə etməktədir. Bu mənada bir elmin əsil mövzusundan əvvəl öyrəniləcək əsaslar, prinsiplər və ilk bilgilər mənasına gəlir. Buna görə hədis üsulu, hədisin (səhih olanını olmayandan ayırma) əsasları, qaydaları deməkdir.

Bu bir həqiqətdir ki, hədis elminə aid bilgilər birdən birə cəm şəkildə meydana gəlməmişdir. Hər elmdə olduğu kimi bu elmin terminalogiyası da müəyyən zaman əsnasında tədricən olmuşdur. Hər hədis alimi şübhəsiz sahəsi ilə əlaqəli terminləri bilirdi, ancaq bunun sistemləşməsi müəyyən zamanda olmuşdur.

112 Hədis Tarixi bölməsinə bax.

Bu elm bugünkü ad və halıyla ilk üç əsr alimləri tərəfindən tanınmır və bu günkü kimi kitab halında da toplanmış deyildi. Bununla bərabər terminlər alimlər tərəfindən bilinirdi.[113]

Hədis üsulu elmi və prinsipləri hədis texnologiyası deməkdir. Bu elmə əvvəllər Mustalahul-hədis də deyilirdi. Üsul mövzularını anlatmaq üçün Ulumul-hədis ifadəsi də işlədilmişdir.

## B. HƏDİS ÜSULU ELMİNİN DOĞUŞU

Qurani Kərimi dünya və axirət xoşbəxtliyini qazanma yollarını göstərən hidayət rəhbəri olaraq göndərən Allah, onu açıqlama vəzifəsini də elçisi həzrət Muhamməddə vermişdir.

Əvvəlki fəsildə də ifadə ettiyimiz kimi səhabə nəsli ilk zamandan bəri həzrət Peyğəmbərin hədislərinə və həyat tərzinə yüksək səviyyədə önəm vermiş, onları əzabərləmiş, həyatlarına tətbiq etmiş, onları olduğu kimi öyrənib tətbiq edərək başqalarına çatdırmaq üçün fövqaladə çalışmışlar.

Sünnəyi öyrənmək üçün günlərini sərf edən ilk müsəlmanlar, daha sonralar yeni ölkələr fəth edilincə, təbii olaraq da bu səfər yeni müsəlmanların kitab və sünnəyi öyrənmə arzularıyla qarşılaşdılar. İstər xəlifələr tərəfindən vəzifələndirilən valilər istərsə də mücahid səhabilər, əsil vəzifələrinin təlim və təbliğ olduğu şüuruyla hərəkət edirdilər. Fatih səhabilərin əksəriyyəti, ayrı-ayrı bölgələrdə yerləşərək orada kitab və sünnə bilgisini yaymağa çalıştılar. Səhabilərin yorulmadan bu fövqaladə çalışmalarını görən tabiilər də bu çalışmaları sürdürmüşlər.

Digər tərəfdən ictimai, siyasi və etiqadi qarışıqlıqlar, təbliğ vəzifəsi və həzrət Peyğəmbərə aid olmayan bir şeyi Ona isnad

113 Selman Başaran, M. Ali Sönmez, *Hadis Usulü ve Tarihi*, s. 91.

etməməyə diqqət və incəliyinə, bəzi qayda və elmi çalışmaların da başlamasına səbəb oldu.

Hər elmi fəaliyyətin müəyyən əsaslar dairəsində tədbiq edilməsi nə qədər təbii isə, eyni şeylərin təkrarı da müəyyən qaydaların tapılmasını, yoxdursa qoyulmasını və tabe olunmasını tələb edir. Bir başqa ifadə ilə hər şeyin qayda qanunu var. Bu səbəblə yuxarda diqqət çəkdiyimiz elmi fəaliyyətlər də bəzi qaydaların müəyyənləşdirməsini lazımlı hala çevirmişdir. Bu qaydalar da daha sonra müstəqil kitabların mövzusu olan hədis üsulu prinsipləridir.

İstər sünnənin doğru olaraq nəql edilməsi, istərsə də bu mətnlərin sağlam şəkildə qorunub, təlim tədrisinin və dəyərləndirməsinin edilməsi və bu dəyərləndirməyə kömək edəcək hər cür incələmə və fəaliyyətin başladılması, etiraf etmək lazımdır ki, əshab nəslinə aid bir şərəfdir. Səhabə rəvayətül hədis elmini qurduqları kimi rəvayət qaydalarını da qoyaraq dirayətül hədis elminin bünövrəsini qoymuşlar.

Müsəlmanlardan əvvəl heç bir millət xəbər nəql edən ravilərin güvənlik vəziyyətlərini müəyyənləşdirmək üçün müəyyən qaydalar qoymayı düşünməmişdir. Hədislər və rəvayətlər sadəcə nəql olunmuşdur. Nadir olaraq bir-iki adlıq sənəd zikr edilmişdir. Buna görə də hədis nəql edənlərin şəxsi vəziyyətlərinin araşdırılması və mütləq sənədin zikr edilməsini əsas alan Hədis Üsulu elmi, müsəlmanlara aid xüsusiyyətdir.

"Sənəd və mətnin vəziyyətlərini anlamağa imkan verən bəzi qaydalar elmi" mənasına gələn Hədis Üsulu, daha ilk günlərdə müsəlmanların tapıb inkişaf etdirdikləri elmi nizamdır. Mövzüsu da rədd və qəbul yönündən sənəd və mətndir.




## II. NİSBƏT BAXIMINDAN HƏDİSİN NÖVLƏRİ

### A. QÜDSİ HƏDİS

**Leksik mənası:** Lüğətdə bildirildiyi kimi اَلْقُدْسِيّ (müqəddəslik) kəlməsi اَلْقُدْس (təmiz olan) kəlməsinə nisbət ediliibn Qüdsi hədis lüğətdə "müqəddəsə aid olan söz"-deməkdir. Buradakı müqəddəs də Allahdır.

**Termin mənası:** Qüdsi hədis, *Mənası Allah Təalaya, söz və ifadəsi isə Peyğəmbərimizə əleyhissalam aid olan hədislərdir*[114]. Bu mənalar,

114 Amili, *Hədis Üsulu*, s. 38.

Peyğəmbər əleyhissalama yuxuda ikən ilham olunmuşdur. Sonra da Rəsulullah əleyhissalam bu mənaları öz ifadəsi ilə insanlara çatdırmışdır. Qüdsi hədislərə İlahi və Rəbbani hədislər də deyilir.

Qüdsi hədislər əsasən bu iki xüsusiyyətə malikdir:

1. Həzrət Peyğəmbər tərəfindən Allaha nisbət edilir

2. Ümumiyyətlə Allahın sifətləri ilə əlaqəli mövzuları əhatə edir.

Nəbəvi hədisə nisbətən qüdsi hədislərin sayı daha azdır. Bunların sayı cəmi 200 qədərdir.

Qüdsi hədislər əsasən bu iki rəvayət ləfizləri ilə rəvayət olunur:

1 قَاَلَ رَسُولُ اللهِ صلَّي الله علَيْهِ وَ سَلَّمَ فِيمَا يَرْوِيهِ عَنْ رَبِّهِ عَزَّ وَ جَلَّ...

*"Peyğəmbər əleyhissalam şanı uca olan Rəbbindən rəvayət edərək belə buyurdu"*

2 قاَلَ رَسوُلُ اللهِ(ص) قاَلَ اللهُ تاَعاَليَ...

*"Allahın rəsulu əleyhissalam belə dedi: Uca Allah buyurdu...*

Qüdsi hədisə nümunə olaraq bu hədisi göstərə bilərik:

حَدَّثَناَ ابوُ مَعْمَرٍ حَدَّثَنا عَبْدُ الْوَارِثِ حَدَّثَنا جَعْدُ بْنُ دِينارٍ أبوُ عُثْمَاَنَ حَدَّثَنا أبوُ رَجاَء الْعُطَارِدِيُّ عَنْ ابنْ عَبَّاسٍ رَضِيَ الله عنهُماَ عَنْ النّبيّ صلَّي الله علَيْهِ وَ سَلَّمَ فِيماَ يَرْوِي عن رَبِّهِ عزَّ وَ جَلَّ قال قال إنَّ اللهَ كَتَبَ الحَسَناَتِ و السَّيِّئاَتِ

Əbu Məmər, Əbdülvarisdən, o Cəd ibn Dinardan, o Osmandan, o Əbu Rəca Utarididən, o da İbn Abbasdan bizə xəbər Ver-

di ki, Peyğəmbər əleyhissalam Uca Allahdan rəvayət edərək belə dedi; *Allah yaxşılıqları da, pislikləri də yazmışdır.* [115]

Qüdsi hədislərlə əlaqəli bir çox əsər qələmə alınmışdır. Bu əsərlərdən ən məşhurur Əli əl-Qarinin *əl-Əhadis əl-Qüdsiyyə* adlı əsəridir.

**1. Qurani-Kərim və Qüdsi Hədis arasındakı fərqlər**

Qüdsi hədisin mənası Allah Təalaya aid olsa da "mətluv" (oxunan) vəhy olmadığı üçün Qurani-kərim olaraq qəbul olunmadığı kimi, tamamən Rəsulullaha əleyhissalam aid olmadığı üçün də Nəbəvi hədis də sayılmaz. Qurani-kərim və qüdsi hədislər arasındakı ortaq nöqtə, ikisinin də Allaha nisbət edilməsidir. Bununla yanaşı ikisi arasında mühüm fərqlər vardır:

1. Qurani-kərimin mənası, ləfzi və tərtibi vəhyə əsaslanır. Qüdsi hədisin mənası Allaha ləfzi isə peyğəmbərə aiddir.

2. Qurani-kərimin mənası, ləfzi və tərtibi mütəvatirdir. Qüdsi hədisin isə nə ləfzi nə də mənası mütəvatir deyildir.

3. Qurani-kərimin məna ilə rəvayət olunması doğru deyil, ancaq qüdsi hədislərin məna ilə rəvayət edilməsi üçün bir mane yoxdur.

4. Qurani-kərim namazlarda qiraət məqsədi ilə oxunur. Qüdsi hədislər isə namazda oxunmaz.

## B. NƏBƏVİ HƏDİS

Həzrət Peyğəmbər əleyhissalamın sözlərini, davranışlarını və təqrirlərini ifadə edən rəvayətlərə nəbəvi hədis və ya mərfu hədis deyilir.

115 Buxari, Riqaq 31

Termin mənası olaraq Nəbəvi/mərfu hədis belə tərif edilir: *Peyğəmbərə nisbət edilən kəlam, hərəkət, təqrir, əxlaqi vəsiflər, (istər sənədi münqəti (kəsik) və ya müttəsil (kəsiksiz) olsun) bilvasitə və ya bilavasitə Peyğəmbər əleyhisslama nisbət edilən hədislərə* ***Nəbəvi*** *və yaxud* ***Mərfu*** *hədis deyilir.* Bu nisbəti edənin səhabə olması ilə tabeun və ya daha sonrakı nəsildən biri olması arasında heç bir fərq yoxdur.

Mərfu hədis nisbət edən baxımında da iki qismə ayrılır:

1. Açıq (Sərahətən) Mərfu
2. Hökmən Mərfu

**1. Nəbəvi Hədisin qisimləri**

Mərfu (nəbəvi) hədislər, "açıq mərfu" və "hökmən mərfu" olaraq ikiyə ayrılır:

**a. Açıq (sərahətən) mərfu**

Açıq bir şəkildə həzrət Peyğəmbər əleyhissalama nisbət edilən hədisdir. Beləki, hədisin içində Rəsulullah əleyhissalama aid bir söz, bir fel, bir təqrir vəya bir sifətindən açıq şəkildə söz edilirsə bu hədis açıq (sərahətən) mərfu hədis qəbul edilir. Eyni zamanda أُمِرْنَا كَذَا və yaxud نُهِينَا عَنْ كَذَا rəvayət ləfizləri ilə səhabə tərəfindən rəvayət edilən hədislər də açıq mərfu rəvayətlər olaraq qəbul olunur. Açıq mərfu rəvayətlər qarşımıza üç şəkildə çıxar. Bu rəvayət ya qövlü mərfudur, yaxud feli mərfudur ya da təqriri mərfudur.

**1) Qövlü mərfu**

Açıq mərfu hədislər əgər qövlü hədis növünə aid isə aşağıdakı rəvayət ləfizləri ilə rəvayət olunur:

Rəsulullah əleyhissalam belə buyurdu:

قَاَلَ رَسوُل الله صلَّي الله علَيْهِ وَ سَلَّمَ

Rəsulullah əleyhissalamı belə deyərkən eşitdim:

سَمِعْتُ رَسوُلَ الله صلَّي الله علَيْهِ وَ سَلَّمَ يَقُولُ

Rəsulullah əleyhissalam bizə bunları xəbər verdi:

حَدَّثَناَ رَسوُل الله صلَّي الله علَيْهِ وَ سَلَّمَ بِكَذَا

Rəsulullah əleyhissalamın belə buyurduğu rəvyət edlmişdir

عَن رَسوُل الله صلَّي الله علَيْهِ وَ سَلَّمَ انَّهُ قاَلَ

Qövlü mərfu hədisə bu rəvayəti misal olaraq göstərmək olar:

Misal:

عَن عَلِيّ بْنِ اَبِي طَالِبٍ قاَلَ: قَالَ رَسُولُ اللهِ صلَّي الله علَيْهِ وَ سَلَّمَ: خَيْرُكُمْ مَنْ تَعَلَّمَ الْقُرْاَنَ وَ عَلَّمَهُ

Əli ibn Əbi Talibdən rəvayət edilmişdir. O, dedi ki, "Rəsulullah belə buyurdu: *"Sizin ən xeyirli olanınız, Quranı öyrənən və onu öyrədəndir."*[116]

Hədisin mətninə diqqət yetirilərsə burada Peyğəmbər əleyhissalamın hikmətli ifadələrinin, yəni kəlamının yer aldığını görmək mümkündür.

**2) Feli mərfu**

Həzrət Peyğəmbərə nisbət edilən **feli hədislər** də açıq mərfunu ifadə edir. Bu növ mərfu hədislər aşağıdakı rəvayət ləfizləri ilə rəvayət olunur:

Rəsulullah əleyhissalamı belə edərkən gördüm

رَاَيْتُ النَّبِيَّ صلَّي الله علَيْهِ وَ سَلَّمَ يَفْعَلُ كَذاَ : ...

116 Buxari, Fəzailul Quran, 21; Əbu Davud, Salat, 349.

Rəsulullah əleyhissalma belə-belə edərdi

كَانَ رَسُولُ اللهِ صلَّي الله علَيْهِ وَ سَلَّمَ يَفْعَلُ كَذاَ: ...

“*Rəsulullah əleyhissalam belə idi (hərəkət etdi, bunu elədi)*” və buna oxşar ifadələrlə də Peyğəmbərimizə aid bir davranışın rəvayət edildiyi hədislər açıq feli mərfu hədisləri ifadə edir. Feli mərfu hədisə bu rəvayəti misal olaraq göstərmək olar:

عَنْ وَائِلِ بْنِ حُجْرٍ قَالَ: رَايْتُ النَّبِيّ صلَّي الله علَيْهِ وَ سَلَّمَ اِذَا سَجَدَ وَضَعَ رُكْبَتَيْهِ قَبْلَ يَدَيْهِ وَ اِذَا نَهَضَ رَفَعَ يَدَيْهِ قَبْلَ رُكْبَتَيْهِ.

Vail ibn Hucr belə demişdi: *“Allah Rəsuluna, (namaz qıldığı əsnada) nəzər yetirdim. Səcdəyə gedərkən dizlərini əllərindən əvvəl qoydu. Səcdədən qalxarkən də əllərini dizlərindən əvvəl yerdən qaldırdı.”* [117]

Hədisdə göründüyü kimi həzrəti Peyğəmbər əleyhissalamın namaz qılarkən səcdəni necə etdiyi, yəni namazdakı hərəkətləri haqqında məlumat verilir.

**3) Təqriri mərfu**

Açıq olaraq həzrət Peyğəmbərə nisbət edilən təqriri hədislər də səhabənin bu ifadələri ilə hədis kitablarında yer alır:

فَعَلْتُ /فَعَلْنَا بِحَضْرَةِ النَّبِيّ صلَّي الله علَيْهِ وَ سَلَّمَ كَذاَ

“Rəsulullahın hüzurunda belə-belə etdim /etdik.

فَعَلَ فَلَانٌ بِحَضْرَةِ النَّبِيّ صلَّي الله علَيْهِ وَ سَلَّمَ كَذاَ

“Rəsulullahın hüzurunda filankəs belə-belə etdi.

117 Əbu Davud, Salat 142.

Bu ifadələrin sonunda da bu edilənlərin həzrət Peyğəmbər əleyhissalam tərəfindən rədd edilmədiyi bildirilir. Təqriri mərfu hədislərə nümunə olaraq bu rəvayəti göstərmək mümkündür:

عن جابررَضي الله عنه كُنّاَ نَعْزِلُ و الْقُرْأَنُ يَنْزِلُ. وَ زَادَ مُسْلِمِ فَبَلَغَ ذَلِكَ النّبي صلَّي الله علَيْهِ وَ سَلَّمَ فَلَمْ يَنْهَنَا

Cabirdən belə rəvayət olundu, biz, *Quran nazil ola ola əzl edərdik*. Müslimdə belə bir ziyadəlik var; *bu xəbər peyğəmbərə çatdırıldı və o da bundan nəhy etmədi*.

Hədisdə göründüyü kimi, Peyğəmbər əleyhissalam əmr etmədiyi halda səhabələrin əzl etməsindən bəhs olunur. Bu davranışlara görə Peyğəmbər əleyhissalam onları bu hərəkətlərindən çəkindirmir və susqunluğu ilə qarşı olmadığını ifadə etmiş olur.

**b. Hökmən mərfu**

Bir səhabənin, həzərət Məhəmməd əleyhissalamdan öncə gəlimiş peyğəmbərlərə aid və ya gələcəkdə baş verəcək hadisələrlə əlaqəli və yaxud da o əməli edənə savab və ya əzab vəd edən mövzular haqqında verdiyi xəbərlərə “hökmən mərfu” deyilir. Bu növ mövzular haqqında məlumatı bir səhabə ancaq Peyğəmbər əleyhissalamdan öyrənə bilər. Məhz buna görə də bu növ hədislər də mərfu hədislər olaraq qəbul edilir.

Səhabə, bu cür sözləri və ya hərəkətləri Rəsulullahın etdiyini görmüşdür. Ancaq o sözü və ya hərəkəti hədis olaraq rəvayət edərkən, Rəsulullahdan eşitdiyini və ya gördüyünü qeyd etməyə ehtiyac hiss etmir. Bu halda belə söz ya da hərəkətlərin mənbəyi Rəsulullah əleyhissalam olduğundan, bu cür rəvayətlər “hökmən mərfu” sayılır. Ancaq diqqət yetiriləcə bir xüsus var ki, belə xəbərləri rəvayət edən səhabələrin İsrailliyyata aid xəbərlər nəql

edənlərdən olmamalıdır. Yoxsa onun xəbər verdiyi məlumatlar israiliyyat bilgisi olaraq qəbul edilir.

Hökmən mərfuya bu misalı verə bilərik:

حَدَّثَنَا مُحَمَّدُ بْنُ مَحْبُوبٍ حَدَّثَنَا حَفْصُ بْنُ غِيَاثٍ عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ إِسْحَقَ عَنْ زِيَادِ بْنِ زَيْدٍ عَنْ أَبِي جُحَيْفَةَ أَنَّ عَلِيًّا رَضِيَ اللَّهُ عَنْهُ قَالَ مِنْ السُّنَّةِ وَضْعُ الْكَفِّ عَلَى الْكَفِّ فِي الصَّلَاةِ تَحْتَ السُّرَّةِ

*"Namazda, əlləri bir-birinin üstündə və göbək altında bağlamaq sünnədəndir."*[118]

Həzrət Əli bu tətbiqi Peyğəmbərimizdən görüb öyrənməsinə baxmayaraq, hadisəni, Peyğəmbərimizə isnad etmədən izah etmişdir. Təməldə bu tətbiq Rəsulullaha aid olduğu üçün həzrət Əlinin bu sözü "hökmən mərfu" qəbul edilir.

Səhabədən birinin: "أُمِرنَا اَنْ..." "Belə etməklə əmr olunduq."; "نُهِينَا عَنْ ." Bunu etməkdən nəhy edildik" kimi ifadələrlə nəql etdikləri də eyni şəkildə hökmən mərfu sayılır. Məsələn Ümmü Atiyyə belə deyir:

عن امِّ عَطيةَ قَلَتْ نُهِينا عَنِ اتِّبَاعِ الْجَنائِزِ و لَمْ يُعْزَمْ عَلَيْنا.

Ümmi Ətiyyə belə dedi: *"Bizə, cənazəni təqib etmək qadağan olundu. Ancaq bu bizə haram qılınmadı.*[119]

Səhabənin bu sözündən nəhy edənin həzrət Peyğəmbər olduğunu anlayırıq.

**2. Nəbəvi Hədisin hökmü**

Bütün İslam alimləri mərfu hədisi hüccə /dəlil olaraq qəbul etmişdir. Buna görə də mərfu hədislər bizim üçün mötəbərdir.[120]

118 Əbu Davud, Salat 118.
119 Buxari, Cənaiz 29.
120 İbn Salah, Müqəddimə, s. 41-48

## C. MÖVQUF HƏDİS

**Leksik mənası:** Mövquf kəlməsi lüğətdə durmaq, dikəlmək mənasına gələn الوقف kəlməsinin ismi məfuludur. Adətən ravi hədisi səhabədə durduraraq, isnad silsiləsinin qalan qismini qeyd etməmiş olur.

**Termin mənası:** Səhabəyə nisbət edilən söz, fel, təqrir və davranışlarına aid -istər müttəsil istərsə də münqəti olsun- xəbərlərə mövquf hədislər deyilir. Mövquf hədislər ancaq sərahətən/açıq mövquf olur. Hökmən mövqufdan heç bir qaynaqda söhbət açılmamışdır. Mövquf hədislər əsasən bu rəvayət ləfizləri ilə rəvyət olunur:

Ömər (r) belə dedi:

قَالَ عُمرُ بْنُ الخَطَّاب كَذَا

İbn Abbas (r ) belə etdi

فَعلَ ابنُ عَبّاَسٍ كذا

Əbu Hüreyrə (r ) belə təqrir etdi

قَرَّرَ ابوُ هُرَيْرَةَ كذا

İbn Ömərdən (r ) mövquf olaraq rəvayət edilir ki,

جَاءَ عَنْ ابن عُمَرَ مَوْقوُفاً

Bu rəvayət İbn Abbasa (r ) çatdıqda mövqufdur.

هوَ مَوْقوُفٌ عَلىَ ابن عَبّاسٍ

Misal:

عَنْ اَنَسِ بْنِ مَالِكٍ قَالَ: قَيِّدُوا الْعِلْمَ بِالْكِتَابِ.

Ənəs ibn Malikdən rəvayət edildiyinə görə o, belə demişdir: *"Elmi yazaraq qeyd edin (möhkəmləndirin.)"*[121]

عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ قَالَ: لاَ يَحِلُّ ِلا مْرِئٍ مُسْلِمٍ يَبِيعُ سِلْعَةً يَعْلَمُ اَنَّ بِهَا دَاءً اِلاَّ اَخْبَرَ بِهِ.

Üqbə ibn Amirdən rəvayət edildiyinə görə o, belə demişdir: *"Müsəlman bir adamın, bir malda qüsur olduğunu bildiyi halda o qüsuru müştəriyə xəbər vermədən satması halal deyildir."*[122]

**1. Mövquf Hədisin dərəcələri**

Mövquf hədislər, daha çox ibadət xaricindəki mövzularla əlaqəli səhabə sözləridir. Bunların isnadları müttəsil və ya münqəti ola bilər. Bu baxımdan belə rəvyətlərin səhih olanları olduğu kimi, həsən və ya zəif olanları da vardır. Çünki hədislərdəki səhihlik, həsənlik və ya zəiflik hədis üsulu qaydalarına uyğun şəkildə sənədin incələnməsi nəticəsində müəyyənləşir.

Mövquf hədisə səhih deməklə onun Peyğəmbərə aid olduğu söylənmiş olmaz. Onunla əməl etmək də vacib deyil. Çünki ən sağlam görüşə görə mövquf hədis hüccə deyildir.

**2. Mövquf hədisin hökmü**

Mövquf hədisin hökmü haqqında alimlərin müxtəlif görüşləri var.

Əsasən həzrət Peyğəmbərə aid olmayan Səhabə kəlamları olduğuna görə, mərfu hədis kimi dində dəlil sayılmır. Ancaq mərfu hökmündə olan məvquf hədislər isə mərfu hədislər kimi dində dəlil qəbul edilir.

Bu mövzuda alimlər fərqli görüşlər mənimsəmişlər:

121 Zəbidi, e.a.ə., I, 44
122 Buxari, Buyu, 19.

Hənəfilərdən Razi, Səraxsi və İmam Malik və Əhməd ibn Hənbələ görə mövquf hədis hüccədir.

Hənəfilərdən bəzilərinə və İmam Şafiiyə görə mövquf hədislər hüccə (dəqiq dəlil) sayılmazlar. Çünki bu hədislər, səhabənin yalnızca öz fikrlərini ifadə edən söz, fel və ya təqrirlərdir.

Mərfu hədis olmayan mövzularda məvquf hədisin dəlil ola biləcəyini qəbul edən alimlər də vardır.

## D. MƏQTU HƏDİS

**Leksik mənası:** Məqtu lüğətdə bir şeyi kəsmək, kəsib qoparmaq, yarmaq, ayırmaq mənasına gələn قطعfelinini ismi məfuludur.

**Termin mənası:** Hər hansı bir tabeuna nisbət edilən söz, fel və təqrirlərə məqtu hədis deyilir. Ətbaut-tabeun da tebeun kimi qəbul edilir. Yəni onların da söz, fel və təqrirləri məqtu hədis növünə daxildir.

Hədis terminlərinin tam şəkillənmədiyi ilk dövrlərdə məqtu termini münqətı mənasında istifadə edilmişdir.

Məqtu hədisə misal olaraq ətbaut-tabeundan olan Mücahidin bu kəlamını göstərə bilərik:

قَالَ مُجَاهِدٌ لَا يَتَعَلَّمُ الْعِلْمَ مُسْتَحْيٍ وَلَا مُسْتَكْبِرٌ

Mücahidin belə dediyi rəvayət edilmişdir: *Utanan və kibirli insan elm öyrənə bilməz.*[123]

Məqtu hədislərin də isnadları müttəsil və ya münqəti ola bilər. Məqtu hədis hüccə deyildir. Əbu Hənifə belə demişdir:

123 Buxari, Elm 50.

*Rəsulullah əleyhissalmadan gələn hədislərin başımızın üstə yeri var. Səhabələrdən gələn xəbərlər haqqında müxəyyərik (seçmə haqqımız var). Tabeundan gələn xəbərlərə gəlincə onlar da bizim kimi insanlardır (hüm rical nahnu rical).* İmam Əzəmin bu sözü məqtu hədislərin dəlil olmayacağını açıq şəkildə ifadə etməkdədir.

## III. RAVİ SAYISI BAXIMINDAN HƏDİSİN NÖVLƏRİ

Hədislərin bir qismi Peyğəmbər əleyhissalamdan tək bir sənədlə, bəziləri isə birdən çox sənədlə rəvayət edilmişdir. Bu baxımdan alimlər hədisləri mütəvatir və əhad olmaq üzrə iki qismə ayırmışlar. Bu iki əsas qismi incələmədən ravi ilə əlaqəli bəzi tənqid nöqtələrinə təmas etmək mövzunu daha yaxşı başa düşmək baxımından önəmlidir. Bu baxımdan ravinin incələnmə nöqtələrinə nəzər yetirək:

### A. RAVİNİN İNCƏLƏNMƏSİ

Cərh və Tədil elmi nöqteyi nəzərdən ravilər, **mətaini-əşərə** deyilən on nöqtədən tənqid edilərək ayrı-ayrı ləfizlərlə dəyərləndirilir. Buna hədis elmində **tan nöqtələri** də deyilir.

Bu on nöqtədən beşi ravinin ədalət vəsfinə, beş dənəsi də zəbt vəsfinə aiddir. İndi də bunları sıralayaq:



### 1. Ravinin ədaləti ilə əlaqəli olan tan nöqtələri

#### a. Kizbur-ravi

Ravinin, hədis rəvayətində yalançılığı, yəni həzrət Peyğəmbərin söyləmədiyi şeyi söylədi deyə, etmədiyini də etdi deyə rəvayət etməsidir.

Ən ağır qüsur budur. Ömründə bir dəfə də olsa hədisdə yalan söylədiyi sübut olunan ravinin, istər yalan söylədiyi zamandan əvvəl istərsə də sonra rəvayət etdiyi hədislərin heç biri qəbul edilməz. Çünki, digər hədislərdə də yalan söyləmə ehtimalı vardır.

Yalançılığı açığa çıxan raviyə **kəzzab (yalançı)** və ya **vədda (hədis uyduran),** rəvayət etdiyi hədisə də **mövzu (saxta)** deyilir.

#### b. İttihamur-ravi bil-kizb

Ravinin yalançılıqla ittiham edilmiş olmasıdır. Hədisdə yalançılığı sabit olmayıb, günlük həyat və danışmalarında yalançılıqla tanınan və məşhur olarsa, rəvayətdə də yalan söyləyə bilər deyə rəvayətlərinə etibar edilməz. Belə ravinin rəvayət etdiyi hədisə **mətruk** deyilir.

#### c. Fisqur-ravi

Fisq ravinin sözlə və əməllə Allaha üsyan halında olmasıdır. İslamın əmr və qadağalarından hərhansı birinə diqqət etməyən və tabe olmayan şəxsə fasiq (günahkar) deyilir. Bu ravinin rəvayət etdiyi hədisə **münkər** özünə də **ləyyinul-hədis** deyilir

#### d. Bidətur-ravi

Ravinin, inkar və inad niyyəti daşımadan, yanlış şərhlə, İslam dininin etiqadi prinsiplərinə zidd olan bir inanca sahib olması və əhli-bidət içərisində yer almasıdır. Belə bir ravinin rəvayət etdiyi hədisə **"mərdud"** deyilir.

**e. Cəhalətur-ravi**

Hədisin sənədində yer alan ravinin bilinməməsi, tanınmaması halıdır. Belə bir ravinin, isnadında yer aldığı hədisə **"mübhəm"** deyilir.

**2. Zəbtlə əlaqəli tənqid nöqtələri**

**a. Kəsrətül-qələt**

Ravinin yanılmasının çox olması və hədisi öyrənərkən və nəql edərkən yanılıb çaşdığını müəyyən etməsidir. Çaşması əlli faiz vəya daha çox olan ravinin rəvayətləri qəbul edilmir. Belə əksikliyi olan ravinin rəvayət etdiyi hədis **münkər** adlanır.

**b. Fərtul-qəflə**

Bir ravinin, əzbərlədiyi hədislərdə və ya digər işlərində çox diqqətsiz və dalğın olması deməkdir. Belə bir kəs hədisi öyrənərkən xəta və yanlış edəcəyindən, onun hədisinə etibar edilməz və o hədisə **"münkər"** deyilir.

**c. Vəhmur-ravi**

Ravinin rəvayətini vəhm üzərinə bina etməsi, (hədisin mətn və sənədlərini dəqiq bilməyib bir-birinə qarışdırması) və nə rəvayət etdiyini bilməməsidir. Hətta cərh və tədildə doğru zənn edərək bəzi xətaların etməsi də vəhmə daxildir. Belə ravinin hədisinə də **mualləl** deyilir.

**d. Muxaləfətus-siqat**

Ravinin, hər yönündən güvənilən olan tanınmış bir siqa raviyə və ya özündən daha siqa olan bir kəsə müxalifətlə onların rəvayətlərinə zidd rəvayət etməsidir. Belə bir ravinin rəvayət etdiyi hədisə **müzdərib, müdrəc** və ya **mühərrəf** deyilir.

**e. Suil-hifz**

Ravinin hafizəsinin zəyif olması, hədisi səhv və ya əksik əzbərləməsi və tez unutması halıdır. Belə bir şəxsin səhvi doğrusundan, unutqanlığı əzbərindən çox olur. Unutma nəticəsində tez-tez səhvə düşən raviyə seyyiul-hifz də deyilir. Hafizəsi pozuq olanların rəvayətləri əsla qəbul edilmir.

Nəticə olaraq bu tan (tənqid) nöqtələrini güclüdən zəifə doğru və ya ən ağırından ən xəfifinə doğru sıralamaq istəyirik:

a. Kizbür-Ravi

b. İttihamur-Ravi bil-Kizb

c. Kəsrətül-Qələt

d. Fartul Qəflə

e. Fisqur-Ravi

f. Vəhmur-Ravi

g. Muxaləfətus-Siqat

h. Cəhalətur-Ravi

i. Bidətur-Ravi

j. Suil-Hifz

Bütün bu xüsusiyyətlərdən ortaya çıxan həqiqət budur: İslamı yaşamayan, günah işləyən, yalançı və bidət sahibi olan, səfeh və zindiq olan, nə rəvayət etdiyini bilməyən, çox xəta edən, hafizəsi zəyif olan, rəvayətdə dəqiq davranmayan, siqa ravilərin rəvayətlərinə zidd rəvayət edən şəxslərin hədsiləri səhih qəbul edilməz. Hətta mühəddislər, küçələrdə yemək yeyən, zarafat və əyləncəyə düşkün olan, oyunlar oynayan, musiqi alətləri ilə əylənən şəxslərin rəvayətlərini qəbulda çox şiddətli davranmışlar.

Mövzunun əvvəlində də göstərdiyimiz kimi, yuxarıda izah etdiyimiz sifətlərdən hər hansı biri özündə var olan bir ravi üçün, o qüsurunu ifadə edici bir termin işlədilir. Məsələn: yalançı isə "kəzzab (çox yalançıdır)" və ya "əkzəbun-nas" (insanların ən yalançısıdır)"; yalanla ittiham edilmişsə "müttəhəm bil-kizb (yalanla günahlandırılmışdır)"; tanınmırsa "məchulul-hal (tanınmır)" kimi...

Qüsuru tapılmayan güvənilən ravilər üçün də "siqa (etimadlı)"; "hüccət (dəlil)"; "saduq (çox doğrudur)"; "mütqin (diqqətli və sağlam)"; "şeyx (ustaddır)"; "adl (ədaləti tamdır)" kimi ifadələr işlədilir.

## B. MÜTƏVATİR HƏDİS

**Leksik mənası:** Lüğətdə (التواتر) "təvatür" sözündən törəmiş ismi faildir. Təvatür kəlməsi lüğətdə arxa-arxaya gəlmək, arda-arda olmaq mənası ifadə edir.

**Termin mənası:** Məntiq və əqlin yalan söyləmələri üzrə birləşmələrini (yəni bərabər olaraq yalan söyləmələrinin) imkansız gördüyü bir topluluq tərəfindən, sənədin əvvəlindən sonuna qədər hər təbəqədə yenə özləri kimi bir topluluqdan rəvayət etdikləri hədislərə *Mütəvatir hədis* deyilir. Mütəvatir hədislər eşitmə və görməyə bağlıdır. Mütəvatir hədislər dəqiq məlumat ifadə etdiyinə görə tənqidə tabe tutulmur.

Bir hədisin mütəvatir saylması üçün bu dörd şərtin olması lazımdır:

**1) Böyük bir topluluq tərəfindən rəvayət edilməsi.** Bu topluluq neçə nəfərdən ibarət olması haqqında qəti məlumat yoxdur. Qəbul edilən görüşə görə isə ən az on nəfərdən ibarət olmalıdır.

**2) Bu topluluq sənədin hər təbəqəsində mövcud olmalıdır.** Yəni bu sayı heç bir təbəqədə qəbul edilən sayıdan az olmamalıdır. Beləki əgər sənədin başında ən az on nəfər varsa, sonuna qədər hər təbəqədə ən az on nəfər olmalıdır. Bu sayının on nəfərdən artıq olması sənədin mütəvatir olmasına xələl gətirməz.

**3) Bu topluluğun yalan üzərinə birləşmələri mümkün olmamalıdır.** Yəni topluluğun bütün fərdləri eyni yalanı bir-birindən xəbərsiz, eyni şəkildə söyləməsi mümkün deyildir.

**4) Xəbəri rəvayət edən şəxslər o xəbəri ilk mənbəsindən eşitməli və ya şəxsən gözləri ilə görməlidir.**

### 1. Mütəvatir Hədisin növləri

Mütəvatir hədis ləfzi və mənəvi olmaq üzərə iki qismə ayrılır.




### a. Ləfzən mütəvatir

Bütün rəvayətlərində ləfizləri eyni olan xəbərlərə ləfzi mütəvatir deyilir. Yəni xəbər həzrət Peyğəmbərin mübarək ağzından çıxdığı şəkildə rəvayət edilirsə buna ləfzi mütəvatir deyilir. Ləfzi mütəvatir hədislərin sayısı çox azdır. Ləfzi mütəvatirə misal olaraq

مَنْ كَذَبَ عَلَيَّ مُتَعَمّدا فاليَتَبَوّأ مَقْعَدَهُ من النّار

*"Kim bilərək mənə yalan isnad edərsə cəhənnəmdəki yerinə hazırlaşsın"* hədisi göstərilir. [124]

Ləfzən vəya mənən deyə qeyd edilmədən mütəvatir kəlməsindən istifadə edilirsə, ləfzən mütəvatir hədis nəzərdə tutulur.

**b. Mənən mütəvatir**

Eyni ləfizlərlə deyil, fərqli-fərqli kəlamlarla rəvayət edilərək ortaya çıxan müştərək mənaya mənən mütəvatir deyilir. Məsələn, həzrət Peyğəmbərin dəstəmaz alışı, namaz qılışı, necə oruc tutduğu, necə həcc etdiyini bildirən fərqli ləfizlərlə rəvayət edilmiş bir çox hədis var. Bunların əksəriyyəti təvatür dərəcəsinə yüksəlməktədir. Daha açıq bir misalla ifadə etsək, yüzə yaxın hədisi şərifdə Peyğəmbərimizin dua edərkən əllərini açıb qaldırdığı, fərqli-fərqli hadisələr olaraq qeyd edilmişdir. Burada mütəvatir olan məna dua edərkən əllərinin qaldırılmasıdır. Odur ki, dua edərkən əllərin qaldırılması mənəvi təvatürlə bizə çatmışdır.

**2. Mütəvatir hədisin hökmü**

Mütəvatir hədisləri hədis tənqidçiləri incələməmişlər. Çünki bunların Rəsulullaha əleyhissalam aid olduğuna zərrə qədər şübhə yoxdur.

a) Mütəvatir hədis dəqiq (qəti) məlumat ifadə edir. Buna görə mütəvatir hədisi inkar edən şəxs kafir olur. Çünki belə bir inkar Peyğəmbər əleyhissalamı inkar deməkdir.

b) Mütəvatir hədislər, həqiqətən səhih olduğu üçün həqiqətləri ifadə edir. Buna görə də onları incələmə ehtiyacı hiss edilməmişdir. Mütəvatir hədislərlə əməl etmək vacibdir.

124 Buxari, Elm, 38; Cənaiz, 33; Ənbiya, 50; Ədəb 109; Müslim, Zühd, 72.

c) Mütəvatir hədislər hədis üsulu qaydalarına görə incələmə və tənqidə tabe deyil. Hədis üsulunun incələdiyi hədis növləri mütəvatirin xaricindəki hədislərdir.

d) Sənəd və mətn yönündən tənqidə tabe tutulmadığı üçün hədis alimlərindən daha çox fəqihlərin istifadə sahəsi olmuşdur.

**3. Mütəvatir hədisin sayı**

Mütəvatir hədisin sayısı çoxdur. Məsələn, hayız, məstlər üzərinə məs etmək, namazda iki əlini qaldırma hədisləri ilə, *"kim məndən bir şey eşidib onu eşitdiyi kimi mühafizə edər və başqa birinə nəql edərsə Allah onun üzünü ağartsın"*[125] kimi hədisi burada misal olaraq verə bilərik. Buna bənzər hədislərin sayı olduqca çoxdur. Ancaq ahad hədisləri nəzərə aldığımızda mütəvatir hədislərin sayı olduqca azdır. Mütəvatir hədislərə aid əsər yazan Suyutiyə (vəfatı 911/1505) görə mütəvatir hədislərin sayı 100 dən artıq ikən, Kəttaniyə (vəfatı 1345/1505) görə bu sayı 300 aşmaqdadır.

**4. Mütəvatir hədislərlə əlaqəli əsərlər**

1. Suyuti *əl-Əzhərul-mütənasıra fil əxbaril mütəvatira.* Əsər bablara görə tərtib edilmişdir.

2. Suyuti, *Katful-əzhar*. Əvvəlki əsərin xülasəsidir.

3. Mühamməd ibn Cəfər əl-Qəttani, *Nazmül-mütənasır minəl-hədisil-mütəvatir.* Bu əsər Türk dilinə tərcümə edilmişdir.

## C. AHAD HƏDİSLƏR

Mütəvatir hədisin şərtlərini daşımayan hədislərə ümumi olaraq ahad hədislər deyilir.

125 Əbu Davud, Elm 10.

### 1. Ahad hədis

**Leksik mənası:** “Ahad: أحاد kəlməsi, “bir tək” mənasına gələn əhad أحد kəlməsinin cəmidir. Xəbəri vahid isə tək ravinin rəvayət etdiyi xəbər deməkdir.

**Termin mənası:** Hədis terminalogiyasında mütəvatir hədisin şərtlərini daşımayan hədislərə ahad hədis deyilir.

O halda xəbərlərin böyük əksəriyyəti ahad hədislərdir. Hədis kitablarının əksəriyyətini bu hədislər təşkil etməkdədir.

#### a. Ahad hədisin hökmü

Ahad xəbər nəzəri elm ifadə edir. Yəni ifadə etdiyi elm nəzər və istidlalə, araşdırma və dəyərləndirməyə möhtacdır.

Mütəvatir və ahad hədislərin hər ikisi də səhih hədislər sinifinə daxildir.

Ahad Hədis, hər təbəqədəki (səhabə, tabeun, ətbaut-tabeun...) ravi sayına görə üç qismə ayrılır. Məşhur, Əziz və Qərib.

### 2. Məşhur hədis

**Leksik mənası:** Məşhur kəlməsinin lüğət mənası, yaymaq, elan etmək, bilinmək, tanınmaq mənasına gələn شَهر felinin ismi məfuludur. Ərəb dilində bir şey elan edilib açıqlananda شهرت الامر “hadisəni yaydım” deyilir. Məşhur xəbər də bu mənada açıqlanıb yayıldığı üçün belə adlandırılmışdır.

**Termin mənası:** Təvatür sayına çatmadan, hər təbəqədə ən azı üç və daha çox ravisi olan hədislərə məşhur hədis deyilir. Məsələn; bir hədisi səhabədən ən azı üç, tabeundən üç və ətbaut-tabeundan üç nəfər rəvayət etmişsə, o hədis məşhur hədis qəbul edilir. Məşhur hədislər iki qrupda incələmək olar.

a) Sənəd tətqiqi baxımından məşhur hədislər

b) Şöhrət baxımından məşhur hədislər

Sənəd tətqiqi baxımından məşhur hədislər səhih, həsən və zəif ola bilər.

Səhih olan məşhur hədisə misal olaraq bu hədisi göstərmək olar:

حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ يُوسُفَ قَالَ أَخْبَرَنَا مَالِكٌ عَنْ نَافِعٍ عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَاأَنَّ رَسُولَ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ إِذَا جَاءَ أَحَدُكُمْ الْجُمُعَةَ فَلْيَغْتَسِلْ

Bizə Abdullah ibn Yusif xəbər verdi, dedi ki; bizə Malik ibn Ənəs, Nafidən o da Abdullah ibn Ömərdən rəvayət edərək bildirdi ki, Rəsulullah əleyhissalam belə buyurdu: *"Hər kim cümə namazına gələcəksə, yuyunsun"* [126]. Bu hədisi şərif bir neçə təriqlə həzrət Peyğəmbər əleyhissalamdan nəql edilmişdir.

Həsən dərəcəsində olan məşhur hədisə nümunə olaraq aşağıdakı hədis göstərilə bilər:

حَدَّثَنَا هِشَامُ بْنُ عَمَّارٍ حَدَّثَنَا حَفْصُ بْنُ سُلَيْمَانَ حَدَّثَنَا كَثِيرُ بْنُ شِنْظِيرٍ عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ ,قَالَ رَسُولُ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ طَلَبُ الْعِلْمِ فَرِيضَةٌ عَلَى كُلِّ مُسْلِمٍ وَوَاضِعُ الْعِلْمِ عِنْدَ غَيْرِ أَهْلِهِ كَمُقَلِّدِ الْخَنَازِيرِ الْجَوْهَرَ وَاللُّؤْلُؤَ وَالذَّهَبَ

...Peyğəmbər əleyhissalam buyurdu: *"Elm öyrənmək hər müsəlmana fərzdir. Elmi əhil olmayanlara öyrədən, donuzlara qiymətli daşqaşlardan, mirvari və qızıldan boyunbağı taxmaq istəyən kimidir."*[127]

Mizzi, bu hədisi həsən dərəcəsinə çıxardan sənədlərin olduğunu ifadə etmişdir.

Zəif dərəcəsində olan məşhur hədisə də bu nümunəni göstərmək olar:

126 Buxari, Cümə 2.
127 İbn Macə, Müqəddimə, 17.

جُبِلَتْ القُلُوبُ عَلي مَنْ أَحْسَنَ اليهِ

*"Qəlblər, ona yaxşılıq edənləri sevməyə meyilli olaraq yaradılmışdır."*[128]

Bundan başqa sənədi olsun və ya olmasın, əsli olsun və ya olmasın, xalq arasında məşhur olan bütün hədislərə də məşhur hədis deyilmişdir. Ayrıca məşhur hədislərin fiqh alimləri, üsul alimləri, ədəbiyyatçılar arasında da (sənədi diqqətə alınmadan) şöhrət qazanmış növləri də vardır. Bu hədislər səhih və ya həsən olduğu kimi, uydurma da ola bilər. Məsələn;

مَنْ غَشَّنا فَلَيْسَ مِنّا

*"Bizi aldadan bizdən deyil"* [129] hədisi səhih hədisdir.

لَولاكَ لَولاكَ لَمَا خَلَقْتُ الاَفْلاكَ

*"Sən olmasaydın, sən olmasaydın (Ey Məhəmməd əleyhissalam) kainatı yaratmazdım."* [130] Bu hədis hər nə qədər məşhur olsa da həzrət Məhəmməd əleyhissalama qədər çatan heç bir sağlam sənəd yoxdur. Məhz buna görə də hədis məşhur olsa da uydurma qəbul edilir.

**a. Məşhur hədisin hökmü**

Termin mənasına uyğun olsa da olmasa da, bir hədis üçün məşhur olduğuna görə səhihdir və ya deyildir deyə bilmərik. Çünki məşhur hədislərin arasında səhih, həsən, zəif hətta uydurma hədis də yer ala bilər. Ancaq termin mənasındakı məşhur hədis səhih olduğu halda əziz və qərib hədisdən güclü qəbul edilir.

---

128 Beyhəqi, Şüub əl-imən, II, 37; Suyuti, Tədrib, s. 189
129 Müslim, İman 169.
130 Əcluni, *Kəşful-xəfa,* II, 164. 2123 nömrəli hədis.

**b. Məşhur hədislər haqqında yazılmış əsərlər**

1. Səxavi (vəfatı 902/1496), *əl-Məqasidul-həsənə fi məştəra ələl-əlsinə*

2. Əcluni (vəfatı 1162/1748), *Kəşful-xəfa və muzilul-ilbas fi məştəhəra minəl hədis əla əlsinətin-nas*. Bu əsər 3281 sözü incələyir.

3. İbn Dəyba əş-Şəybani (vəfatı 944/1537), *Təmyizut-təyyib minəl-xabis fi ma yədurru əla əlsinətin-nas minəl hədis.*

**3. Əziz hədis**

**Leksik mənası**: العزيز kəlməsi ya "az və nadir oldu" mənasına gələn عَزَّ- يعِزُّ felindən ya da "qüvvətli və şiddətli oldu" mənasına gələn عَزَّ – يَعَزُّ felinin sifəti müşəbbihəsidir. Əziz xəbər, az və nadir olduğu üçün və ya başqa bir təriqdən də gələrək qüvvət qazandığı üçün belə adlandırılmışdır.

**Termin mənası:** Hər təbəqədə ən azı iki ravi tərəfindən rəvayət edilən hədislərdir. Əslində əziz hədis, bir tək ravi tərəfindən rəvayət edildiyi halda, araşdırmalar nəticəsində bir başqa ravi tərəfindən daha rəvayət edildiyi məlum olan və beləliklə iki ravi tərəfindən rəvayət edilərək qüvvət qazanmış və dəyərli mənasına gələn əziz adını almış hədisdir.

Hər təbəqədə ən az iki ravi olmaq şərti ilə bəzi təbəqələrdə ravi sayısının çox olması hədisi əziz olmaqdan qurtarmaz. Çünki qayda, sənəddə yer alan ravi təbəqələrinin ən azına görə müəyyənləşdirilmişdir.

Əziz hədisə misal olaraq bu rəvayəti verə bilərik:

لَا يُؤمِنُ أحَدُكُمْ حَتّى أكُونَ أحَبَّ إلَيْهِ مِنْ وَالِدِهِ وَ وَلَدِهِ و النَّاسِ أجْمَعِين

*"Heç biriniz, mən ona atasından, anasından və bütün insanlardan daha sevimli olmasam həqiqi mənada iman etmiş sayılmaz."*[131]

Bu hədis Qətadə və Əbdüləziz ibn Süheyb Ənəsdən, Şöbə və Səid Qətadədən, İsmail ibn Üleyyə və Əbdülvaris Əbdüləzizdən və bunların hər birindən də qrup halında insanlar rəvayət etmişdir. Bu sənəd zəncirini belə şəkilləndirə bilərik:




Əziz hədisləri cəm edən müstəqil əsər qələmə alınmamışdır. Bunun səbəbi də əziz hədislərin az və bu cür əsərlərin praktiki faydasının olmamasıdır.

### 4. Qərib hədis

**Leksik mənası:** Qərib الغريب kəlməsi lüğətdə "tək başına yalnız qalan" və ya "yaxınlarından uzaq olan" mənasına gəlir.

**Termin mənası:** Termin olaraq tək ravi tərəfindən rəvayət olunan və ya hər hansı bir təbəqədə ravi sayısı birə düşən hədisə deyilir. Bu hədisə **"Fərd Hədis"** də deyilir.

Bir hədisin səhabə və tabeun təbəqəsində ravi tək isə bu hədisə *fərdi mütləq*, əgər tabeun təbəqəsindən sonrakı təbəqədə ravi təkdirsə buna da *fərdi nisbi* deyilir. Məsələn:

حَدَّثَنَا يَحْيَى بْنُ يَحْيَى التَّمِيمِيُّ أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ بِلَالٍ عَنْ عَبْدِ اللَّهِ بْنِ دِينَارٍ عَنْ ابْنِ عُمَرَ أَنَّ رَسُولَ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى عَنْ بَيْعِ الْوَلَاءِ وَعَنْ هِبَتِهِ

131 Buxari, İman, 8.

İbn Ömərdən belə rəvayət edilmişdir: *"Peyğəmbər əleyhissalam vəlanın (azad edilmiş kölə) vəlayət haqqının satılmasını və hibə edilməsini qadağan etdi."*[132]

Bu hədisi İbn Ömərdən rəvayət edən Abdullah ibn Dinar rəvayətində tək qalıb. Tabeun nəslindən olduğuna görə də hədis *fərdi mütləq*dir.

حدثنا علي بن عبد الله الفرغاني طغك بمصر حدثنا الحسن بن عثمان أبو حسان الزيادي حدثنا يزيد بن زريع عن خالد الحذاء عن أبي قلابة عن عبد الله بن محيريز عن أم الدرداء عَنْ أبي الدَّرْدَاءِ رَضِيَ اللهُ عَنْهُ عَنْ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ: مَا وُضِعَ فِي الْمِيزَانِ أَرْجَحُ مِنْ حُسْنِ الْخُلُقِ.

*"Əməl tərəzisinə gözəl əxlaqdan daha ağır heç bir əməl qoyulmayıibn"*[133]

Bu hədisi Xalid əl-Həzzadan ancaq Yezid ibn Zürey rəvayət etmişdir. Məhz buna görə də Xalidə nisbətlə hədis fərd olduğuna görə *fərdi nisbi* qəbul edilmişdir.

### a. Qərib hədisin hökmü

Ümumiyyətlə qərib hədislərə alimlər sağlam hədis nəzəri ilə baxmamışlar. Ancaq qəbul şərtlərini cəm edən fərd hədislər də hökm ifadə edir və hüccə olaraq qəbul edilir.

### b. Məşhur hədislərlə əlaqəli əsərlər

1. Bəzzar (vəfatı 292/905), Müsnəd

2. Təbərani (vəfatı 360/971), Möcəm əl-kəbir, Möcəm əl- əvsat, Möcəm əs-Səğir.

132 Müslim, əl-Itq, 16.
133 Təbərani, Möcəm əl-Səğir, I, 199.

Bundan əlavə Tirmizinin Sünənində də qərib hədislərə sıx-sıx təsadüf etmək mümkündür. Bu növ hədislərdən sonra müəllif qərib olduğunu özü ifadə edir.

## IV. HÖKM BAXIMINDAN HƏDİSİN NÖVLƏRİ

Alimlər hədisləri dəlil qəbul edilib-edilməməsi baxımından məqbul (qəbul edilən) və mərdud (qəbul edilməyən) olmaq üzrə iki qrupa ayırıblar.

Məqbul hədislər də öz aralarında səhih və həsən olaraq ikiyə ayrılır.

### A. SƏHİH HƏDİS

**Leksik mənası:** Səhih sözü lüğətdə, sağlam, düzgün, möhkəm mənalarına gəlir.

**Termin mənası:** Ədalət və zəbt sahibi ravilərin kəsiksiz (müttəsil) bir sənədlə bir-birlərindən rəvayət etdikəri şaz və illəli olmayan hədisə səhih hədis deyilir.

Bu tərifi misalla bərabər belə açıqlamaq olar:

**1. Səhih hədislərin raviləri adildir.** Belə ki, hədisin sənəddəki ravilərinin hər biri, müsəlman, həddi büluğa çatmış, ağıllı, fasiq və şəxsiyyətsiz olmayan bir şəxsdir.

**2. Səhih hədislərin raviləri zabitdir.** Zəbt, ravinin eşitdiyi hədisi uzun zaman sonra belə istədiyi vaxtda xatırlaya biləcək səviyyədə əzbərləmə xüsusiyyətinə sahib olmağa deyilir. Bir ravinin zəbti, etibarlı ravilərin rəvayətlərinə zidd olmaması ilə bilinir. Əgər ziddiyyət cüzi isə bu zəbtə mane olmaz. Bu iki xüsusiyyətə (ədalət və zəbt) malik ravilərə hədis elmində **“siqa ravi”** (الثقة) deyilir.

**3. Səhih hədisin sənədi müttəsildir**. Sənədin müttəsil olması demək, isnadı meydana gətirən ravilərin, hədisi əvvəlki ravidən şəxsən almış olması və bu şəkildə o sənədin həzrət Peyğəmbər əleyhissalama qədər kəsintisiz olaraq çatması deməkdir.

**4. Səhih hədis şaz deyildir.** Şaz, Siqa ravinin, özündən daha güvənli və ya eyni səviyyədə güvənli ravilərin rəvayətlərinə zidd hədis rəvayət etməsidir. Demək ki, səhih hədisi rəvayət edən ravi özündən güclü və ya eyni səviyyədə olan ravilərin rəvayətinə zidd hədis rəvayət etməyən biri olmalıdır.

**5. Səhih hədis müəlləl deyildir.** İllə hədisin sağlamlığına xələl gətirəcək gizli qüsur deməkdir. Odur ki, Səhih hədis xarici görünüm baxımından səhih görünsə də mütəxəssislər tərəfindən bilinəcək gizli qüsura malik olmamlıdır.

Həqiqətən belə "ağır" şərtlərin hamısı bir yerə cəm edilməzsə o hədis, səhih hədis olaraq qəbul edilmir. Bu şərtlərdən biri əksik olarsa hədis səhihlikdən çıxar.

İndi Səhih hədisin bu xüsusiyyətlərini bir misal üzərində incələyək:

حَدَّثَنَا الْحَمَيْدِيُّ قَالَ حَدَّثَنَا سُفْيَانُ قَالَ حَدَّثَنَا يَحْيَي بْنُ سَعِيدِ الْاَنْصَارِيّ قَالَ اَخْبَرَنِي مُحَمَّدُ بْنُ اِبْرَاهِيمَ التَّيْمِيَّ اَنَّهُ سَمِعَ عَلْقَمَةَ بْنِ وَ قَّاصِ اللَّيْثِيّ يَقُولُ سَمِعْتُ عُمَرَبْنِ الْخَطَّابِ رَضِيَ اللّٰهُ عَنْهُ عَلَي الْمِنْبَرِ قَالَ: سَمِعْتُ رَسُولَ اللهِصلَّي الله علَيْهِ وَ سَلَّمَ يَقُولُ: اِنَّمَا الْاَعْمَالُ بِالنِّيَّاتِ وَ اِنَّمَا لِكُلِّ امْرِئٍ مَانَوَي فَمَنْ كَانَتْ هِجْرَتُهُ اِلَي اللّٰهِ وَ رَسُولِهِ فَهِجْرَتُهُ اِلَيَ اللّٰهِ وَ رَسُولِهِ وَ مَنْ كَانَتْ هِجْرَتُهُ اِلَي دُنْيَا يُصِيبُهَا اَوْ اِلَي اِمْرَأَةٍ يَنْكِحُهَا فَهِجْرَتُهُ اِلَيَ مَا هَاجَرَ اِلَيْهِ.

Bizə əl-Huməydi hədis olaraq söylədi və dedi ki: Bizə Süfyan hədis olaraq nəql edib, "bizə Yəhya ibn Səid əl-Ənsari xəbər verdi" dedi. (Yəhya); Məhəmməd ibn İbrahim ət-Təymi, mənə Əlqamə

ibn Vəqqas əl-Leysini belə söyləyərkən eşitdiyini xəbər verdi."-dedi. (Əlqamə); "mən, Ömər ibn Xəttabı minbərdə bunları söylərkən eşitdim: **"Həzrət Peyğəmbər əleyhissalamdan eşitdim, belə deyirdi:**

*"Əməllər ancaq niyyətlərə görədir. Hər kimsənin niyyəti nə isə, o da onun əlinə keçəcək. Artıq kim Allah Təala və Rəsulu üçün hicrət edərsə, hicrəti Allah Təala və Rəsulu üçün olar. Hər kim də əldə edəcəyi bir dünya (mənfəəti) və ya evlənəcəyi bir qadın üçün hicrət edərsə, onun hicrəti də hicrət etdiyi şeyə görədir."*'[134]

Bu hədis səhihdir. Çünki, hədisin sənəd və mətni ayrı-ayrı incələnərsə görəcəyik ki, hədis, əl-Huməydi, Süfyan, Yəhya ibn Səid əl-Ənsari, Məhəmməd ibn İbrahim ət-Təymi, Əlqamə ibn Vəqqas əl-Leysi və həzrət Ömər (r) tərəfindən rəvayət edilmişdir. Bunların hamısı da ədalət və zəbt yönündən siqa ravilədir. Hamısı da hədisi: "bizə təhdis etdi, eşitdim, dedi ki, mənə xəbər verdi..." kimi bir-birindən qəti rəvayəti bildirən ləfzlər işlədərək rəvayət etmişlər. Heç birisində tənqid ediləcək bir qüsur (illə) yoxdur. Həzrət Peyğəmbər əleyhissalamın bu rəvayətinə tərs olan başqa bir rəvayət də yoxdur.

Hədislərin səhhəti üçün yuxarda saydığımız ümumi şərtlərdən başqa alimlər aşağıdakı xüsusiyyətləri də əsas almışlar. Belə ki, səhih hədis:

1. Qurani-Kərimə uyğundur.

2. İslamın prinsip və əsaslarına uyğundur.

3. Məntiq prinsiplərinə uyğundur.

4. Müsbət elmin məlumatlarına tərs deyildir.

134 Buxari, Bədül-vəhy 1, İman 41, Nikah 5, Mənakıbul-ənsar 45, İtk 6 ; Müslim, İmarət 155.

5. Elmi həqiqətlərə və tarixi hadisələrə tərs deyildir.

6. Mətn və ifadəsi gün işığı kimi parlaqdır. Elə ki, insanın ağlına *"Bunu həzrət Peyğəmbər (səs) söyləyər mi?"* kimi şübhə və tərəddüd gəlməyəcək şəkildə açıqdır.

7. Cəmiyyətin əxlaq qaydalarına uyğundur.

8. Mötəbər və sağlam qaynaqlarda yer alır.

Bu xüsusiyyətləri daşıyan hədislər -başqa bir qüsuru yoxsa- ilk baxışda səhih və həzrət Peyğəmbər əleyhissalama aid qəbul edilir.

### 1. Səhih hədisin qisimləri

Səhih hədislər, **səhih lizatihi** (öz-özünə səhih) və **səhih liğeyrihi** (başqa səbəblə səhih) olmaq üzrə iki qismə ayrılır.

Yuxarıda sayılan bütün şərtləri daşıyan hədislərə **səhih lizatihi** deyilir.

Bəzi raviləri zəbt yönündən tənqid edilmiş, ancaq başqa bir müttəsil isnadla dəstəklənən hədislərə də **səhih liğeyrihi** deyilir.




Səhih lizatihiyə misal verildiyi üçün burada sadəcə səhih liğeyrihiyə örnək veriləcəkdir.

حدثنا أبو كريب حدثنا عبده بن سليمان عن محمد بن عمرو عن ابي سلمة عن ابي هريرة قال قال رسول الله صلَّي الله علَيْهِ وَ سَلَّمَ لَوْ لَا أَنْ أَشُقَّ عَلَي أُمَتِي لأَمَرْتُهُمْ بِالسِّوَاكِ عِندَ كُلِّ صَلَاةِ

Bizə Əbu Qureyb rəvayət edib dedi ki, bizə Əbdə ibn Süleyman, Məhəmməd ibn Əmrdən, o, Əbu Sələmədən, o da Əbu Hüreyrədən rəvayət etdi ki, o belə demişdi, Rəsulullah əleyhissalam buyurdu: *"Əgər ümmətim üçün çətin olmayacağını bilsəydim, hər namaz vaxtında misvakdan istifadə etməyi əmr edərdim*.[135]

Bu hədisin sənədindəki Məhəmməd ibn Əmrin hafizəsi zəif olduğu rəvayət edilmişdir. Buna görə də hədis həsəndir. Ancaq hədisi başqa ravilərdən də rəvayət edilmişdir:

حدثنا عبد الله بن يوسف قال اخبرنا مالك عن ابي الزناد عن الاعرج عن ابي هريرة ان رسول الله
صلَّي الله علَيْهِ وَ سَلَّم لَوْ لَا أَنْ أَشُقَّ عَلَي أُمَتِي لأَمَرْتُهُمْ بِالسِّوَاكِ عِندَ كُلِّ صَلَاةِ

Bizə Abdullah ibn Yusif rəvayət edib dedi ki, bizə Malik, Əbuz-Zinaddan, o, əl-Əracdan, o da Əbu Hüreyrədən xəbər verdi ki,...[136]

Bu rəvayət Məhəmməd ibn Əmrin burada xətaya düşmə ehtimalını aradan qaldırmış və hədisini də **səhih liğeyrihi** dərəcəsinə yüksəltmişdir.

Sadəcə səhih hədisləri cəm etmək məqsədilə bir çox kitab yazılmışdır. Bunlardan ən məşhurları Buxari və Müslimin *"əl-Cəmius-səhih"* adlı əsərləridir. Bu əsərlərə birlikdə "Səhiheyn" adı verilir. Bu iki kitabda yer alan hədisə müttəfəqun əleyh (ittifaq edilmiş hədis) deyilir.[137]

135 Tirmizi, Təharət, 18.
136 Buxari, Cuma, 8.
137 Bu əsərlər haqqında geniş məlumat "hədis ədəbiyyatı" bölməsində veriləcəkdir.

## 2. Səhih hədisin dərəcələri

Hədis elminin iki böyük imamı olan Buxari və Müslim, kitablarına alacaqları hədislərin tamamən səhih olması üçün fövqəladə əmək verərək, səhihlik şərtlərinə son dərəcə riayət etmişlər.

Səhih hədislərin ən gözəl və mötəbər sayılan dərəcələndirilməsi, Buxari və Müslimə görə olanıdır. Bu dərəcələndirməyə görə səhih hədislər öz aralarında yeddi qrupa ayrılır:

**1) Müttəfəqun əleyh:** Buxari və Müslimin ittifaqla rəvayət edib səhihlərinə (hədis kitablarına) aldıqları hədislərdir. Bu növ hədisləri Məhəmməd Fuad Əbdülbaki **"əl-Lülüü vəl-Mərcan fimə** adlı bir kitabda toplamışdır. Buradakı hədis sayısı 1906-dır.

**2) Mənfəradə bihi Buxari:** Yalnız Buxarinin rəvayət etdiği hədislər.

**3) Mənfəradə bihi Müslim:** Müslimin səhihinə aldığı, Buxarinin almadığı hədislər.

**4) Ma alə şartihima:** Buxari və Müslimin səhihlik şərtlərinə uyğun olan, ancaq kitablarına almadıqları hədislər. Bunları əl-Hakim "**əl-Müstədrək"** adlı əsərində cəm etmişdir.

**5) Ma alə şərti Buxari:** Sadəcə Buxarinin səhihlik şərtinə uyğun gələn hədislər.

**6) Ma alə şərti Müslim:** Sadəcə Müslimin səhihlik şərtlərinə uyğun gələn hədislər.

**7) Səhih ində ğeyrihima:** Buxari və Müslimdən başqa hədisşünaslara görə səhih sayılan hədislər.

### 3. Səhih hədisin hökmü

Səhih hədislə əməl etmək vacibdir. Şeyxan (Buxari və Müslim) tərəfindən rəvayət olunmasa belə səhih hədislərlə əməl etməyin vacib olduğunda bütün İslam alimləri ittifaq etmişlər. Səhih hədisin ravilərinin tək bir nəfər olması ilə təvatür dərəcəsinə çatacaq qədər ravilərin olması arasında heç bir fərq yoxdur.

### 4. Səhih hədislə əlaqəli bəzi terminlər

Hədis alimləri səhih hədislərlə əlaqəli istifadə etdiyi bəzi terminləri bilmək, səhih hədisləri anlamak üçün labüddür.

**CEYYİD** (الجَيِّد): Səhih termininin sinonimi olaraq istifadə olunur. Hədis kitablarında (هٰذَا حَديثٌ جَيدٌ حَسَنٌ) ifadəsi işlədilir. Burada ceyyid kəlməsi səhih mənasında işlədilmişdir.

**ƏSAHHUL-ƏSANİD** (اصَحُّ الاسَانِد): İsnadların ən qüvvətlisi, ən səhihi, ən doğrusu kimi mənalara gələn bu termin, səhih isnadlardan birinin seçilməsini ifadə edir. Bu seçim sənədi meydana gətirən ravilərin xüsusiyyətləri diqqətə alınaraq edilmişdir. Hansı sənədin əsahhul-əsanid olduğu barəsində alimlər ixtilaf etmişdir. Məsələn, Əhməd ibn Hənbələ görə ən güclü sənəd Zöhri-Salim-Abdullah ibn Ömər-Həzrət Peyğəmbərdir. Buxariyə görə isə əsahhul-əsanid Malik-Nafi-İbn Ömər-Həzrət Peyğəmbərdir. Əgər bu son sənədin baş tərəfində Əhməd ibn Hənbəl-Şafei yer alırsa bu sənədə "Silsilətüz-zəhəb" yəni qızıl silsilə deyilmişdir.

### 5. Səhih hədislə əlaqəli əsərlər

Sadəcə səhih hədisləri cəm etmək məqsədi ilə yazılan əsərlərin tacı İmam Buxari və İmam Müslimin Camius-Səhih adlı əsərləridir. Bunlardan başqa İbn Hüzeymə (vəfatı 311/923) və İbn Hibbanın (vəfatı 354/965) Səhih adlı əsərləri də önəmli səhih hədis mənbələri olaraq qəbul edilir. Ayrıca Kütübü-Sittə deyə məşhur

olan altı səhih hədis toplusunun digər əsərləri olan Tirmizi, Əbu Davud, Nəsai və İbn Macənin Sünən adlı əsərlər də səhih hədis qaynaqları olaraq məşhurdur.

Günümüzə qədər hələlik bütün səhih hədisləri bir yerə cəm edən müstəqil bir əsər qələmə alınmayıibn

## B. HƏSƏN HƏDİS

**Leksik mənası:** Həsən kəlməsi lüğətdə "gözəl, xoş" mənalarına gəlir. الحُسْن kəlməsinin sifəti müşəbbəhəsidir.

**Termin mənası:** Tərifi haqqında müxtəlif görüşlər olmaqla yanaşı, ən çox qəbul edilən tərif belədir: Ədalət şərtini daşımaqla yanaşı zəbt sifəti yönündən səhih hədis ravilərinin dərəcələrinə çatmayan ravilərin, kəsiksiz isnadla rəvayət etdikləri şaz və illəsiz hədislərə həsənn hədis deyilir.

Həsən hədisin səhih hədisdən ayıran xüsusiyyət, ravisinin zəbt xüsusiyyətinin mükəmməl olmamasıdır.

### 1. Həsən hədisin qisimləri

Həsən hədislər də Səhih hədislər kimi iki qismə ayrılırlar:

**Həsən lizatihi** (Öz-özünə həsən)

**Həsən liğeyrihi** (Başqa səbəblə həsən)

**a. Həsən lizatihi:** Yuxarda tərifini verdiyimiz həsən hədis həsən lizatihi həsəndir. Sadəcə həsən hədis deyildikdə buradakı məqsəd həsən lizatihidir.

Həsən lizatihi, ləfizləri bənzər başqa bir hədis tərəfindən dəstəklənərsə, səhih liğeyrihi dərəcəsinə çıxar.

Həsən lizatihiyə misal;

قال احمد: حَدَّثَنَا يَحْيَى بْنِ سَعِيدِ عن بَهْزُ بْنُ حَكِيمٍ قَالَ: حَدَّثَنِي اَبِي عَنْ جَدِّى قَالَ: قُلْتُ يَا رَسُولَ اللهِ مَنْ اَبَرُّ ؟ قَالَ: اُمَّكَ, قُلْتُ ثُمَّ مَنْ؟ قَالَ: اُمَّكَ قُلْتُ: ثُمَّ مَنْ؟ قَالَ : اُمَّكَ قُلْتُ ثُمَّ مَنْ؟ قَالَ: ثُمَّ اَبَاكَ ثُمَّ اْلاَقْرَبَ فَاْلاَقْرَبَ

"Əhməd ibn Hənbəl dedi ki, bizə Yəhyə ibn Səid Behz ibn Hakimdən hədis olaraq rəvayət etdi və dedi ki: mənə atam (Hakim), babamdan nəql etdiyinə görə babam belə demişdi: *"Ya Rəsuləllah! dedim; Kim (hörmət və yaxşılığa) daha layiqdir?"*

Rəsulullah əleyhissalam da "*Anan*"-buyurdu.

*"Sonra kim?"*-dedim, Rəsulullah da yenə,

"*Anandır*"-dedi,

"*Sonra kim?*"-dedim, yenə "*Anandır*"-dedi.

*"Daha sonra kim?"*-dedim,

*"Sonra atan, daha sonra dərəcə dərəcə qohumlarındır."*[138]-dedi.

Bu hədisin sənədi müttəsildir, eyni zamanda şəz də deyil. Sağlamlığını zədələyəcək hər hansı illə də müəyyən edilməyiibn Hədisi həsən dərəcəsinə salan ravilərdən Bəhz ibn Həkimdir. Çünki, hədisçilərə görə o, siqa olmasına baxmayaraq əzbər yöndən tənqid edilmişdir.

**b. Həsən liğeyrihi** isə əslində ravinin bilinməməsi kimi bir qüsur və ya isnadında məstur (gizli, naməlum) bir şəxs olması səbəbi ilə zəif olduğu halda ləfiz və məna baxımından başqa rəvayətlərlə dəstəklənərsə bu hədis həsən liğeyrihi dərəcəsinə yüksəlmiş olar.

138 Əbu Davud, Ədəb 120; Tirmizi, Birr 1; Əhməd ibn Hənbəl, IV, 342.

Həsən liğeyrihi zəif hədisə çox yaxındır. Fərq, özünü dəstəkləyən bir və ya bir neçə rəvayətin olmasıdır.

Bunu bir misalda görək:

عَنْ عَاصِمِ بْنِ عُبَيْدِ اللهِ عَنْ عَبْدِ اللهِ بْنِ عَامِرِ بْنِ رَبِيعَةِ عَنْ اَبِيهِ اَنَّ اِمْرَاَةَ مِنْ بَنِى فَزَارًا تَزَوَّجَتْ عَلَى نَعْلَيْنِ فَقَالَ رَسُولُ اللهِصَلَّي اللهُ عليْهِ وَ سَلَّمَ اَرَضِيت مِنْ نَفْسِكِ وَ مَالِكِ بِنَعْلَيْنِ؟ قَالَ: نَعَمْ فَاجَازَ.

Bəni Fəzarə qəbiləsindən bir qadın bir cüt ayaqqabı (mehir) qarşılığı evlənmişdir. Bunun üzərinə həzrət Peyğəmbər (səs) qadına; *"Özünü və varlığını bir cüt ayaqqabı qarşılığında nikahlamağa razı oldunmu?"*-deyə soruşdu. Qadın: *"Bəli razı oldum"*-dedi. Həzrət Peyğəmbər əleyhissalam də bu evliliyə icazə verdi.[139]

Bu hədisi Sünən əsərində rəvayət edən Tirmizi, hədisi qeyd etdikdən sonra belə deyir: "Bu mövzuda həzrət Ömər, Əbu Hüreyrə, həzrət Aişə və digər bəzi səhabələrin də rəvayətləri mövcuddur. İmam Süyuti isə bu rəvayət haqqında belə deyir: "Asım (ibn Ubeydullah), suil-hifz, yəni əzbər qabiliyyəti zəif olması baxımından zəif bir ravidir. Ancaq hədis başqa təriqlərlə də rəvayət edildiyi üçün Tirmizi bu hədisi həsən saymışdır."[140]

Deməк ki, bu hədis ravilərdən birisi zəif olduğu halda başqa bir rəvayətlə dəstəkləndiyinə görə həsən liğeyrihi dərəcəsinə yüksəlmişdir.

Əgər səhih və həsən terminləri xüsusilə sənəd üçün işlədilmişsə, sadəcə sənədin səhih və ya həsən olduğunu göstərir. Ancaq mətnə və ya isnada aid olduğu bildirilmədən söylənən "Bu səhih bir hədisdir və ya həsən bir hədisdir" kimi bir hökm həm sənədə həm də mətnə aiddir.

139 Tirmizi, Nikah, 21.
140 Süyuti,*Tədrib ər-Ravi,* I, 176.

### 2. Həsən hədislə əməl etmənin hökmü

Hər nə qədər dərəcə baxımından səhih hədisdən aşağıda olsa da, hər iki növ həsən hədislər, bütün fiqh alimlərinə görə hökm çıxarma və əməl etmə xüsusunda səhih hədislər kimidir. Buna görə də Hakim əl-Neysaburi və İbn Hibban kimi bəzi hədisşünaslar öz əsərlərində həsən hədisləri də səhih hədislər sinfinə daxil etmişlər. Ancaq aralarında "təaruz" (ziddiyyət) olarsa səhih hədislərə üstünlük verilir.

Həsən hədislər daha çox Tirmizi, Əbu Davud, Darəqutni və ən-Nəsainin Sünənlərində vardır. İmam Bəğavi, *Məsabihus-Sünnə* adlı əsərində müəyyən mövzulardakı hədisləri sihəh (səhih hədislər) və hisan (həsən hədislər) başlığı altında qeyd edir. Hisan başlığı altında verilən hədislər, haqqında həsən hökmü verilən hədislərdir.[141]

### 3. Həsən hədislə əlaqəli bəzi terminlər

**Həsənul-isnad:** Hədis alimləri tərəfindən əksərən istifadə etdikləri bu termin, bir hədisin sadəcə isnadının həsən olduğunu göstərir. Ayrıca mətninin həsən olmasına ehtiyac yoxdur.

**Hadisun-həsənun:** Bu termin hədisin həm sənəd, həm də mətn baxımından həsən olduğunu göstərir. Həsənul-hədis termini ilə həsənliyi göstərilən hədisdən üstün dərəcədədir.

**Müşəbbəh:** Bu termindən də həsən hədisi ifadə etmək üçün istifadə edilmişdir.

141 Bu əsərlər haqqında geniş məlumat "hədis ədəbiyyatı" bölməsində veriləcəkdir.

## C. ZƏİF HƏDİS

**Leksik mənası:** Zəif kəlməsi lüğətdə güclünün ziddi mənasında işlənir. Bu zəiflik maddi və ya mənəvi ola bilər. Ancaq buradakı zəiflik mənəvi zəiflikdir.

**Termin mənası:** Hədis termini olaraq zəif hədis, səhih və həsən hədisin şərtlərindən birini və ya bir neçəsini daşımayan hədisdir.

Zəif hədisin əlamətlərini belə sıralaya bilərik:

1) Hədisin raviləri adil deyildir.

2) Hədisin raviləri zabit (hafizəsi qüvvətli) deyildir.

3) Hədisin isnadı müttəsil deyildir belə ki, hədisin sənədindəki ravilərdən biri və ya bir neçəsi alınmışdır.

4) Hədisin ravilərindən biri və ya bir neçəsi məchuldur, yəni bu ravilərin ədalət və zəbt baxımından vəziyyətləri bilinmir.

5) Hədis şəzdir, yəni səhih və möhkəm rəvayətlərə ziddir.

6) Hədis müəlləldir, yəni gizli bir qüsuru vardır və onun bu qüsuru da sübut edilib açığa çıxarılmışdır.

7) Sözlərində, Peyğəmbərimiz əleyhissalamın sözlərindəki açıqlıq və ahəng yoxdur.

8) Ahad xəbərdir. Yəni bir çox kimsənin bilməsi lazım olan bir məsələni tək bir ravi xəbər vermişdir.

9) Başqalarına aid sözlər, Peyğəmbərimi əleyhissalamın sözlərinə qarışdırılmış və Peyğəmbər əleyhissalama aidmiş kimi göstərilmişdir.

Bu əlamətlərdən birini, və ya bir neçəsini daşıyan hədis, zəif hədisdir.

Bu şərtlərdən birdən çoxu nöqsan olarsa, zəiflik daha da şiddətli olar. Beləcə zəif hədisin dərəcələri də fərqlilik ərz edir. Buna görə də zəif hədislərin dərəcələri 49 dan 510 qədər fərqli rəqəmlərlə ifadə edilmişdir. Ancaq bunlardan çoxu nəzəridir.

Zəif hədis növlərindən 15 dənəsi xüsusi terminlərlə ifadə edilərək tanıdılmışdır. Bunlar, **Müəlləq, Mürsəl, Mudal, Münqəti, Müdəlləs, Müəlləl, Şaz, Münkər, Mövzu, Mətruk, Müdrəc, Məqlub, Müzdərib, Müsəhhəf və Mühərrəfdir.** Bunlar haqqında aşağıda qısa məlumat veriləcəkdir.

Zəif hədisə örnək olaraq bu hədisi qeyd etmək olar:

حَدَثَنَا أَبُو أَحْمَدَ الْمَرَّارُ بْنُ حَمُّويَةَ حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُصَفَّى حَدَّثَنَا بَقِيَّةُ بْنُ الْوَلِيدِ عَنْ ثَوْرِ بْنِ يَزِيدَ عَنْ خَالِدِ بْنِ مَعْدَانَ عَنْ أَبِي أُمَامَةَ عَنْ النَّبِيِّ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ مَنْ قَامَ لَيْلَتَيْ الْعِيدَيْنِ مُحْتَسِبًا لِلَّهِ لَمْ يَمُتْ قَلْبُهُ يَوْمَ تَمُوتُ الْقُلُوبُ

*"Hər kim savabın ancaq Allahdan gözləyərək Ramazan və Qurban bayramı gecələrini ibadətlə məşğul olarsa, bütün qəlblərin öldüyü gündə onun qəlbi ölməz"*[142]

Bu hədisin isnadındakı Bəqiyyə ibn Vəlid zəif olduğuna görə hədis zəif sayılmışdır.

### 1. Zəif hədislə əməl etməyin və rəvayət etməyin hökmü

Zəif hədislə əməl etmə məsələsində alimlər ixtilaf etmişlər. Ancaq zəif hədislərlə əməl edilib-edilməməsi məsələsini daha yaxşı anlamaq üçün zəif hədisin tarixi seyrinə nəzər yetirmək lazımdır. Belə ki, İmam Tirmiziyə qədər hədislər ümumiyyətlə səhih və səqim (zəif) kimi iki qrupa ayrılırdılar. Zəif hədislər də tərk edilmiş və tərk edilməmiş olaraq iki qrupa ayrılırdı. Tirmizidən sonra isə səhih və zəif hədis arasında bir də həsən hədis termini daxil

142 İbn Macə, Siyam, 68.

oldu. Tərk edilməyən zəif hədislər həsən termini ilə zəif hədis qrupundan ayrılmış oldu. Elə isə Tirmizidən əvvəl yaşamış alimin dilindəki zəif hədis termininin həsən hədis terminini də əhatə etdiyini unutmamaq lazımdır.

Alimlərin zəif hədislə əməl edilməsi barəsindəki görüşləri belə sıralamaq olar:

1) Əhməd ibn Hənbəl və Əbu Davud kimi bəzi hədis imamlarına görə səhih hədisin olmadığı zaman, halal, haram, fərz və vacib kimi mövzularda da zəif hədislərlə əməl etmək olar. Ancaq hədis çox zəif olmamalıdır. Bu alimlərə görə zəif hədis rəydən (qiyas yoluyla ictihad) daha etimadlıdır.

2) Haram və halal xaricində müstəhəb və məkruh, gözəl əməllərə yönlədirmə və pis əməllərdən uzaqlaşdırmaq (tərğib və tərhib) üçün zəif hədislərlə əməl edilə bilər. Hədis, fiqh və əxlaq alimlərinin əksəriyyətinin görüşləri belədir. Bunlara görə bu mövzularda zəif hədislərdən istifadə edə bilmək üçün, hədislərin çox zəif olmaması, ravilərin yalançı (كذاب) və ya yalançılıqla ettiham olunmuş (المتهم بالكذب) olmaması, cox xəta etməmiş olması şərtdir. Bundan başqa hədisin məzmununa uyğun ayə və ya səhih bir hədis olmalıdır. Ayə və hədislərin hökmünə zidd hökm ifadə etməməli, hədisə həzrət Peyğəmbərə aid olduğu düşüncəsilə baxılmamalıdır. Bu cür hədisləri rəvayət edərkən də, "həzrət Peyğəmbər belə buyurdu" kimi qəti ifadələrdən istifadə etməməli, "rəvayət olunur ki, həzrət Peyğəmbərdən nəql olunur ki" kimi ehtiyat ifadələrindən istifadə olunmalıdır.

3) Nə halal və haramla əlaqəli mövzularda, nə də əməllərin fəzilətləri ilə əlaqəli mövzularda zəif hədislə əməl etmək caiz deyil. Yəhyə ibn Məin, İbn Həzm və Əbu Bəkir ibn əl-Ərəbi kimi alimlər bu görüşü müdafiə edirlər.

Nəticə etibariylə zəif hədislə əməl etməyi qəti surətdə qadağan edənlərin görüşü zəif bir görüşdür. Hər nə şəkildə olursa olsun zəif hədislə əməl etməyi uyğun görənlərin görüşü də işi tamamən başı boş buraxmaqdır. Müəyyən qisimlərə ayırıb bəlli şərtlərə əsasən əməl ediləbiləcəyini ifadə edənlərin görüşü isə orta və doğru görüşdür.[143]

### 2. Zəif Hədisin Mənbələri

Hədis alimləri zəif hədisləri cəm edən və zəiflik səbəblərini açıqlayan əsərlər yazmışlar. Bəzi mühəddislər zəif raviləri əsas götürən kitablarına o ravilərin rəvayət etdikləri zəif hədislərdən nümunələr verərək bu hədislər in zəif olduğunu anlatmaq istəmişlər. Məsələn, İbn Hibbanın *"Kitab əl-məcruhin"*, Zəhəbinin *"Mizan əl-etidal"* adlı əsərlərində çox sayıda zəif hədislər bu şəkildə rəvayət edilmişdir. Ayrıca mötəbər hədis kitablarında yer almayan və sadəcə Uqaylinin *"əz-Züəfa"* İbn Ədinin *"əl-Kamil"* Həkim ət-Tirmizinin *"Nəvadirul-Üsul"* kimi kitablardakı hədislər də alimlər tərəfindən zəif hədislər olaraq qəbul edilmişdir.

### 3. Zəif Hədisin növləri

Qeyd etdiyimiz kimi zəif hədis bir neçə növə bölünərək incələnmişdir. Bu baxımdan ümumi olaraq zəif hədisləri iki əsasa görə sıralaya bilərik:

a) Sənədindəki inqitaya (kəsiklik) görə zəif hədislər

b) Ravisindəki cərh (tənqid) ediləcək xüsusa görə zəif hədislər

#### a. Sənədindəki inqitaya gərə zəif hədislər

İnqita, istəyərək və ya istəməyərək, açıq və ya gizli, sənədin başından, ortasından və ya sonundan ən azı bir ravinin düşməsi

143 Ləknəvi, *əl-Əcvibət əl-fadilə,* s. 58.

surətiylə isnad zincirinin kəsik (qopuq) hala gəlməsi deməkdir. Əgər isnadda belə bir inqita varsa və sənədindəki bütün raviləri siqa olsalar belə sırf bu inqitaya görə mətn rədd edilir.

İnqita səbəbilə zəif hədis növləri bunlardır: **Mürsəl, Münqəti, Mudal, Müəlləq, Müdəlləs.**

### 1) Mürsəl hədis

**Leksik mənası:** Mürsəl kəlməsi lüğətdə "azad etmək, sərbəst buraxmaq" mənaları ifadə edən ارسل felinin ismi məfuludur. Mursil adətən, sənədi sərbəst bıraxmış, onun tanınan bir ravi ilə bağlamamış sayılır.

**Termin mənası:** Təbeinin, isnadda səhabəni qeyd etmədən bilavasitə Peyğəmbər əleyhissalamdan eşitmiş kimi rəvayət etdikləri hədislərə **mürsəl hədis** deyilir.

Mürsəl hədislər, kiçik və ya böyük tabeinin "Rəsulullah belə dedi" və ya "belə etdi" və ya "hüzurunda belə edildi" deməsi ilə meydana gəlir. Belə ki, tabiun səhabədən sonra gələn nəsildir. Bunlar, Peyğəmbər əleyhissalamı görmdiklərinə görə bilavasitə onun özündən hədis eşitmələri mümkün deyil. Digər ifadəylə desək tabeilər rəvayət etdikləri hədisləri mütləq səhabədən eşidiblər. Belə olduğu halda rəvayət edərkən, o hədisi dinlədikləri səhabəni anmadan –sanki Rəsulullahdan eşitmiş kimi- قال رسول الله "Rəsulullah buyurdu ki,…"-deyə rəvayət etmələri, -hədisi Peyğəmbər əleyhissalamdan rəvayət edən səhabi göstərilmədiyi üçün- hədisin isnadında, yəni ravilər arasında qırılma meydana gəlir. Buna görə də belə isnadla rəvayət edilən hədislər zəif qəbul edilmişdir.

Mürsəl hədisə örnək olaraq aşağıdakı rəvayəti gəstərə bilərik:

قَالَ الشَافِعِيُّ : اَخْبَرَنَا مَلِكٌ عَنْ زَيْدِ بْنِ اَسْلَمَ عَنْ سَعِيدِ بْنِ الْمُسيِّبِ : اَنَّ رَسُولَ اللهِ صَلَّي اللهُ عَلَيْهِ وَ سَلَّمَ نَهى عَنْ بَيْعِ الَّحْمِ بالْحَيَوَانِ.

İmam Şafei belə dedi: Bizə, Malik xəbər verdi. O, Zeyd ibn Əsləmdən, o da Səid ibn əl-Müseyyibdən belə rəvayət etdi: *“Rəsulullahın əleyhissalam, canlı heyvan qarşılığında ət satışını qadağan etdi”* .

Bu hədisi rəvayət edən Səid ibn əl-Müseyyib, tabeun nəslindəndir və hədisi mütləq bir səhabədən dinləmişdir. Ancaq hədisi rəvayət edərkən, bu hədisi aldığı səhabəni göstərməyib bilavasitə Rəsulullahdan rəvayət etmişdir. Belə bir vəziyyətdə hədisin isnadında qopuqluq meydana gəlmişdir. Bu səbəblə də hədis, mürsəl qəbul edilmişdir.

**a) Mürsəl hədisin hökmü**

Mürsəl hədisin dəlil olaraq qəbul edilib-edilməməsi məsələsində alimlər ixtilaf etmişlər. Bu görüşləri aşağıdakı kimi izah etmək mümkündür:

1. Mühəddislərin, fiqh və üsul alimlərinin əksəriyyətinə görə mürsəl hədis zəifdir və hər hansı bir mövzuda dəlil sayılmaz.

2. Əbu Hənifə, İmam Malik və tələbələrinin görüşünə görə isə siqanın səhihdir və dində hüccə olaraq qəbul edilə bilər.

3. Mürsəl hədis, isnadı tam olan başqa hədislə dəstəklənmiş və ya başqa isnadla yenə mürsəl olaraq rəvayət edilmişsə ya da hədisin ifadə etdiyi məna və hökm səhabələrin fikrinə uyğun isə bu təqdirdə onunla əməl edilir. İmam Şafi və ona tabe olanlar da bu fikri qəbul edirlər.

**b) Səhabə mürsəli**

Səhabənin bir-birindən eşitdikləri hədisləri, duyduğu şəxsin adını qeyd etmədən bilavasitə Peyğəmbər əleyhissalamdan rəvayət etməsiylə ortay çıxan hədislərə Səhabə mürsəli deyilir.

Hədisi Peyğəmbər əleyhissalamda duyan səhabənin adı qeyd edilmədiyinə görə tabei mürsəlinə bənzəyən sahəbə mürsəli hədis və fiqh alimlərinə gərə müttəsil və müsnəd hədis kimi dində dəlil qəbul etmişlər. Hətta səhabə mürsəlinin hüccə olduğuna dair icma olduğu da ifadə edilir.

**c) Mürsəl hədislərlə əlaqəli əsərlər**

1. Əbu Davud (vəfatı 275/888), *əl-Mərasil*. Bu əsərdə mürsəl hədislər mövzularına əsasən tərtib ediliibn Əsərdə 544 ədəd mürsəl hədis mövcuddur.

2. İbn Əbi Hatim (vəfatı 327/939), *əl-Mərasil.* Əsər mürsəl hədisləri irsal edən ravilərin isminə görə tərtib edilmişdir.

3. Əlai (vəfatı 761/1359), *Camiut-təhsil li əhkamil-mərasil.*

4. Səlahəddin Polad, *Mürsel Hadisler ve Delil Olma Yönünden Değerleri.* Doktorantura işi olan bu əsər daha çox mürsəl hədis haqqında texninki məlumatlar verir.

**2) Münqəti hədis**

**Leksik mənası:** Lüğətdə Münqəti; kəsik, kəsilmiş, qopmuş deməkdir.

**Termin mənası:** Münqəti hədis, sənədin ortasında bir və ya ardıcıl olmamaq şərtilə bir neçə ravisi göstərilmədən rəvayət edilən hədisə deyilir. Eyni zamanda ətbau-tabein nəslindən olan bir ravinin tabeini keçərək səhabədən rəvayət etdiyi hədisə də münqəti hədis deyilir.

Münqəti hədisdə inqita iki çür meydana gəlir:

**a. Açıq inqita.** Bu cür inqita, ravilərdən birinin özündən əvvəl yaşamış və buna görə də görüşməsi mümkün olmayan şeyxdən hədis rəvayət etməsi ilə meydana gəlir.

**b. Gizli inqita.** Bu cür inqita da, ravilərdən birinin əsrdaşı olduğu halda görüşmədiyi və yaxud görüşüb hədis dinləmədiyi bir şeyxdən hədis rəvayət etmək surətilə meydana gəlir.

Münqəti hədisə misal:

حَدَّثَنَا أَبُو إِسْحَقَ الْهَرَوِيُّ إِبْرَاهِيمُ بْنُ عَبْدِ اللَّهِ بْنِ حَاتِمٍ حَدَّثَنَا إِسْمَعِيلُ ابْنُ عُلَيَّةَ عَنْ سَعِيدِ بْنِ أَبِي عَرُوبَةَ عَنْ قَتَادَةَ عَنْ سُلَيْمَانَ الْيَشْكُرِيِّ عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ أَنَّ النَّبِيَّ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ لَمْ يُحَرِّمْ الضَّبَّ وَلَكِنْ قَذِرَهُ وَإِنَّهُ لَطَعَامُ عَامَّةِ الرِّعَاءِ وَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ لَيَنْفَعُ بِهِ غَيْرَ وَاحِدٍ وَلَوْ كَانَ عِنْدِي لَأَكَلْتُهُ

Qətadənin Süleyman əl-Yəşkuridən rəvayət etdiynə görə Cabir ibn Abdillah belə demişdi: "*Rəsulullah əleyhissalam kələr (kərtənkələ) ətini haram etmədi. Ancaq onu murdar olaraq qəbul etmişdir. Kələr çobanların çoxunun yediyi şeydir. Şübhəsiz Allah onu bir çox şeyə faydası olan bir heyvan olaraq yaratmışdır. Məndə birisini tapsaydım yeyərdim.*"[144]

Bu hədisin isnadında yer alan Qətadə, Süleyman əl-Yəşkuridən hədisi eşitməmişdir. Bunun belə olduğunu Buxari ifadə etmişdir.[145] Buna görə də hədis münqətidir.

Münqəti hədisin bir digər növü də isnadında bilinməyən bir şəxsin olduğu rəvayətdir. Misal:

حَدَّثَنَا سَعِيدٌ الْجُرَيْرِيُّ، عَنْ أَبِي الْعَلاءِ بن عَبْدِ اللَّهِ بن الشِّخِّيرِ، عَنْ رَجُلَيْنِ قَدْ سَمَّاهُمَا، عَنْ شَدَّادِ بن أَوْسٍ، أَنَّ نَبِيَّ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ، يَقُولُ فِي صَلاتِهِ:»اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ الثَّبَاتَ فِي الأَمْرِ.

144 İbn Macə, Sayd, 16.
145 İbn Həcər, *Təhzib*, IV, 214.

əl-Cüreyri, Əbul-Əla ibn Abdillah ibn əş-Şixxirdən, o da Hənzələ oğullarından iki nəfərdən rəvayətlə Şəddad ibn Əvsin belə dediyin rəvayət etmişdir: Həzrət Peyğəmbər bizə namazda belə deməyi öyrətdi. *"Allahım, səndən işlərimdə səbirli olmağı istəyirəm..."*[146]

Bu hədisin sənədindəki iki şəxsin kim olduqları bilinmədiyi üçün hədis münqəti sayılmışdır.

**a) Münqəti hədisin hökmü**

Münqəti hədis mürsəl hədisdən daha zəifdir. İsnadda qeyd edilməyən ravi və ya ravilərin kim olduğu və güvənli olub-olmadıqları bilinmədiklərinə görə münqəti hədis zəif qəbul edilir. Buna görə də onunla əməl etmək olmaz. Ancaq münqəti hədis başqa müttəsil təriqlə rəvayət edilərsə və digər səhihlik şərtlərini də özündə cəm edərsə onunla əməl etmək olar. Çünki rəvayət bu təriqlə səhihlik dərəcəsinə yüksəlmişdir. Məsələn İmam Suyuti, Müslimin Səhihində ondan çox hədisin münqəti olduğunu, ancaq bu hədislərin istər İmam Müslim olsun istərsə də digər müəlliflər tərəfindən müttəsil olaraq rəvayət edilmişdir.

**b) İnqitanı bilmə yolları**

1. Hədisin bütün sənədləri bir araya toplanır. Sonra bu sənədlər bir-birilərilə qarşılaştıraraq hansı ravinin göstərilmədiyi müəyyən edilir.

2. Sənəddəki ravilərin doğum və vəfat tarixləri araşdırılaraq tələbə ilə şeyxinin eyni əsrdə yaşayıb-yaşamadıqları, bir-birilə görüşüb görüşmədikləri müəyyənləşdirilir.

3. İnqitanı meydana gətirən ravinin etiraf etməsi ilə bilinir.

146 Təbərani, *Möcəm əl-kəbir*, II, 6. Ayrıca bax: Tirmizi, Dəavat, 23; Əhməd ibn Hənbəl, IV, 125.

### 3) Mudal hədis

**Leksik mənası:** Mudal kəlməsi lüğətdə güc və qarışıq olmaq, çox pis olmaq, müayinəsi mümkün olmamaq, yormaq, yorulmaq" kimi mənalarında gələn اعدل felinin ismi məfuludur.

**Termin mənası:** Sənədin hər hansı bir yerində ardıcıl iki və yaxud daha çox ravinin göstərilmədiyi hədislərə **Mudal hədis** deyilir.

Mudal hədisə misal:

عَنْ عَمْرِو بْنِ شُعَيْبٍ قَالَ: قَاتَلَ عَبْدٌ مَعَ رَسُولِ اللهِ صلَّي الله علَيْهِ وَ سَلَّمَ يَوْمَ اُحُدٍ فَقَالَ لَهُ رَسوُلُ الله صلَّي الله علَيْهِ وَ سَلَّمَ: اَذِنَ لَكَ سَيِّدُكَ ؟ قَالَ: لاَ. قَالَ: لَوْ قُتِلْتَ لَدَخَلْتَ النَّارَ. فَقَالَ سَيِّدُهُ: هُوَ حُرٌّ يَا رَسوُلَ اللهِ. فَقَالَ لَهُ النَّبِيُّ: اَلْاَنَ فَقَاتِلْ.

Əmr ibn Şueyb rəvayət etmişdir: Uhud müharibəsində bir kölə, Rəsulullahın tərəfində vuruşmuşdu. Rəsulullah əleyhissalam ona; "Sənin ağan sənə (vuruşmaq üçün) icazə verdi m*i?"*-deyə soruşdu. Kölə; *"Xeyr, vermədi"*-dedi. Rəsulullah əleyhissalam; *"Əgər öldürülmüş olsaydın (müharibəyə ağandan icazəsiz girdiyin üçün) yəqin ki, cəhənnəmə girərdin"*-buyurdu. Sonra kölənin ağası; *"Onu azad edirəm ya Rəsulullah! O artıq azaddır"*-dedi. Rəsulullah da; *"İndi oldu. Artıq vuruşa bilərsən"* -buyurdu.[147]

Bu hədisi rəvayət edən Əmr ibn Şueyb ətbaut-tabein nəslindəndir və tabeini və səhabəni buraxıb bilavasitə Rəsulullah əleyhissalamdan rəvayət etmişdir. Başqa bir ifadəylə hədisin isnadından, ardıcıl gələn iki ravi (tabeun və səhabə) düşmüşdür. Bu səbəblə hədis mudal qəbul edilmişdir.

Mudal hədilərə İmam Malikin Muvəttəsində də zaman–zaman rast gəlmək mümkündür. İmam Malik ətabut-tebein nəsilindən ol-

147 Neysaburi, *Mərifətu ulumil-Hədis*, s. 36.

masına baxmayaraq بَلَغَنِي deyərək həzrət Peyğəmbərdən nəql etdiyi bütün hədislər mudaldır. Misal

عَنْ مَالِكٍ أَنَّهُ بَلَغَهُ أَنَّ رَسُولَ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ تَرَكْتُ فِيكُمْ أَمْرَيْنِ لَنْ تَضِلُّوا مَا تَمَسَّكْتُمْ بِهِمَا كِتَابَ اللَّهِ وَسُنَّةَ نَبِيِّهِ

Malik belə rəvayət etmişdir. Mənə Rəsulullah əleyhissalamın belə buyurduğu rəvayət xəbəri çatdı: *"Sizin üçün iki xüsus buraxdım. Onlara sarıldığınız müddətdə zəlalətə düşməzsiniz. Bunlar Allahın kitabı və Rəsulunun sünnəsidir."*[148]

Göründüyü kimi hədisi İmam Malik tabeun və səahbə nəslindən olan raviləri qeyd etmədən Peyğəmbər əleyhissalamdan eşitmiş kimi rəvayət etdi. Məhz buna görə də bu təriqlə gələn hədis mudal hədis qəbul olunur.

**a) Mudal hədisin hökmü**

Mudal hədis munqatı hədisdən daha zəifdir. Zəif hədis növlərindən biri olduğun görə mudal hədis mərduddur. Dəlil olaraq istifadə etmək olmaz.

Mudal hədisin zəifliyi göstərilməyən ravi sayısının nisbətinə görə dəyişir. Daha çox ravisi göstərilməyən mudal hədis digərlərinə nisbətən daha zəifdir. Göstərilməyən ravilərin sayısı artdıqca zəiflik də artır.

**4) Müəlləq hədis**

**Leksik mənası:** Müəlləq kəlməsi lüğətdə "bir şeyi başqa bir şeyə bağlamaq, asmaq" mənasına gələn علق felindən ismi məfuldur. Belə ki, bir şeyi hər hansı bir şeyə taxmaq və bağlamaq surəti ilə asılı hala gətirmək deməkdir. Belə bir sənəd sadəcə üst

148 İmam Malik, Müvəttə, Qədər 3.

tərəfə bitişik, alt tərəfdən qopuq olduğu üçün müəlləq olaraq adlandırılmışdır.

**Termin mənası: S**ənədin baş tərəfindən arxa-arxaya bir neçə ravinin və yaxud müntəhasına qədər sənədin tamamının həzf edildiyi (düşürüldüyü) hədislərə müəlləq hədis deyilir.

Buxarinin bir babın müqəddiməsində qeyd etdiyi hədisi buna örnək olaraq göstərə bilərik:

Əbu Musa əl-Əşari belə dedi:

قَالَ أَبُو مُوسَى غَطَّى النَّبِيُّ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ رُكْبَتَيْهِ حِينَ دَخَلَ عُثْمَانُ

Osman (r) içəri daxil olduqda Peyğəmbər əleyhissalam dizlərini örtdü.[149]

Bu hədis müəlləqdir, çünki Buxari səhabə olan Əbu Musa əl-Əşari xaricindəki bütün sənədi həzf etmişdir.

Sənədlərin taliq edilməsinin məqsədi ixtisar etməkdir. Son dövrlərdə xüsusiylə xalq üçün qələmə alınan hədis əsərlərində sadəcə səhabə ravisi qeyd edilərək yazılan hədislərin hamısı müəlləq hədisdir. Ancaq bu hədislərin sənədləri müttəsil olaraq əsl mənbələrdə yer aldığına görə səhihliyinə xələl gətirməz.

### a) Müəlləq hədisin hökmü

Müəlləq hədis mərduddur. Onunla əməl etmək olmaz. Çünki hədisin qəbul edilmə şərtlərindən biri olan sənədin "müttəsil (kəsiksiz)" olma şərti, isnadındakı bir neçə ravinin qeyd edilməməsi ilə aradan qaldırılmışdır. Beləcə də, qeyd edilməyən ravinin sağlamlıq dərəcəsini müəyyənləşdirmək olmadığına görə hədis mərdud qəbul edilir.

Müəlləq hədis mudal hədisdən daha zəifdir.

149 Buxari, Salat, 12.

**5) Müdəlləs hədis**

**Leksik mənası:** Tədlis, kəlmə olaraq; bir şeyin ayıb və qüsurunu gizlətmək, açıq və bəlli olması lazım gələn bir şeyi gizli hala gətirmək; satıcının, satdığı malın qüsurunu alıcıya söyləməyib gizlətməsi deməkdir.

**Termin mənası:** Hədis termini olaraq tədlis; ravinin, şeyxindən eşitmədiyi hədisləri eşitmiş kimi rəvayət etməsi və ya hədisi aldığı adamı bilinməyən bir ad ya da ləqəb ilə anması yaxud da isnadda yer alan zəif bir ravini zikr etməyib buraxmasıdır.

**a) Tədlisin növləri**

Tədlis üç cür meydana gəlir. Bunlara tədlisul-isnad, tədlisuş-şüyux, tədlisut-təsviyə deyilir.

**Tədlisul-isnad:** Ravinin müasiri olduğu halda görüşmədiyi bir şeyxdən və ya görüşdüyü fəqət hədis eşitmədiyi bir şeyxdən və yaxud hədis eşitdiyi bir şeyxdən duymadığı bir hədisi duymuş kimi rəvayət etməsidir ki, buna *"isnad tədlisi"* deyilir.

Misal:

Əli ibn Haşrən nəql edir: Biz Sufyan ibn Uyeynənin yanında idik. Sufyan: قال الزهري "Zöhri dedi ki:…"-deyə sözü ilə başlayıb bir rəvayət nəql etdi. Ona; "Bu hədisi Zöhridən şəxsən eşitdinmi?"-deyə soruşulanda, Sufyan belə cavab verdi: "Xeyr, mən Zöhridən eşitməmişəm. Zöhridən Məmər eşitmiş, Məmərdən də Əbdürrəzzaq eşitmiş. Mən, Əbdürrəzzaqdan eşitmişəm." cavabını vermişdir.[150]

Sufyan ibn Uyeynənin öz ifadəsindən də başa düşüldüyü kimi, o, rəvayət etdiyi hədisi şəxsən Zöhridən eşitməmişdir.

150 İbn Kəsir, *Baisul-xəsis*, s.58.

Belə olduğu halda sanki, Zöhridən eşitmiş kimi "Zöhri dedi ki…"-deyə rəvayət etmişdir. Bu rəvayətdə tədlis vardır.

**Tədlisuş-şuyux:** Bir ravinin isnadı söylərkən, şeyxini hər kəs tərəfindən tanınan adı ilə deyil, bilinməyən bir ləqəb və ya künyə ilə anmasıdır.

Ravinin bu cür davranmasının məqsədi şeyxini hər kəs tərəfindən tanınan adı ilə deyil, bilinməyən bir ləqəb və ya künyə ilə anmasının əsas səbəbi, gizlətmək istədiyi şeyx ya yaşca özündən kicik və ya zəifdir yaxud da ondan çox hədis rəvayət etdiyi üçün dinləyənlərin -həmişə eyni şəxsdən rəvayət edir- fikrini ortadan qaldırmaq üçündür.

Misal:

Əbu Bəkr ibn Mücahid; حَدَّثَنَا عُبْدُ اللهِ بْنِ اَبِي عَبْدِ الله... "Abdullah bin Əbi Abdullah bizə dedi ki,…"-deyə bir rəvayət nəql etmişdir.[151] Əbu Bəkrin "Abdullah ibn Əbi Abdillah" olaraq bəhs etdiyi şəxs məşhur hədis alimi Əbu Davudun oğlu Abdullahdır və onun hər kəs tərəfindən tanınan ləqəbi də "Abdullah ibn Əbi Davuddur."[152] Ondan rəvayət edən Əbu Bəkir bin Mücahid isə onu, adı ilə ya da hər kəs tərəfindən bilinən ləqəbi ilə deyil, tanınmayan bir ləqəb ilə anmışdır. Bu hədisin isnadında da tədlis edilmişdir.

**Tədlisut-təsviyyə:** Bir şəxsin, rəvayət etdiyi hədisin isnadında olan siqa ravilər arasındakı zəif bir ravini qeyd etmədən hədisi tamam etibarlı ravilərdən almış kimi göstərməsidir. Bəzi alimlər bunu tədlisul-isnadın növü olaraq qəbul etmişlər.

151 İbn Kəsir, e.a.ə. s. 59.
152 İbn Kəsir, e.a.ə. s. 59.

Misal:

عَنْ بَقِيَّةَ: حَدَّثَنِي اَبُو وَهْبِ اْلاَسَدِي عَنْ نَافِعٍ عَنْ اِبْنِ عُمَرَ: لاَ تَحْمِدُوا اِسْلاَمَ اْلمَرْءِ حَتَّي تَعْرِفُوا عُقْدَةَ رَأْيِهِ.

Bəqiyyədən belə rəvayət edilmişdir: Mənə Əbu Vəhb əl-Əsədi, Nafidən, o da İbn Ömərdən bu hədisi rəvayət etdi: "Bir şəxsin fikrinin əslini bilmədən o şəxsin müsəlmanlığını tərifləməyin"[153]

İbni Əbi Xatimin bildirdiyinə görə bu hədisin isnadında çox az şəxsin başa düşə biləcəyi bir xüsusiyyət vardır. Hədisin isnadına diqqət edilərsə, bu hədisi Əbu Vəhb əl-Əsədi, Nafidən aldığını bildirmişdir. Halbuki, Əbu Vəhb bu hədisi Nafidən deyil, İshaq bin Əbi Fərvədən, o da Nafidən almışdır. Fəqət Bakiyyə raviləri zikr edərkən İshaqı ötürmüşdür. Çünki İshaq, zəif bir ravidir. Bu səbəblə Bakiyyə zəif bir ravi olaraq İshaqı isnadda qeyd etməyərək hədisi tamamilə siqa ravilər rəvayət etmiş kimi göstərmişdir. Bu səbəblə də isnadda tədlis vardır. Hədis də müdəlləsdir.[154]

**b) Müdəlləs hədisin hökmü**

Alimlərin əksəriyyətinə görə isnadda tədlis ilə rəvayət edilən hədislər zəifdir və onunla əməl edilməz. İmam Şafii bu növ tədlis üçün: "tədlis yalanın qardaşıdır" demişdir. Şuyux tədlisi də alimlərə görə məkruhdur. Çünki ravi öz şeyxini bilinməyən adla söyləyərək məçhul vəziyyətə salmaqdadır. Əgər gizlətdiyi ravi zəifdirsə bu böyük məsuliyyətdir.

Mudəlləs hədis münqəti hədisdən daha zəif sayılmışdır.

153 İbn Əbi Hatim, *İləl*, II, 154-155.
154 Süyuti, *Tədribur-Ravi*, s.140-141

### b. Ravinin vəziyyətinə görə zəif hədislər

#### 1) Münkər hədis

**Leksik mənası:** Lüğətdə qəbulun ziddi mənası ifadə edən inkar kökündən ismi faildir.

**Termin mənası:** Termin olaraq münkər hədis haqqında iki ayrı görüş ortaya çıxmışdır.

Birinci gərüşə görə münkər hədis, zəif bir ravinin siqa raviyə müxalif olaraq rəvayət etdiyi hədisdir. Alimlərin çoxunun qəbul etdiyi tərif budur.

İkinci görüşə görə isə, münkər kəlməsi daha geniş mənada istfadə edilmişdir. Belə ki, siqa raviyə müxalif olmasa belə, bir ravinin tək başına rəvayət etdiyi hədislərə münkər hədis deyilir. Buna görə ravi zəif olsun və ya siqa olsun rəvayətində tək qalmışsa və rəvayət etdiyi hədis digər hədisşünaslar tərəfindən bilinməyən bir hədis isə bu növ hədislər münkər olaraq adlandırılmışdır.

Misal:

عَنْ حُبَيِّبٍ عَنْ اَبِي اِسْحَاق عَنِ الْعَيزَارِ بْنِ حُرَيْثٍ عَنِ ابْنِ عَبَّاسٍ عَنِ النَّبِيَّ صلَّي الله علَيْهِ وَ سَلَّمَ: مَنْ اَقَامَ الصَّلاَةَ وَ اَتيَ الزَّكَاةَ وَ حَجَّ وَ صَامَ وَ قَرَي الضَّيْفَ دَخَلَ الْجَنَّةَ.

Hubeyyib, Əbu İshaqdan; o, Ayzər ibn Hureysdən; o, İbn Abbasdan; o da Rəsulullahdan bu hədisi rəvayət etmişdir: *"Hər kim namaz qılar, zəkatı verər, həcc edər, orucu tutar və qonağa qulluq edərsə cənnətə girər."*[155]

Hubeyyibin yuxarıda bildirilən isnadla Peyğəmbər əleyhissalamdan rəvayət etdiyi bu hədis, əslində Peyğəmbərimizin əleyhissalam deyil, Abdullah ibn Abbasın sözüdür. Siqa ravilər, bu sözün

155 Əsqəlani, *Şərhu Nuxbətil-Fikər*, s. 13-14.

Abdullah ibn Abbasa aid olduğunu bildirmişlər və onun sözü olaraq nəql etmişlər. Belə ki, Hubeyyibin bu rəvayəti siqa ravilərin rəvayətinə müxalifdir; hədisi bu cür rəvayət edən başqa şəxs də yoxdur. Xüsusilə Hubeyyib zəif bir ravidir. Hədis, bu səbəblərdən ötrü münkər qəbul edilmişdir.

**a) Münkər hədisin hökmü**

Birinci tərifə uyğun olaraq münkər hədis zəifdir. Dində onunla əməl edilməz. çünki ravisi zəifdir. Həmçinin siqa ravilərin rəvayətinə də zidddir və bu rəvayətində tək qalmışdır.

**2) Mətruk hədis**

**Leksik mənası:** Mətruk tərk edilmiş, buraxılmış, qəbul edilməmiş deməkdir.

**Termin mənası:** Sənədində yalan söyləməklə müttəhim və ya gündəlik həyatında yalan danışdığı sabit olan bir ravinin olduğu hədisə Mətruk hədis deyilir.

Misal:

عَنْ صَدَقَةَ بْنِ مُوسَي عَنْ فَرْقَدٍ عَنْ مُرَّةَ عَنْ اَبِي بَكْرٍ: لاَ يَدْخُلُ الْجَنَّةَ خَبٌّ وَ لاَ بَخِيلٌ وَ لاَ سَيِّءُ الْمَلَكَةِ.

Sədəqə ibn Musa, Fərqaddan; Fərqad, Mürrədən; o da Əbu Bəkirdən rəvayət etmişdir: *"Cənnətə, nə hiyləgər nə xəsis, nə də idarəsindəkilərlə pis davranan kimsə girə bilər."*[156]

Mərfu olaraq rəvayət edilən bu hədis raviləri olan Sədəqə ibn Musa və şeyxi Fərqad yükşək dərəcədə zəifliklə ittiham edilmiş ravilərdir. Buna görə də hədis mətrukdur.

156 Zəbidi, *Təcridi-Sərih tərcüməsi və şərhi*, I, 126.

**a) Mətruk hədisin hökmü**

Ravisi yalancılıqla müttəhim olduğuna görə mətruk hədislər zəif olaraq vəsifləndirilmişdir. Buna görə də dində dəlil olmaz.

**3) Muəlləl hədis**

**Leksik mənası:** Qüsurlu etmək, xəstələndirmək mənasına gələn أعلَّ felinin ismi məfuludur.

Bundan başqa, müəlləl kəlməsi; illəli, qüsurlu mənasına da gəlməkdədir.

**Termin mənası:** Müəlləl hədis görünüşü etibarilə səhih olmaqla yanaşı səhhətinə zərər verəcək gizli bir qüsuru müəyyənləşdirilən hədisdir.

İlləti müəyyənləşdirmək üçün hədislərin bütün tariklərini toplamaq, ravilərin ixtilaflarına baxmaq, zəbt və ədalət sifətlərini incələmək lazımdır.

Hədisi müəlləl hala gətirən illət hədisin ya isnadında ya da mətnində olur.

Hədisin isnadındakı nöqsana misal:

عَنِ ابْنِ جُرَيْجٍ عَنْ مُوسَي بْنِ عُقْبَةَ عَنْ سُهَيْلِ بْنِ اَبِي صَالِحٍ عَنْ اَبِيهِ عَنْ اَبِي هُرَيْرَةَ عَنِ النَّبِيِّصلَّي الله علَيْهِ وَ سَلَّمَ قَالَ: مَنْ جَلَسَ مَجْلِسًا كَثُرَ فِيهِ لَغَطُهُ فَقَالَ قَبْلَ اَنْ يَقُومَ "سُبْحَانَكَ اللَّهُمَّ وَ بِحَمْدِكَ لاَ اِلَهَ اِلاَّ اَنْتَ اَسْتَغْفِرُكَ وَ اَتُوبُ اِلَيْكَ" اِلاَّ غُفِرَ لَهُ مَا كَانَ فِي مَجْلِسِهِ ذَلِكَ.

İbn Cureyc, Musa ibn Uqbədən; o Suheyl ibn Əbi Salehdən; o, atasından; atası, Əbu Hureyrədən; o da Peyğəmbər əleyhissalamdan rəvayət etmişdir. Peyğəmbərimiz əleyhissalam belə buyurmuşdur: *"Dedi-qodunun çox edildiyi bir toplantıda oturan kimsə, oradan qalxmadan əvvəl; "Allahım! Səni həmdinlə təsbeh edərəm. Səndən*

*başqa ilah yoxdur. Səndən, günahlarımı bağışalamanı dilər, sənə tövbə edirəm"-deyərsə, o toplantıda etdiyi dedi-qodunun günahı əfv olunar."*[157]

Hədisin isnadında; İbni Cüreycin Musab bin Uqbədən onun da Süheyl bin Əbi Salehdən rəvayət etdiyi göstərilsə də Musa bin Uqbənin bu hədisi Süheyl ibn Əbi Salehdən alıb-almadığı dəqiq deyil. Məhz buna görə də hədisin isnadının doğruluğu şübhəli hala düşməktədir. Bu şübhə bir illə yəni bir qüsur qəbul edildiyindən, bu hədis də müəlləl (illəli, qüsurlu) sayılmışdır.

Hədisin mətnindəki illəyə bir nümunə:

عَنْ اَنَسِ بْنِ مَالِكٍ قَالَ: صَلَّيْتُ خَلْفَ النَّبِيِّ صلَّي الله علَيْهِ وَ سَلَّمَ وَ اَبِي بَكْرٍ وَ عُمَرَ وَ عُثْمَانَ فَكَانُوا يَسْتَفْتِحُونَ بِالْحَمْدِ للهِ رَبِّ الْعَالَمِينَ وَ لاَ يَذْكُرُونَ بِسْمِ اللهِ الرَّحْمَنِ الرَّحِيمِ فِي اَوَّلِ قِرَائَةٍ وَ لاَ فِي اَخِيرِهاَ.

Ənəs ibn Malik belə demişdir: Mən, həzrət Peyğəmbərimizin, Əbu Bəkrin, Ömərin və Osmanın arxasında namaz qıldım. Hamısı da namaza "Əlhəmdulillahi Rabbil aləmin…(Fatiha)" ilə başlayırlar; qiraətin əvvəlində və axırında "Bismilləhir-Rəhmanir-Rəhim" demirdilər.[158]

İbn Salah bu hədis haqqında belə deyir: "Hədis alimlərindən bəziləri bu hədisin "qiraətin əvvəlində də axırında da "bismillahirahmanirahim" demirdilər." qismini illəli görmüşlər. Çünki Buxari ilə Müslimin ittifaq etdikləri eyni hədisdə bu ifadə yoxdur. Başqa ravilərin də əksəriyyəti, eyni hədisi rəvayət edərkən bəhs etdiyimiz qismi zikr etməmişlər.

157 Hakim, *Mərifətu ulumil-Hədis*, s.113.
158 İbn Kəsir, e.a.ə. s. 67.

### 4) Məqlub hədis

**Leksik mənası:** Məqlub; dəyişdirilmiş, altı üstünə gətirilmiş deməkdir.

**Termin mənası:** Məqlub hədis, isnadındakı ravilərdən birinin və ya bir neçəsinin ad və ya nisbələri ya da mətndəki söz və ya cümləleri dəyişdirilmək surətiylə rəvayət edilmiş hədisdir.

كَعْبُ بْنُ مُّرة yerinə مُرَّةُ بْنُ كَعْب və ya حَتَّي لَا تَعْلَمَ شِمَالُهُ مَا تُنْفِقُ يَمِينُه yerinə حَتَّي لَا تَعْلَمَ يَمِينُه مَا تُنْفِقُ شماله kimi yerlərinin dəyişdirilərək rəvayət edilməsi kimi.

Hədisin mətnində edilən dəyişikliyə misal:

Peyğəmbərimizin, qiyamət günündə Allahın rəhmətinə məzhər olub məhşər yerində arşın kölgəsində kölgələndiriləcək yeddi qrup insandan bəhs edən hədisin bir firqəsi belədir:

حَتَّى لاَ تَعْلَمَ شِمَالُهُ مَا تُنْفِقُ يَمِينُهُ

*"Sağ əlinin verdiyini sol əli bilməyəcək (şəklində gizli sədəqə verən) adam."*[159]

Hədisin səhih olan şəkli bu cür olmasına baxmayaraq, Müslimin rəvayətində bu ifadə

حَتَّى لاَ تَعْلَمُ يَمِينُهُ مَا تُنْفِقُ شِمَالُهُ

*"Sol əlinin verdiyini sağ əli bilməyəcək (şəkildə gizli sədəqə verən) adam"* şəklində dəyişmişdir.[160]

Hədis kəlmə dəyişikliyinə məruz qaldığına görə məqlubdur.

Hədisin isnadındakı dəyişiklik üç cür olur:

159 Buxari, Zəkat, 36; Müvəttə, Şer, 4.
160 Müslim, Zəkat, 91.

a. İsnaddakı ravilərdən birinin və ya bir neçəsinin adları dəyişdirilmişdir. Məsələn: Malik ibn Ənəs (Ənəs oğlu Malik) adını, Ənəs ibn Malik (Malik oğlu Ənəs) şəklində yazmaq kimi.[161]

b. İsnaddakı ravilərdən birinin adı çıxarılıb onun yerinə daha tanınmış bir başqa ravinin adı qoyulmuşdur. (belə etməkdə məqsəd, hədisə rəğbəti artırmaqdır. Bu işi edənlər də ümumiyyətlə hədis uyduran kimsələrdir.)

Misal:

Hammad ibn Əmr, bu hədisi rəvayət etmişdir:

عَنِ ٱلاَعْمَشِ عَنْ صَالِحٍ عَنْ اَبِي هُرَيْرَةَ: اِذَا لَقِيتُمُ الْمُشْرِكِينَ فِي طَرِيقٍ فَلاَ تَبْدَؤُهُمْ بِالسَّلاَمِ.

Əməş, Əbu Salihdən; o da Əbu Hüreyrədən rəvayət etmişdir: (Rəsulullah buyurdu ki:) *"Yolda müşriklərə rastladığınız zaman onlara salam verməyə siz başlamayın (ilk olaraq siz salam verməyin.)"*[162]

Bu hədisin isnadında dəyişiklik edilmişdir. Çünki hədisin doğru olan isnadı عَنْ سُهَيْلِ بْنِ اَبِي صَالِحٍ عَنْ اَبِي هُرَيْرَةَ Süheyl ibn Əbi Salih -Əbu Salih- Əbu Hüreyrə şəklindədir.[163] Hammad, bu hədisi rəvayət edərkən isnaddan Süheyl ibn Əbi Salihi çıxarmış, onun yerinə Əməşin adını qoymuşdur.

Hədisin isnadı tamamən dəyişdirilmişdir. (bu cür dəyişdirmə, ümumiyyətlə ravinin xətasına görə meydana gəlir.)

Misal:

عَنْ جَرِيرٍ عَنْ ثَابِتٍ عَنْ اَنَسٍ: اِذاَ اُقِيمَتِ الصَّلاَةُ فَلاَ تَقَامُوا حَتَّ تَرَوْنِي.

161 İbn Kəsir, e.a.ə., s. 97.
162 Süyuti, e.a.ə., s. 107
163 Müslim, Salam, 13.

Cərir ibn Hazim, Sabitdən; o da Ənəsdən rəvayət etmişdir: (Rəsulullah belə buyrudu:) *"Namaz üçün qamət gətirildiyində məni görmədikcə (mən məscidə girmədikcə) ayağa qalxmayın."*[164]

Əslində bu hədisin isnadı

"عَنْ يَحْيَى بْنِ كَثِيرٍ عَنْ عَبْدِ اللهِ بْنِ اَبِي قَتَادَةَ عَنْ اَبِيهِ

Yəhya ibn Kəsir–Abdullah ibn Cərir ibn Hazim, hədisi rəvayət edərkən isnadı tamamən dəyişdirmişdir.

**a) Məqlub hədis rəvayət etmənin səbəbləri**

1. "Heç kimin bilmədiyi hədisləri rəvayət edir" kimi görünmək arzusu. Hədisşünaslar buna hədis oğruluğu və bunu edənə də hədis oğrusu demişlər.

2. Bir mühəddisin hədis biliyini ölçmə arzusu. Buxarini imtahan etmək üçün edilən məqlub buna misaldır.

3. Ravinin yanılması. Səhih hədisləri cəm edən əsərlərdəki məqlub hədislər ümumiyyətlə ravinin yanılması nəticəsində ortaya çıxmışdır.

**b) Məqlub hədisin hökmü**

Ravini qəflət və xətasına görə meydana gələn məqlub hədislər zəif sayılmışdır. Hədisin məqlub olmayan şəkli müəyyən edilsə hökm ona görə verilir.

**5) Şaz hədis**

**Leksik mənası:** Lüğətdə tək qaldı mənası ifadə edən شَذَّ felinin ismi failidir. Şaz; bir səbəbə görə camaatdan ayrılıb tək qalan kimsə, istisna təşkil edən şey və ya kimsə mənasındadır.

164 İbn Salah, e.a.ə., s. 48.

**Termin mənası:** Hədis termini olaraq şaz hədis, güvənilən bir ravinin, özündən daha güvənili olan başqa ravilərə müxalif olaraq rəvayət etdiyi hədisdir. Belə bir vəziyyətdə, daha güvənilən ravilərin rəvayət etdikləri hədisə **məhfuz,** ona müxalif olan rəvayətə isə **şaz** deyilir.

Şaz hədisin səhih hədislərə müxalifliyi isnad yönündən olduğu kimi mətn yönündən də ola bilər.

İsnad yönündən müxalifliyə misal:

Əbu Davud və Tirmizi, bu hədisi rəvayət etmişlər:

عَنْ عَمْرِو بْنِ دِينَارٍ عَنْ عَوْسَجَةَ عَنِ بْنِ عَبَّاسٍ قَالَ: اِنَّ رَجُلاً تَوَفَّي عَلَي عَهْدِ رَسُولِ اللهِ صلَّي الله علَيْهِ وَ سَلَّمَ وَ لَمْ يدَعْ وَارِثًا اِلاَّ مَوْلَى هُوَ اَعْتَقَهُ فَدَفَعَ رَسُولَ الله ِصلَّي الله علَيْهِ وَ سَلَّمَ مِيرَاثَهُ اِلَيْهِ.

Əmr ibn Dinar, Avsəcədən; o da Abdullah ibn Abbasdan rəvayət etmişdir. Abdullah ibn Abbas belə dedi: *"Rəsulullah dövründə bir adam vəfat etmiş və azad etdiyi köləsindən başqa mirasçı qoymamışdı. Rəsulullah əleyhissalam, adamın mirasını ona (köləyə) verdi*.[165]

Bu hədis səhihdir və isnadı da tamdır. Ancaq Hammad ibn Zeyd eyni hədisi; عَنْ عَمْرِو بْنِ دِينَارٍ عَنْ عَوْسَجَةَ Əmr ibn Dinar-Avsəcə" isnadıyla rəvayət etmiş və Abdullah ibn Abbası zikr etməmişdir.[166] Başqa bir ifadəylə Hammadın rəvayət isnadı yönündən səhih və tanınmış olan rəvayətə müxalif olduğundan şaz qəbul edilmişdir.

Mətn yönündən müxalifliyə misal:

Nubəyşə əl-Huzəlinin rəvayət etdiyinə görə Rəsulullah belə buyurmuşdur:

اَيَّامُ التَّشْرِيقِ اَيَّامُ اَكْلٍ وَ شُرْبٍ.

165 Əbu Davud, Fəraiz, 8; Tirmizi, Fəraiz, 14
166 Süyuti, *Tədribur-Ravi*, s. 235.

*“Təşrik günləri, yemə-içmə günləridir.”*[167]

Hədisin səhih olan rəvayəti belə olduğu halda Musa ibn Uley ibn Rəbah, bu hədisi atasından, o da Uqbə ibn Amirdən bu şəkildə rəvayət etmişdir:

يَوْمُ عَرَفَةَ وَ اَيَّامَ التَّشْرِيقِ اَيَّامُ اَكْلٍ وَ شُرْبٍ.

*“Arafə günü və təşrik günləri, yemə-içmə günləridir.”*[168]

Bu rəvayətdə “arafə günü” əlavəsi vardır. Odur ki, bu rəvayət səhih olan rəvayətə müxalif olduğu üçün şaz qəbul edilmişdir.

**6) Müdrəc hədis**

**Leksik mənası:** Müdrəc kəlməsi lüğətdə, bir şeyi digər bir şeyə daxil edib içinə qoymaq mənasına gəlir.

**Termin mənası:** Ravisi tərəfindən mətninə, əslində olmayan sözlər əlavə edilmiş və bu sözlər də əslindənmiş kimi göstərilən hədisdir.

Misal:

قَالَ رَسُولُ اللهِ صلَّي الله علَيْهِ وَ سَلَّمَ: اَسْبِغُوا الْوُضُوءَ وَيْلٌ لِلْاَعْقَابِ مِنَ النَّارِ.

Rəsulullah Əfəndimiz əleyhissalam belə buyurmuşdur: *“Dəstəmazı tam alın. Cəhənnəmdə (yanacaq olan) topuq arxalarının vay halına!”*[169]

Bu hədisin ilk qismində yer alan “Dəstəmazı tam alın” ifadəsi hədisin əslindən olmayıb ravisi olan Əbu Hüreyrənin sözüdür. Buna görə də hədis, müdrəc hədis qəbul edilmişdir.

Rəvayətin əslində Əbu Hüreyrə belə demişdir:

167 Muslim, Siyam, 141
168 Zəbidi, *Təcridi-Sərih*, I.,122.
169 Buxari, Vudu, 29.

اَسْبِغُوا الْوُضوُءَ. فان أبا القاسم صلي الله عليه و سلم قال، وَيْلٌ لِلْاَعْقَابِ مِنَ النَّارِ

Dəstəmazı tam alın. Çünki Əbul-Qasım əleyhissalam belə demişdi: “*Cəhənnəmdə (yanacaq olan) topuq arxalarının vay halına!*”[170]

**a) İdracın səbəbləri**

İdracın səbəbləri çoxdur. Bunlardan ən çox bilinəni bunlardır:

1. Şəri bir hökmü açıqlamaq

2. Hədisi bitirmədən hədisdən şəri hökm istinbat etmək

3. Hədisdəki qərib bir sözü açıqlamaq.

**b) İdracın hökmü**

Hədisşünas, hüquqşünas və digər alimlərə görə idrac icma ilə haramdır. Ancaq qərib kəlmələrin açıqlaması üçün edilən izahlar istisnadır.

**7) Müsəhhəf hədis**

**Leksik mənası:** Lüğətdə müsəhhəf sözü التصحيف məsdərinin ismi məfuludur. Yazılı bir səhifədə meydana gələn xəta deməkdir.

**Termin mənası:** Hədisdə yer alan kəlməni ləfz və ya məna olaraq, siqa ravilərin rəvayət etdiyi şəkildən başqa şəklə dəyişdirməyə təshif, belə rəvayət edilən hədisə də müsəhhəf hədis deyilir. Misal:

مَنْ صَامَ رَمَضَانَ واَتْبَعَهُ سِتًّا مِنْ شَّوالٍ [171] *(kim ramazan orucundan sonra altı gün də şəvval ayından tutarsa...)* hədisi buna örnəkdir. Çünki bu hədisdə Əbu Bəkr əs-Suli təshif edərək مَنْ صَامَ رَمَضَانَ واَتْبَعَهُ شَيْئًا مِنْ شَّوالٍ şəklində sittən kəlməsini şeyən deyə dəyişdirmişdir.

170 Buxari, Vudu, 29.
171 Müslim, Siyam, 204.

Ümumiyyətlə ravinin təshifə düşməsinin səbəbi, hədisi kitab və səhifələrdən alması, şeyx və müəllimlərindən şəxsən eşidərək almamasıdır. Buna görə də hədis mütəxəssisləri hədisi kitab və səhifələrdən alan ravilərdən hədis almaqdan çəkinmişlər. Onlar haqqında belə demişlər: " Sahafidən hədis alınmaz." (hədisi səhifələrdən alanların hədisi alınmaz.)

**8) Mühərrəf hədis**

**Leksik mənası:** Lüğətdə dəyişdirmək, bir şeyin yerinə başqasını gətirmək, bir əşyanın yerinə başqasını qoymaq mənasını ifadə edir.

**Termin mənası:** Kəlməsi hərəkə dəyişikliyinə məruz qalan hədislərə mühərrəf hədislər deyilir.

عن جابر قال: رُمِىَ أُبَيٌّ يَوْمَ الاَحْزَابِ عَلَى اَكْحَلِهِ .

Cabirdən belə rəvayət edilmişdir: "*Xəndək savaşı günü Übey ibn Kəb qol damarlarından yaralandı...*"[172]

Bu hədisdəki أُبي (Ubey) kəlməsini Ənzə adındakı ravi أبِي (Əbi) şəklində rəvayət etmişdir. Bu təhrifdir. Çünki Cabirin atası Uhud müharibəsində şəhid olmuşdur.

Xülasə, mühərrəf hədislər xəta nəticəsində səhv oxunaraq kəlmənin dəyişməsilə əslindən fərqli bir şəkildə rəvayət edilən hədislərdir. Ravilərin suil-hifz (düzgün əzbərləməmələr) və laqeydlikləri nəticəsində qarşımıza çıxmaqdadır. Bu səbəblərə görə də bəzən çox bəsit xətalara düşülür. Bu xətaları Füzulini kəlmələri ilə ifadə edək: bəzən bir hərf düşərək **nadiri nar** edəcək, bəzən də bir nöqtənin düşməsi ilə **gözü kör** edəcək qədər mühimdir.

172 İbn Salah, *Ulumul-hədis*, s. 252.

## V. UYDURMA HƏDİS

Ravisi tənqid edilən hədislər arasında ən dəyərsiz olanı uydurma hədisdir. Belə kəlmələrə bəzi alimlər hədis demənin dügün olmadığını, bəlkə də uydurulmuş söz deyilməsinin doğru olacağını ifadə etmişlər. Onlara hədis deyilməysinin səbəbi, hədis deyə uydurulmuş olduğu üçündür.

Hədis adıyla uydurulmuş sözlər, əl-hadisul-məvzu, əl-hadisul-muhtəlak və ya əl-hadisul-masnu terminləriylə ifadə edilməkdədir.

### A. UYDURMA HƏDİSİN TƏRİFİ

Başda İslam dininə qarşı olanlar olmaq üzrə, mənsub olduqları siyasi firqələri, fiqhi məzhəbləri, qəbilələrini, dillərini, bölgələrini, tabe olduqları imamları tərifləmək üçün, idarəçilərin nəzərində yüksək mərtəblər qazanmaq üçün, came və məsçidlərdə moizə oxuduqları camaatı cuşə gətirmək və özlərinə yönləndirmək üçün, xalqın dinə qarşı rəğbət və təvəccöhünü artırmaq üçün, yalancıların və cahillərin uydurduqları daha sonra da bu uydurmuş sözlərin dərəcələrini yüksəltmək üçün məşhur hədis ravilərindən quraşdırdıqları isnadları əlavə edərək hədismiş kimi həzrət Peyğəmbər əleyhissalama iftira edilən yalan sözlərə uydurma söz, mevzu hədis deyilir.[173]

### B. HƏDİS UYDURMACILIĞI NIN BAŞLANĞICI

Yuxarıda hədislərin bir çox növlərini, xüsusiyyətlərini və İslam dini və mədəniyyəti üçün təqdim etdiyi əhəmiyyətini qeyd etməyə çalışdıq. Hədislərin bu müstəsna mövqeyi, onlardan müxtəlif məqsədlərlə istifadə etmək fikirlərini də yanında gətirmişdir. İslam cəmiyyətində kitab və sünnəyə uyğunluq məşru

173 Tərif üçün bax. Talat Koçyiğit, *Hadis İstilahları*, s. 225.

(islami qadalara uyğun) olmağın əsas şərtidir. Bəzi şəxslər və ya qruplar, hədis uydurararaq bu gərəyi yerinə yetirməyə çalışmışlar. Yəni hədis uydurma təşəbbüsləri bir mənada hədisin İslam cəmiyyətindəki hakimiyyəti və dindəki yerinin etirafı deməkdir. Necə ki, qiymətli şeylər saxtalaşdırılır.

Həzrət Peyğəmbər adına hədis uydurmanın tarixini dəqiq olaraq müəyyənləşdirmək çətindir. Bəziləri bunun, həzrət Peyğəmbər dövründə başladığını iddia etməkdədir. Bu iddialarına da həzrət Peyğəmbərin: (من كذب عليّ متعمدا فليتبوأ مقعده من النار) "kim bilə bilə mənə yalan nisbət edərsə Cəhənnəmdəki yerinə hazırlaşsın"[174] hədisini dəlil olaraq göstərməktədir. Onlara görə adı naməlum bir şəxs həzrət Peyğəmbərin paltarına bənzər paltar geyərək, Mədinədən iki mil uzaqda yerləşən Leys oğulları qəbiləsinə gələrək həzrət Peyğəmbərin özünə səlahiyyət verərək onlara göndərdiyini söyləyir. Bu şəxs cahiliyyət dövründə Leys qəbiləsindən bir qadınla evlənmək istəmiş, ancaq istəyi qəbul edilməmişdi. Bu səbəblə də bu hiyləni işlədərək o qadının evinə və ya ona yaxın bir yerdə məskunlaşır. Bundan şübhələnən qəbilə xalqı, hadisəni aydınlaşdırmaq üçün həzrət Peyğəmbərə bir elçi göndərirlər. Bunu eşidən həzrət Peyğəmbər qəzəblənərək "yalan söyləmiş. Allahın düşmanı"-dedi. Əshabından birini vəzifələndirərək, onu canlı ələ keçirsə öldürməyi, ölü olaraq taparsa yandırmağı əmr etdi. Qəbiləyə gəldiklərində bu şəxsin gecə çölə çıxanda ilanın sancdığını və öldüyünü görürlər. Bunun üzərinə də həzrət Peyğəmbər yuxarıdakı hədisi söyləyir.

Bu xəbər hər nə qədər hadis uydurma fəaliyyətinin həzrət Peyğəmbər zamanında başladığını göstərsə də sistematik hədis uydurma fəaliyyəti mənasına gəlməz. Sistematik olaraq hədis uydurma fəaliyyəti hədis alimlərinin əksəriyyətinə görə həzrət

174 Buxari, Elm, 38; Müslim, İman, 112.

Osmanın şəhid edilməsindən sonra başlamışdır. Bu hadisə nəticəsində müsəlmanlar firqələrə ayrılmış və hər firqə də özünün doğru olduğuna inanmışdır. Bu qruplardan hər biri özünün haqlı olduğunu ispatlamaq üçün ayə və hədislərdən dəlillər axtarmışlardır. Bu mənbələrdən özlərinə uyğun dəlil tapa bilməyincə həzrət Peyğəmbərin adına yalan uydurararaq ətrafındakıları aldatmağa çalışmışlar

Mərhum Əhməd Naim ifadəsilə "...küfri billahdan sonra əkbəri kəbair" olan hədis uydurma təşəbbüslərini bir az yaxından tanıyaq.

## C. HƏDİS UYDURMANIN SƏBƏBLƏRİ

Zaman keçdikcə uydurma fəaliyyətlərinin bəzi məqsədlərə yönəlik olduğu görünməkdədir. Bu məqsədləri belə sıralamaq olar.

### 1. Qrup görüşünü müdafiə etmə

Siyasi bölünmələr zamanla etiqadi bölünmələrə də səbəb olmuşdur. Bu qruplar doğru yolda olduqlarını isbat etmək üçün fikirlərini güclü dəlillərə nisbət etmək məcburiyyətində idilər. Hədislər isə hələ rəsmən və tamamilə yazılı olaraq bir araya toplanmamışdı. Buna görə də, təhrif etmək və dəyişdirmə imkanı vardı.

Qruplar əvvəlcə liderləri lehində hədis uydururdular. Həmçinin qarşı qrupların əleyhində də hədis emal etməkdən çəkinmirdilər. Bu işdə müsəlmanların düşmənlərinin rolu da danılmazdır.

Kraldan çox kralçılıq edən tərəfdarların, idarəçilərə yaltaqlanmaq və mal dövlətə sahib olmaq istəyən mənfəətpərəstlərin bu işdə böyük rolu vardır. Bundan başqa qövmiyətçilik və yerlipərəstlik hisləriylə də uydurulmuş hədislərin varlığı bir həqiqətdir.

Həddindən çox tərəfkeşlik, firqəçilik və qrupçuluq meyli, bir çox hallarda din şuurunun üstünə çıxaraq Peyğəmbərə yalan isnad edəcək dərəcədə həddini aşmışdır.

Məzhəb təəsübkeşliyinə bu uydurmanı misal olaraq göstərə bilərik:

*"Ümmətimdən Əbu Hənifə adında bir adam çıxacaqdır. O ümmətimin çırağıdır. Həmçinin ümmətimdən Məhəmməd ibn İdris adında biri çıxacaqdır. Onun ümmətə verəcəyi zərər Şeytanın zərərindən çox olacaqdır."*[175]

**2. İslam düşmənçiliyi**

Müsəlmanların birlik və bərabərliyini pozmaq, inanclarını zəiflətmək istəyən zindiqlər öz məqsədlərini gerçəkləşdirmək üçün müsəlmanların güc mənbəyi olan İslamı təhrif etmə yolunu seçdilər. Qurani-kərim öz ecazkarlığı ilə aşılmaz qaladır. Bunu bilən İslam düşmənləri öz mənfur məqsədlərini ancaq hədisi şəriflər üzərində həyata keçirməyi özlərinə məqsəd seçdilər. Bu fəaliyyətlərini ümumiyyətlə müsəlman örtüsü altında davam etdirməyə də əhəmiyyət verirdilər. Həmmad ibn Zeyd "Zındıqlar 14000 hədis uydurdu"-deyir. Böyük hədis alimi Şabi (vəfatı 103/721) də "Batil firqələrin ən təhlükəlisi olan rafizilər, sevdikləri və ya qorxduqları üçün deyil, müsəlmanlara qarşı duyduqları kin və nifrət səbəbi ilə, onlara pislik etmək üçün İslamı qəbul etmişdilər."-deyir. Bunlar hec bir ölçü tanımadan hədis uydurmuşlar. "Mən nəbilərin sonuncusuyam. Allahın dilədiyi xaric, məndən sonra nəbi yoxdur", "Rəbbini Minada boz bir dəvəyə minmiş halda gördüm.." kimi sözlər bu ölçüsüzlüklərinin hansı dərəcəyə çatdığını göstərir.

175 İbn Cövzi, *Mövzuat,* II, 48-49.

Bu zındıqlardan biri də xürafələr və uydurmalarla doldurduğu kitabını bir ağacın içinə qoyaraq qurğuşunla bağlamışdır. Bir müddət keçdikdən sonra meydana çıxaraq “filan yerdə bir kitab var. O kitabda yazılanlara tabe olmaq lazıdır” demə cəsarətini göstərmişdir. Həmçinin zındıqlardan Əbdulkərim ibn Əbil-Avca (vəfatı 160/776), asılmaq üzərə ikən “dininizdə halalı haram, haramı halal göstərən min hədis uydurdum” deyərək nə qədər azğın bir İslam düşmanı olduğunu etiraf etmişdir.

Onu da qeyd etmək lazımdır ki, bu İslam düşmənləri rəsmi və elmi təqib nəticəsində düşündüklərini istədikləri səviyyədə həyata keçirə bilməmişlər. Çünki bunlar İslam düşməni olaraq tanınırdılar.

**3. İslama xidmət etmə arzusu**

Qəribədir, ancaq müsəlmanları yaxşı əməllərə sövq etmək və onları pis əməllərdən çəkindirmək məqsədi ilə də hədis uyduranlar olmuşdur. Hətda bu yolla Allahın rızasını qazanmağı umanlar da olmuşdur.

Bu düşüncə ilə hədis uyduranlar din üçün ən təhlükəli olanlarıdır. Çünki bunlar xalqın sevdiyi və örnək aldığı şəxsiyyətlərdir. Onların hədis deyə tanıtdıqları sözlər tərəddüdsüz hədis olaraq qəbul ediləcək və bunun əksini ağıllarına belə gətirməyəcəklərdi. Buna görə də onlar ən azı dinə zərər vermək istəyənlər qədər zərərli olmuşlar.

Bu arada lehine hədis uydurmağı caiz görən bir anlayışdan da bəhs etmək lazımdır. Lehdə hədis uydurmağı caiz görənlər, hədis uydurmağı qadağan edən hədisdəki “aleyyə” kəlməsini “əleyhimdə”-deyə açıqlayıb lehində uyduranların bu qadağanın əhatəsinə girməyəcəyini iddia edirlər. Düşüncə və qayələri nə olursa olsun, hədis uydurmağa cəvaz verənlər, fərz və ya məndub,

haram və ya məkruh bölümlərindən birinə aid şəri bir hökmü Hz Peyğəmbərə isnad edərkən, nəticə etibarıyla Allaha qarşı yalan söyləmiş olurlar.

Məsələn Qurani-kərimin hər surəsini oxumanın başqa bir savaba vəsilə olacağını bildirən bir çox uydurma hədis hədislər arasında yer almaqdadır. Bunlardan biri belədir: *Həzrət Peyğəmbər Übey ibn Kaba xitab edərək belə demişdir: Ey Übey hər kim Fatihə surəsini oxuyarsa ona bu qədər savab verilər. Quranı sonuna qədər sırayla hər surənin fəziləti ilə əlaqəli eyni şeylər söyləmişdir."*[176]

Burdan da görünür ki, Allah üçün hədis uyduranlar və bunun qarşılığında savab gözləyənlər bu işin pis bir əməl olduğunu düşünmürlər. Hər nə qədər etdikləri iş xeyirli kimi görünsə də İslam adına xeyirli və xeyrinə deyil.

**4. Şəxsi mənfəət təmin etmə düşüncəsi**

Bəzi insanlar camaatdan mənfəət təmin etmək üçün onların xoşlarına gedəcək hədislər uydurmuşlar. Xüsusən moizəçilər camaatı məmunun etmək üçün və onlardan daha çox vəsait ala bilmək üçün həmçinin onların gözündə etibarlarını artırmaq üçün məntiqə zidd hədislər uydurmuşlar. Bunun ən bariz nümunələrindən biri Əhməd ibn Hənbəl ilə Yəhya ibn Mainin başından keçən bu hadisədir: Günlərin birində iki böyük hədis alimi Bağdadda Rusafə məscidinə gedirlər. Namazdan sonra kürsüyə çıxan bir qissəçi vaiz sənədində Əhməd ibn Hənbəl ilə Yəhya ibn Main adının da keçdiyi bir isnadla "Hər kim ləiləhəiləllah deyərsə Allah bu sözün hər kəlməsindən qursağı qızıldan və tükləri mərcandan olan quş yaradar" məzmunlu hədis rəvayət edir. Bunu eşidən İmam Əhməd ilə İmam Yəhya heyrətlə bir-birinə baxır və bir-birinə sən belə hədis rəvayət etdinmi? deyə soruşur-

176 İbn Cövzi, *Mövzuat*, II, 123-124.

lar. Hər biri bu vaxta kimi belə hədis eşitmədiklərini ifadə edirlər. Moizəci moizəsini bitirib bəxşiş toplarkən Yəhya ibn Main əliylə onu yanına çağırdı və ona "Bu hədisi sənə kim rəvayət etdi? Bu Əhməd ibn Hənbəl mən də Yəhya ibn Mainəm. Belə bir sözün Peyğəmbərə aid olduğu əsla eşitməmişik. Əgər mütləq yalan danışmalısansa bizim adımızı bu işə qarışdırma." dedi. Moizəçi ona "sən Yahya ibn Mainsən?" –deyə soruşdu. Yəhya bəli deyincə moizəçi ona "Çoxdan bəri Yəhyanın axmaq olduğunu eşitmişdim. Ancaq belə olduğunu indi daha yaxşı başa düşdüm" – deyə cavab verdi. Yəhya ona "Mənim axmaq olduğumu hardan bildin?"-deyincə moizəçi "Sanki dünyada sizdən başqa Yəhya ibn Main və Əhməd ibn Hənbəl yoxdu? Mən adı Əhməd ibn Hənbəl və Yəhya ibn Main olan on yeddi nəfərdən hədis yazdım." -dedi. Bu gözlənilməz cavab qarşısında donub qalan Əhməd ibn Hənbəl əlləriylə üzünü bağlayaraq: "Burax getsin" –dedi. Moizəçi də istehzalı hərəkətləriylə oradan ayrıldı getti.[177]

Bazardakı bəzi maddi malların qiymətlərini artırmaq üçün yalandan hədis uyduranlar və xalq arasında hörmətli bir alim qəbul edilmək üçün verdiyi fitvaları, uydurma hədisləri qəbul edənlər də mənfəətçilər arasında zikr edilməlidir.

## D. HƏDİS UYDURMA ÜSULLARI

Uydurulmuş hədis dedikdə ilk ağıla gələn hədisin formasının tam olaraq uydurulmuş olmasıdır. Ancaq bu iş hər zaman belə olmamışdır. Daha doğrusu hədis uydurmaqla məşğul olanlar çox açıq bir şəkildə hədis uydurmağa cəsarət edə bilməmişlər. Onların hərbiri fərqli yol və metodla xəyanətlərini həyata keçirmişlər. Bu yolları belə xülasə etmək mümkündür.

177 İbn Cövzi, *Mövzuat,* I, 46.

**1. Uydurmaları səhih hədislərlə qarışdırmaq**

Peyğəmbərimiz, müharibəyə gedərkən Mədinədə nəzarətçi olaraq saxladığı həzrət Əliyə: *"Musaya görə Harun nə isə, mənə görə də sən osan"*-deyə buyurduğu səhih hədisin başına, *"Mədinə ikimizdən birimizin olmadığı müddətcə düzəlməz"* qismini hədis uydurmaq ilə məşğul olan Həfs ibn Ömər ibn Dinar əl-İli əlavə etmişdir.

**2. Uydurulan sözün başına mötəbər sənəd əlavə etmək**

Bu metodu həyata keçirmək üçün gecələri yatmadan hədis uyduran kimsələr ortaya çıxmışdır. Hədis mütəxəssisləri bu cür saxtakarlıqları bir-bir müəyyənləşdirərək *"bu söz bu sənədə yamanmışdır"* kimi ifadələrlə vəziyyəti açıqlamışlar.

**3. Sənədlərindən hər hansı biri üzərində dəyişiklik etmək.**

Sənəddə yer alan bir yalançının adını çıxarmaq, sənəddəki ravilərdən biri yerinə öz adını yazmaq, özünü görüb danışmadığı birindən hədis öyrəndiyini iddia etmək, bu cür uydurmaları həyata keçirmə yollarıdır.

**4. İki hədisin sənəd və mətnlərini biri birinə qarışdırmaq**

**5. Rəvayətdə xəta etdiyini daha sonra başa düşmüş olmağına baxmayaraq, etibarını itirməmək üçün xətasında inad etmək.**

## E. UYDURMA HƏDİSLƏRİ TANIMA YOLLARI

**1. Ləfiz və ya mənadakı pozuqluq**

Hədis deyə ortaya atılan sözün leksik qaydalara uyğun olmadığı, möhtəvasının Peyğəmbər sözü və kəlamına uyğun olmaması o sözün uydurma olduğuna işarə edir. Belə ki, Hz. Peyğəmbər "Əfsahul-ərəb" ərəblərin ən gözəl danışanıydı.

Tərğib və tərhib üçün hədis uyduranların, hədisi həddindən artıq şişirtmələri və zindiqlərin gülmələrinə səbəb olacaq sözləri də, bu qrupa daxildir. Məsələn: *"Yaşıllığa və gözəl qadına baxmaq görmə qabiliyyətini artırar"* uydurması kimi...

Az əmələ görə çoxlu savab vəd edən və ya kiçik bir günaha görə şiddətli cəzalarla qorxudmaq, məna etibariylə pozuq və ölçüsüz olduğu üçün bunlar uydurma hədis olaraq qəbul edilir. Uydurulmuş sözlər ləfzdəki xətalardan daha çox, mənadakı səhv ifadə tərzinə görə təsbit edilərək şərh edilmişdur.

**2. Mötəbər hədis kitablarında yer almamaq**

Belə hədislər bu gün əldə mövcud olan mötəbər hədis kitablarında olmadığı üçün uydurma olduğuna dair dəlil qəbul edilir. Belə ki, Süyuti demişdir: *"Hədis kitablarında yer almayan, həm də müttəsil bir sənədi olmayan hədislərə bəzi moizə, təfsir, siyər və tarix kitablarında rast gəlirik... İlk dövrlərdəki hədis imamları zamanında mövcud olmayan bu sözlərin bir çoxu sonrakı dövrlərdə uydurulmuşdur".*

**3. Qurana və səhih sünnəyə zidd olmaq**

Hədis adıyla meydana atılan sözlərin Qurana və səhih sünnəyə zidd olması onların uydurma olduğunu göstərir. *"Dünyanın ömrü yeddi min ildir, biz yeddinci minilliyin içindəyik"* qoşması Qurana ziddir. Çünki Quranda Allah: *"**Səndən qiyamətin nə zaman qopacağını soruşurlar. De ki, onun zamanını yalnız Allah bilir**"*-deyə buyurmuşdur. Hz Peyğəmbər də *"Mən qeybi bilmərəm"*-deyə buyurmuşdur. Həmçinin hədis səhih olsaydı hicrətin ilk illərində qiyamət qopmalı idi. O halda zikr etdiyimiz bu xəbər Qurana və sünnəyə zidd olduğu üçün uydurmadır.

**4. Ağıla, hissiyata, müşahidəyə və tarixi hadisələrə zidd olmaq**

"Hicriətin 600-cü ildən sonra dünyaya gələn varlıqlara Allahın heç bir ehtiyacı yoxdur" uydurması ağıla, məntiqə və tarixi həqiqətlərə ziddir. Çünki, o tarixdən sonra yaşayan insanlar arasında İslama və insanlara həqiqətən qiymətli xidmətlər edən insanların sayı hesabı yoxdur.

"Soyuqdan çəkinin. Çünki qardaşınız Əbu Dərdanı soyuq öldürmüşdür." Uydurması tarixi həqiqətə ziddir. Çünki Əbu Dərdə həzrət Peyğəmbər əfəndimizin vəfatından 22 il sonra yəni hicrətin 32-ci ilində vəfat etmişdir.

## F. HƏDİS UYDURULAN MÖVZULAR

Bəzi mövzular var ki, bu barədə bütün hədislər uydurma olaraq qəbul edilmişdir. Bunları belə sıralaya bilərik:

Ağıl haqqında bütün hədislər uydurmadır. Hətta Meysərə ibn Abdirrabih ağıl mövzusundakı hədisləri əhatə edən əsər qələmə almışdır.

Həftənin müxtəlif günlərində qılınan namazlarla əlaqəli hədislərin heç birinin səhih olmadığı ifadə edilməkdədir.

Rəcəb ayının fəziləti ilə əlaqəli hədislər də uydurma və çox zəifdir.

Şaban ayının ortasındakı gecədə axşam namazından sonra "Yasin" surəsini oxumaq və dua etməklə əlaqəli hədislər hədis elmi qaydalarına görə uydurma qəbul edilmişdir.

Aşurə gününün fəziləti ilə əlaqəli hədislər,

Hümeyra (həzrət Aişənin ləqəbi) hədislərinin əksəriyyəti

Qütblər, qövslər, əbdallar, naqiblər, nəciblər kimi xəyali şəxislər və qruplarla əlaqəli səhih hədis yoxdur.

Mehdi haqqındakı hədislərin əksəriyyəti zəif və uydurmadır.

Gələcəkdə olacaq hadisələrin tarixini bildirən hədislər,

Bölgə və şəhərləri tərif edən hədislərin əksəriyyəti

Həbəşilər, Sudanlılar, mal və övlad əleyhindəki hədislər uydurmadır.

Subaylığı tərifləyən bütün hədislər,

Xoruz, göyərçin və toyuq haqqında heç bir səhih hədis yoxdur.

Mərcimək, düyü, paxla kimi dənli və bir çox çiçək bitkilərlə əlaqəli hədislər uydurmadır. Ancaq qara zirə bunlardan istisnadır.

Qarpızı tərifləyən bütün hədislər.

Ətin bıçaqla kəsilməməsi, yuxunun qadınlara danışılmaması, əqiq daşlı üzüklərini istifadəsi ilə əlaqəli hədislər uydurma qəbul edilmişdir.

Fatihə, Bəqərə, Ali imran, Nisa, Maidə, Ənam, Əraf, Tövbə, Yasin, Duxan, Mülk, Zilzal, Nasr, Kafirun, İxlas, Fələq və Nas surələri xaricindəki surələrin fəziləti ilə əlaqəli hədislər uydurmadır.[178]

## G. UYDURMA HƏDİSLƏRİN ZƏRƏRLƏRİ

Məqsəd nə olursa olsun hədis deyə uydurulub meydana atılan sözlərin İslama və müsəlmanlara böyük zərərlər verdiyi çox açıq bir şəkildə bilinməkdədir. Bunlardan bir neçəsini izah edək.

### 1. İslamı doğru anlamağa mane olmaq

Həzrət Peyğəmbər, bir yandan Quranı təbliğ etmiş bir yandan da onu lazım olan şəkildə və ölçüdə izah etmişdir. Yaşayış tərzi ilə bu ümmətinə nümunə olmuşdur. Rəsulullahın sözlərini və ya

178 Bax. Əli əl-Qari, a.g.ə. s. 97; Selman Başaran, Ali Sönmes, *Hadis Üsulu ve Tarihi,* s. 167-168.

fellərini öyrənmək İslamı tanımaq deməkdir. Bu məvzuda uydurma olaraq ortaya atılan sözlər İslamı və onun təbliğçisi olan həzrət Peyğəmbəri anlamağa mane olacaqdır. Xüsusilə də bütün sünnəyə qarşı o insanda şübhə yaradacaqdır.

**2. Dini təhrif etmək**

Ən son və ən mükəmməl din olan İslama, onda olmayan bəzi ünsürləri əlavə etmək ya da bəzi xüsusları ondan çıxarmaq bu dini təhrif etmək deməkdir. Yaxşı bilmək lazımdır ki, İslamın heç kimin yalanına ehtiyacı yoxdur.

**3. Ayrılığı körükləmək**

Müsəlmanlar arasında ayrılıq yaradmaq və müsəlmanları müxtəlif yollarla bir-birinə düşmən edən həmişə belə uydurma sözlərdir. Qrupçuluq, partizanlıq, qövmiyətçilik duyğularını körükləyən uydurmalar Məhəmməd ümmətinin birliyinə zərər vermiş və zərər verməyə davam etməkdədir.

**4. Dindən soyutmaq**

Müjdə və ya təhdid qüvvəsi yüksək və ölçüsüz olan uydurmalar ya dini əmrləri ehmal etmiş ya da dindən uzaqlaşmağa səbəb olmuşdur. Batil inancların və xürafələrin cəmiyyətdə özünə yer tapmasının əsas səbəbi də bu uydurma sözlərdir.

## H. HƏDİS UYDURMAĞIN HÖKMÜ

Həzrət Peyğəmbərin adından istifadə edərək yalan hədis uydurmaq haramdır. Hətta bu haramların ən pisidir. Çünki, *"Kim mənə nisbət edərək yalan uydursa cəhənnəmdəki yerini hazırlasın"*- hədisi bu vəziyyəti çox açıq bir şəkildə ifadə edir. Yalan onsuzda haramdır. Qaldı ki, bu haram həzrət Peyğəmbərə nisbət edilərək söylənsin.

Uydurma olduğunu bildiyi halda onu rəvayət edən, uydurma olduğunu da bəyan etməyən insan da ən böyük günahlardan birini işləmiş olar. O insan da yalançıdır. Bir insan hədisi uydurma olduğunu bilmədən nəql etsə, günah işləmiş olmaz. Ancaq, çox əhəmiyyət kəsb edən bu mövzu haqqında diqqətli olmadığı üçün çox böyük qüsur etmiş olar.

Uydurma hədisləri, müsəlmanları uzaqlaşdırmaq, dini təhrifdən qorumaq məqsədilə izah etmək və ya öyrətmək məqsədilə nəql edən insanın savab işlədiyi ehtimal olunur. Çünki, müsəlmanların bu mövzuda təlim və tədrisə ehtiyacları vardır.

Əvvəllər hədis elmində hədisi söyləyərkən, onun sənədini zikr etmək lazım idi. Ancaq Səxavinin də (vəfatı 902/1496) haqlı olaraq bildirdiyi kimi "dövrümüzdə bir şəxs hədisin sənədini verməklə onun vəziyyətini açıqlamaq borcundan qurtula bilməz. Çünki indi sənəddən hədisin uydurma olduğunu anlayan şəxs çox azdır".

## I. HƏDİS UYDURMA TƏŞƏBBÜSLƏRİNƏ QARŞI ALINAN ELMİ TƏDBİRLƏR

İslamın təbliği vəzifəsini həzrət Peyğəmbərədən almış olan "peyğəmbər varisi alimlər" bunlar arasında da xüsusi yer tutan mühəddislər, hədislərin istismarına imkan verməyəcək elmi tədbirləri almaqda səhvə və nöqsana yol vermədilər. Onların aldıqları bu tədbirlər də hədis elminin bir çox qolunun ilkin dövrdə inkişaf etməsinə və sünnətin təbiiliyinin qorunmasına səbəb oldu. İndi də qısa olaraq bu tədbirləri görək.

### 1. Səhih hədisləri müstəqil əsərlərdə toplamaq.

Hədis üsulu ölçülərinə görə sağlam sənədlərlə ümmətə ötürülmüş, həzrət Peyğəmbərə aid olmasında tərəddüd olmayan hədisləri xüsusi kitablarda birləşdirmək, uydurmaların tanınılmasında və ayrılmasında ilk elmi tədbir olaraq mənimsənilmişdir.

Yuxarıda mötəbər hədis kitablarında olmayanı, uydurmaları tanıma yollarından biri olaraq bildirmişdik.

Səhih, həsən və zəif hədisləri də əhatə edən əsərlər də yenə uydurma hədislərə qarşı alınmış dərəcə-dərəcə olan elmi nəaliyyətlərdir. Biz bu kitablardan bir qismini rəvayət məhsulları qismində və hər hədis növünü izah edərkən yeri gəldikcə bu kitabda tanıtmağa çalışacağıq.

**2. Hədis tənqidi prosesinin tətbiq olunması**

İslam alimləri, istinad sistemi tətbiqi nəticəsində həm sənəd, həm də mətn tənqidini böyük bir incəliklə həyata keçirmiş və bununla əlaqəli elmi qollar meydana gətirmişlər. Bu arada səhabə nəslindən etibarən böyük cərh və tədil ustadları yetişmiş, bunların rəvayətinə sahib olduqları şəxsləri təqib etmiş, araşdırmış, etibar olunmalarını açıqlamış və sübut etmişdir.

Cərh və tədil elmi müstəqil bir elm qolu olmuşdur. Ravini izah edərkən bu kitabda cərh və tədil əsaslarına, qaynaqlarına işarət edilmişdir.

**3. Raviləri tanıdan əsərlər yazmaq**

Hədis rəvayət edən ravilərin tam mənası ilə tanıtmaq məqsədi ilə Biyoqrafiya (tərcümeyi-hal), təbəqət, tarix və vəfayat kitabları yazılmışdır. Ayrıca cərh və tədil vəziyyətlərinə görə ayrı adlarla bilinən ravi qurupları üçün müstəqil və ya qarışıq əsərlər yazılmışdır. Müəyyən bölgələrdə yetişmiş alimlər üçün də bölgə və şəhər tarixləri ilə əlaqəli əsərlər yazılmışdır. Bu əsərlər də hədis rəvayəti ilə məşğul olan ravilərin vəziyyətlərin müəyyənləşdirir.[179]

179 Bu əsərlər haqqında məlumat üçüncü bölmədə veriləcəkdir. (mövzu hədislə əlaqəli məlumat Lütfi Çakanın *Hədis Üsulu* əsərindən alınmışdır.(s. 153-164)).

## I. HƏDİS ƏDƏBİYYATININ MEYDANA GƏLMƏ MƏRHƏLƏLƏRİ

Hədis ədəbiyatı dörd mərhələdə meydana gəlmişdir.

Əzbərləmə
Kitabət
Tədvin
Təsnif

Hədislərin əzbərlənməsi yazılması və toplanması haqqında əvvəlki bölmələrdə bəhs edilmişdi. Ancaq hədis ədəbiyyatını daha da yaxşı anlamaq üçün və bu mərhələlər önəmli olduğu üçün təkrar məlumat veriləcəkdir.

### A. HƏDİSLƏRİN ƏZBƏRLƏNMƏSİ

Hifz-səhabənin Peyğəmbər əleyhissalamdan muşafəhə (ağızdan), müşahədə (görərək) və ya səma yoluyla (başqa bir səhabədən eşidərək) almış olduğu hədisləri əzbərləmək yoluyla öyrənməsi deməkdir. Peyğəmbər əleyhissalamın dövründə başlamış və sonrakı dövrlərdə də davam etmişdir. Səhabə və sonrakı təbəqə sünnəni əhatə edən bir hədisi əzbərdən rəvayət etmiş, öyrənənlər də əzbərləmək yoluyla öyrənmişdir. Qısaca, hədislər ilk zamanlarda əzbərlənmək yoluyla muhafizə edilmişdir.

Əlbətdə ki, səhabənin hədisləri əzbərləyərək öyrənməsinə məcbur edən səbəblər vardır:

1. Bunların başında səhabənin "öyrəndiklərilə əməl etmələri" gəlir. Həqiqətən hər bir səhabə, Peyğəmbər əleyhissalamdan

eşitdiklərini və gördüklərini həyatlarında tətbiq etməyi bir prinsip olaraq qəbul etmişdir. Beləliklə onları sağlam bir şəkildə öyrənmişlər. Bu vəziyyət hədislərin yazılmasına olan ehtiyacı aradan qaldırmışdır.[180]

2. Hədislərin başqa bir insanın sözündə olmayan bir üslub və ifadə gözəlliyinə sahib olması da vacib bir faktırdır. Çünki Peyğəmbər əleyhissalama cəvamiul-kəlim xüsusiyyəti verilmişdir.[181] Sözləri hikmətli idi, nə uzun nə də qısa olurdu. Sözləri tək-tək cıxarırdı. Həzrət Aişənin ifadəsi ilə: "Yanında olan hər hansı bir şəxs sözlərini rahatlıqla əzbərləyə bilərdi."[182] Buna ayrıca cəmiyyətdə oxuma-yazma bilənlərin sayının azlığı və yazı ləvazimatlarını əldə etmənin çətinliyi də yükləndikdə, hədislərin ezbərlənməsi bu dönəmdə en yaxşı öyrənmə metodu kimi görünür.

3. Ayrıca o dövrün insanı müasir insanın düçar olduğu stress, sıxıntı və problemlərdən uzaq, sadə bir həyat tərzinə sahib idi. Bu vəziyyət onları olduqca əhəmiyyətli sayıla biləcək bir səviyyədə "hafizə və zehn saflığı" ilə təmin edirdi. Buna görə də ədəbiyyata son dərəcə düşkün olan bu insanlar içərisində bisətdən əvvəl də olduqca uzun xütbə və şerləri bir dəfə dinlədikdən sonra heç çətinlik çəkmədən əzbərləyənlər vardı. Bu xüsusiyyətdəki insanların hədisləri əzbərləməsi də son dərəcə rahat idi.

4. Dini yayma (təbliğ və dəvət) vəzifə və məsuliyyətinin o günün insanlarının zehinlərində yaxşıca yer tutması da çox əhəmiyyətlidir. Buna əlavə olaraq həzrət Peyğəmbər əleyhissalamın: *"Sözlərimi dinləyib əzbərləyən və əzbərlədiklərini də başqalarına çatdı-*

---

180 Mücteb Uğur, *Hadis İlimleri Edebiyatı,* s. 6.
181 Buxari, İtisam, 2.
182 Buxari, Mənakib, 23; Müslim, Fəzailus-səhabə, 160.

*ranların Allah üzlərini ağartsın."*[183] sözləri ilə hədislərin əzbərlənib başqalarına "təbliğ edilməsinə açıq şəkildə təşviq" etdiyi ortaya cıxır.[184]

Buna görə də, hədislərin əzbərlənərək öyrənilməsi və rəvayət edilməsi bu növ səbəblərdən ötrü məcbur hala gəlmiş və günün şərtlərinə görə uyğun bir rəvayət metodu olmuşdu. Vaxt keçdikce ilk yazılı mətnlərin ortaya çıxması və hətta müstəqil əsərlərin yazılmasına rəğmən əzbərdən rəvayət dəyərindən heç nə itirməmişdir.

## B. HƏDİSLƏRİN YAZILMASI (kitabətul-hədis)

Hədis ədəbiyyatinda "Kitabul-Hədis", "Kitabul-Elm" və "Təqyidul-Elm" kimi terminlərlə ifadə edilən hədislərin yazıyla təsbiti prosesi, sünnəyə aid məlumat və mənbələrin qorunması və sonrakı nəsillərə çatdırılması yönündən olduqca vacib bir prosesdir. Ancaq ilk zamanlarda Peyğəmbərin (s) hədislərin yazılmasına qarşı göstərdiyi tövr və ilk baxışda bir-birinə zidd kimi görünən rəvayətlər, zaman keçdikcə bu mövzudakı münaqişələrin dərinləşməsinə səbəb olmuşdur. Bu rəvayətlər üzərində aparılan münaqişələr və təhlillərə keçmədən əvvəl, o günki Ərəb cəmiyyətində yazının hansı səviyyədə olduğuna baxmaq lazımdır.

### 1. İslamdan əvvəl və sonra Ərəblərdə yazı

İslamiyyətdən əvvəl Ərəblərdə yazı tam mənası ilə inkişaf etməmişdi. Ərəblər şerlərini, sənədlərini, əsas gün və hadisələrini və nəsil (soy) məlumatlarını əhatə edən rəvayətlərə üstünlük verirdilər, ancaq bunların yazılmasına o qədər də əhəmiyyət vermirdilər. Bu məlumatların qorunmasında sətirlərdən çox

183 Əbu Davud, Elm, 10; Tirmizi, Elm, 7.
184 Çakan, *Hadis Edebiyatı*, s. 5-6.

"sədirlərə" yəni həfizəyə əhəmiyyət verirdilər. Belə ki, bir bədəvinin qəlbindəki bir hərf, kitabındakı on hərfdən daha dəyərlidir[185] şəklindəki sözləri buna işarə edir. İbn Qüteybənin bu sözləri də dövrün mədəni quruluşunu aydınlatır: "Deyilirdi ki, elmin ilk pilləsi susmaq, ikincisi dinləmək, üçüncüsü əzbərləmək, dördüncüsü anlamaq, beşincisi də yaymaqdır." Bu anlayış, Ərəb cəmiyyətində zehnin inkişaf etməsinə səbəb olmuş və bunun sayəsində onlar tarixdə ən güclü hafizəsi olan millətlərdən biri kimi tanınmışdır.

Ərəb cəmiyyətində yayğın olmasa da yazmağı bilənlər vardı. Xüsusiylə Məkkənin dini və ticari bir mərkəz olması, xaricdən gələnlərlə ticari əlaqələrin qurulması zərurəti, hər şeydən əvvəl onların yazı və hesab bilmələrini vacib sayırdı. Mənbələrdə Ərəb yazısının Məkkəyə Hiradan gəldiyi və Məkkədə sadəcə on yeddi nəfərin yazı yazmağı bildiyi qeyd edilmişdir.[186] İbn Xaldun da Ərəb yazısının İslamiyyətin ilk illərində dəqiq bir şəkildə işlənmədiyindən, gözəl bir hala gəlmədiyindən və hətta orta səviyyəyə belə çatmadığından bəhs edir. Ayrıca səhabənin yazdığı müshəflərdəki xətlərdə belə xətalar olduğunu bildirərək sağlam bir üsul və surətdə yazılmadığını qeyd edər. Quranın Ərəbləri "ümmi bir cəmiyyət" [187] olaraq tanıtması, onların ümumi olaraq oxuyub-yazma bilməyən bir cəmiyyət olduqlarına işarət etməkdədir.

Bununla birlikdə İslamiyyətin daha ilk günlərindən etibarən yazıya böyük əhəmiyyət verildiyi və yazının inkişaf etmesi və yayğınlaşması üçün böyük səy gösdərildiyi görülür. Həzrət Peyğəmbər Mədinəyə çatanda orada öncə bir came inşa etdirmiş,

185 İbn Qüteybə, *Uyunul-əxbar*, I, 122.
186 Bəlazuri, *Futuhul-buldan*, s. 456-457.
187 Cuma, 62/2.

səhabəyə oxuyub-yazmağı öyrətməsi üçün Abdullah ibn Səid ibn əl-As, Səd ibn ər-Rəbi əl-Xəzrəci, Bəşir ibn Səd və Əban ibn Səid kimi şəxsləri müəllim təyin etmişdir. Ayrıca müşriklərə qarşı Bədirdə qazanılan zəfər sonrasında ələ keçirilən savaş əsirlərinin, on müsəlman uşağa oxuyub-yazmağı öyrədənin azad edilməsi surətiylə bu fəaliyyət daha da sürət qazanmışdır. Bu calışmalar nəticəsində oxuma-yazma bilənlərin sayısı artmış və çox sayda insana katiblik edəbiləcek səviyyəyə çatmışdır. Mənbələr, Peyğəmbərin yanında daimi ya da müvəqqəti olaraq yazı yazan katiblərin sayısının təqribən əlli nəfər olduğunu qeyd etməkdədir. Bunların içərisində Ubey ibn Kab, Zeyd ibn Sabit, Muaviyə ibn Əbi Sufyan, Əban ibn Səid, Hənzələ ibn ər-Rəbi kimi adlar, Peyğəmbərin katibliyini etmis sahabədən bir neçəsidir.

**2. Hədislərin yazılması mövzusunda həzrət Peyğəmbərin mövqeyi**

İslamın ilk dövrlərində yazının olduqca önəmli yerə sahibdi. Peyğəmbər, ayələrin qeyd edilməsində və diplomatik yazışmalarda yazının işlədilməsinə böyük bir səy göstərmişdir. Hədislərin yazılması mövzusunda isə o, iki fərqli mövqedə yer almışdır. Bu mövzuda Peyğəmbərdən nəql edilən bəzi rəvayətlərə görə, "hədislərin yazılmasını qadağan etdiyi" digərlərinə görə isə "xoşgörülük göstərib sərbəst buraxdığı" başa düşülməkdədir. Xülasə, bu mövzudakı rəvayətlər, zehinlərdə təmiz bir görüntünün meydana gəlməsinə əngəl təşkil etməkdədir. Bu rəvayətlərin təhlilinə keçmədən əvvəl, bunların əhatəliyinə nəzər salmaq lazimdir.

**a. Hədis yazılmasının qadağan olmasını göstərən rəvayətlər**

Əbu Said əl-Xudri, Peyğəmbərin belə buyurduğunu rəvayət etmişdir: "*Məndən Qurandan başqa heç bir şey yazmayın. Hər kim məndən Quranın xaricində bir şey yazmişsa, onu məhv (yox) etsin.*

*Ancaq məndən yazmadan (sifahi) rəvayət edə bilərsiniz, bunda hec bir təhlükə yoxdur!. Bununla birlikdə hər kim mənə qəsdən yalan nisbət edərsə, cəhənnəmdəki yerinə hazırlansın!"*[188]

Həmçinin, Əbu Səid əl-Xudri bu mövzüda belə buyurmaqdadır: "Hədisləri yazmaq üçün Peyğəmbərdən israrla icazə istədik, ancaq O, icazə vərmədi."[189]

Əbu Hüreyrə rəvayət edirki, "Bizlər hədis yazarkən Pəyğəmbər yanımıza gəldi və \`nə yazdığımızı\` soruşdu, biz də \`özündən eşitdiyimiz hədisləri yazdığımızı\` söylədik. Bunun üzərinə: *\`Sizlər Allahın kitabından başqa bir kitab istəyirsiniz? (bunu yaxşı bilin ki) sizdən əvvəlki millətlər Allahın kitabıyla birlikdə başqa kitablar da yazdıqları üçün haqq yoldan uzaqlaşdılar!"*[190] buyurdu.

Peyğəmbər əleyhissalam tərəfindən hədis yazılmasının qadağan edilməsini göstərən bu rəvayətlərdən ikinci və üçüncü rəvayət, hədis elmlərinə görə isnaddakı bir ravinin zəiflik səbəbiylə tənqid edilmiş və məqbul yönündən səhih görülmüş olmaqla birlikdə, Buxari kimi alimlərə görə, bir xəta səbəbilə Peyğəmbərə isnad edildiyi, əslində məvquf olduğu üçün qəbul edilməmişdir.[191] Ancaq Xəttabinin də açıqladığı kimi, bu rəvayət, Quranla birlikdə eyni ləvazimat üzərində basqa bir şeyin yazılmasını qadağan edilməsini məqsədləyən mərfu/nəbəvi bir hədisdir. Beləki, Quran ayələrinin yazılı olduğu ləvazimatların sətir aralarında yaxud da kənarına yazılmış mətnləri ehtimal ki, Quranla qarışacaqdır. O halda bu rəvayətlərdən ikinci və üçüncü rəvayət hər nə qədər zəif görülmüş olsa da, birinci rəvəyət bir çox alim tərəfindən səhih

188 Müslim, Zühd, 72; Əhməd ibn Hənbəl, III, 12, 21, 39, 65.
189 Raməhürmüzi, *Mühəddisul-fasıl,* s. 5.
190 Bağdadi, *Təqyid,* s. 33.
191 İbn Həcər, *Fəthul-bari,* I, 218.

və məqbul sayılmış, habelə kitabətin qadağan edildiyi şəklində hökmə bir dəlil təşkil etmişdir.

**b. Hədis yazılmasının sərbəst buraxıldığını göstərən rəvayətlər**

Abdullah ibn Əmr ibn əl-As belə rəvayət edir: "Rəsulullahdan eşitdiyim hər şeyi əzbərləmək şərtilə yazırdım. Bir gün Qureyşlilər məni (bundan) mən etdilər və dedilər ki, Allah Rəsulundan eşitdiyin hər şeyi yazırsan. Ancaq Allah Rəsulu da bir insandir, əsəbləşəndə də sakitləşəndə də danışır. (o halda, sən bunlari necə yazarsan?). Bunun üzərinə bir müddət yazmaqdan imtina etdim. Daha sonra vəziyyəti Rəsulullaha ərz etdim. Əli ilə ağzına işarə edərək: "*Yaz! dedi, Allaha and içərəm ki buradan haqdan başqa bir şey çıxmaz*."[192]

Əbu Hüreyrə rəvayət edir ki,: "Rəsulullahın əshabı içərisində, Abdullah ibn Əmr xaric məndən daha cox hədisi olan səhabə yoxdu. Belə ki, o (hədisləri) yazır, mən isə yazmırdım."[193]

Əbu Hüreyrədən gələn başqa bir rəvayətdə, *"Ənsardan bir adam Peyğəmbərə zehnindən (hafizəsindən) şikayət edib zəif olduğunu söyləmiş oda, əlinlə (yazaraq) zehninə kömək et!"* [194] buyurmuşdur.

Əbu Hüreyrədən gələn başqa bir rəvayətə görə isə: Məkkənin fəthi meydana gəldikdən sonra Rəsulullah əshabına bir danışma etmişdi. Əbu Şah adıyla tanınan Yəmənli bir şəxs ayağa qalxaraq: "Ey Allahın Rəsulu bunu mənim üçün yazın!" dedi. Peyğəmbər də "*Onu Əbu Şah üçün yazın*" buyurdu."[195] Ənəs ibn Mali-

192 Əbu Davud, Elm, 3.
193 Buxari, Elm, 29.
194 Tirmizi, Elm, 12.
195 Buxari, Elm, 39.

kin rəvayətinə görə Peyğəmbər "*Elmi (hədisləri) yazı ilə müəyyənləşdirin*!" [196] buyurmuşdur.

Belə rəvayətlərlə bərabər, həzrət Peyğəmbər zamanında hədislərin yazıldığını göstərən daha çox məlumat və mənbə vardır. Hətta Əbu Hüreyrənin tələbəsi Həmmam ibn Münəbbihin 138 hədisdən meydana gələn Səhifəsini ən qədim orijinal nüsxələrilə günümüzə qədər gəlib çatması və M. Həmidullah tərəfindən nəşr edilmiş olması, bu mövzuda əsas bir sənəd şəklindədir. Ayrıca Peyğəmbərin, Mədinəyə hicrətinin ilk illərində yəhudilərlə etdiyi əsas sözləşmə mətni, göndərdiyi diplomatik məktublar, etdirdiyi əhali sayısını,... və.s mətnləri sağlığında yazdırmış olduğu qaynaqlarda açıqca ifadə edilməkdədir.

Bu məlumatlardan sonra belə ifadə edə bilərik ki, Peyğəmbər zamanına aid dini, hüquqi, siyasi, sosial və mədəni şeyləri (məlumatları) əhatə edən bir çox mətn səhabə tərəfindən xüsusilə qeyd edilmişdir.

Bu iki fərqli cəhətin izahı mövzusunda alimlər arasında müxtəlif fikirlərin olduğu görülməkdədir.

İbn Qüteybə, Xəttabi və Raməhürmüzi kimi alimlərə görə, bir-birinə zidd hökümləri əhatə edən bu iki rəvayət arasındakı münaqişə "nəsx" yoluyla həll edilə bilər. Buna görə, Rəsulullah tərəfindən hədislərin yazılmasının qadağan edildiyini göstərən rəvayətlər islamın ilk dövrlərinə aiddir. Ancaq əvvəllər yazı alətləri və yazı yazmağı bilənlərin sayısı çox az idi. Eyni ləvazimatlar üstündə yazılan Quran ayələri ilə hədislərin bir-birinə qarışması ehtimalı vardı. Buna görə də Peyğəmbər əvvəl hədislərin yazılmasını qadağan etdi, sonra isə icazə verdi. Bu rəvayətlərdən hədislərin yazılmasına icazə verilən hədislər,

196 İbn Abdilbərr, Cami, I, 86.

qadağan edildiyini göstərənlərin hökmünü ortadan qaldırmışdır. Nəhayət əsas hüküm hədislərin yazılmasının sərbəst olduğu şəklindədir.

İbn Quteybənin ifadə etdiyi başqa bir açıqlama isə, qadağan etmə hökmünün ümumi, sərbəst buraxma hökmünün isə xüsusi olmasıdır. Qısaca buna qəti hökmün "təxsis" edilməsi də deyə bilərik. Buna görə, yazma icazəsi hər kəs üçün deyil, ancaq Abdullah ibn Amr kimi mədəni səviyyəsi yüksək səhabələrə məxsusdur. Necəki Abdullah ibn Amr. Ərəb dili ilə yanaşı Süryani dilini də bilir və mətnləri bir-birinə qarışdırmadan oxuyub-yaza bilirdi. Onun xaricindəkilər xətasız yaza bilmirdilər. Bunun üçün peyğəmbər xəta edəcəkləri qorxusuyla digərlərinin hədis yazmasını qadağan etmişdir. Ancaq Abdullah ibn Amrın yazısından əmin olduğu üçün onun yazmasına icazə vərmişdir.

M. Rəşid Rıza da nəsxi mənimsəmiş olmaqla birlikdə, rəvayətlərdəki tarixi hadisələrlə üst-üstə düşməyən fərqli və müxalif bir izah gətirmişdir. Buna görə, hədislərin yazılmasına İslamın ilk günlərində icazə vərilmiş, daha sonrakı vaxtlarda isə qadağan edilmişdir. Rəşid Rızanın bu görüşü həqiqi bir həll yolu olmaqdan uzaqdır. Hansıkı bu rəvayətlər arasında nəsx bir həll yolu olaraq əgər qəbul ediləcəksə, nasix (yeni hökm) və mənsuxun (əvvəlki hökm) nəsxin qaydalarına uyğun bir şəkildə müəyyən edilməlidir. Bu rəvayətlər içərisində, hədisin yazılmasının sərbəst buraxıldığını göstərən "Əbu Şah rəvayəti" zaman olaraq Məkkənin fəthindən sonra meydana gəlmişdir. Həmçinin Əbu Hüreyrənin hicrətin 7-ci ilində Mədinəyə gəldiyi və hədis yazılmasının sərbəst buraxıldığına işarə edən bir neçə rəvayətin onun rəvayət etdiyini qəbul etsək, məcburi olaraq qadağanın əvvəl, sərbəst buraxmanın sonra olması lazımdır. Beləliklə Rəşid Rizanın bu görüşü nəsxin müəyyənləşdirilməsi mövzusundaki

tarixi dəlillərə tərs düşməkdədir. Bütün bu açıqlamalardan sonra Peyğəmbər dövrü və sonrasında qadağanın və sərbəstliyin səbəbi ola biləcək bir izah tərzi müəyyənləşdirmək lazımdır. Mövcud mənbələr əsasında bu izah tərzini belə müəyyən etmək mümkündür: "Hədislərin yazılması arızı ( zaman zaman ortaya çıxan ) bəzi səbəblərdən ötrü qadağan edilmiş, bu səbəblər ortadan qalxdıqda isə sərbəst buraxılmışdır." İslam alimlərinin əksəriyyəti tərəfindən müəyyən edilmiş bu səbəblər, Peyğəmbər dövründə olduğu kimi daha sonraki vaxtlarda da mövcud olmuşdur. Bunları iki əsas başlıq altında toplamaq mümkündür :

1. Yazı ləvazimatının kifayət qədər olmaması səbəbilə "ayələrlə hədislərin bir-birinə qarışma ehtimalı." Məlum olduğu kimi ilk dövrlərdə yazı yaza bilən səhabilərin böyük əksəriyyəti, ayələrin yazılması ilə məşğul idi. Bu səhabilər hədisləri də yazsaydılar ayə və hədislərin bir-birinə qarışması təhlükəsi vardı. Bu səbəblə Peyğəmbər əleyhissalam bəzi səhabilərin hədislərin yazılması ilə məşğul olmalarını istəməmişdir.

Bağdadi bu mövzuya belə təmas etmişdir: "Mənə görə ilk dövrlərdə hədislərin yazılmasının qadağan edilməsinin səbəbi, vəhy məhsulu olan nəsslərlə, vəhy məhsulu olmayanları bir-birindən ayıracaq fəqihlərin az olmasıdır. Ancaq Ərəblərin çoxu dində fəqih olmadıqları kimi, ariflərlə də birlikdə olmazdılar. Bu səbəblə tapdıqları səhifələri Quran ayəlrilə qarışdırmaqdan əmin deyildilər."

2. Hədislərin yazılması vəziyyətində "Qurana qarşı duyulan əlaqə və sevginin azalması və Quranın tərk edilməsi qorxusu."

Hədislərin yazılmasının qadağan edildiyini qəbul edən səhabə və tabiun böyüklərinin qorxunun bu olduğunu ifadə etmək olar.

Məsələn, həzrət Ömər də sünnəni qorumaq məqsədiylə hədisləri yazdırıb bir araya gətirməyi düşünmüş, əshabın seçkinləriylə müzakirə etmiş və onlardan böyük bir qisminin fikrini almışdır. Fəqət aradan bir ay keçdikdən sonra bu görüşündən vazkeçmiş və səbəbini belə açıqlamışdır: “Sizə sünnələri yazdırmaq istədiyimi söyləmişdim. Düşündüm ki, sizdən əvvəlki kitab əhli, Allahın kitabının yanında, başqa kitablar yazıb onlara meyl etmişlər və Allahın kitabını tərk etmişlər. Allaha and olsun ki, mən Allahın kitabını heç bir şeyin kölgəsi altında buraxmaram. Həmçinin səhabələr arasında həzrət Əli, Abdullah ibn Məsud, Əbu Musa əl-Əşari və Abdullah ibn Abbas kimi səhabələrin də bu istiqamətdə sözlər dedikləri rəvayət edilməkdədir.

Nəticə olaraq belə ifadə etmək olar, həm səhabə və həm də tabiun, hədislərin yazı ilə müəyyənləşdirilməsinin lazım olduğuna inanırdılar. Ancaq Quranla qarışma ehtimalı və hədislərlə məşğuliyyətin Quranı ikinci dərəcəyə düşürmə qorxusundan ötrü ilk dövrlərdə haqlı səbələrə görə bu işə müsbət baxmamışlar. Bu qorxu ortadan qalxdıqdan sonra, hədislərin yazılaraq mühafizəsi də gerçəkləşmiş oldu. Hətta Fazlur Rəhmanın da ifadə etdiyi kimi,[197] mövcud dəlillər bizə, hədislərin səhabə dövründə (yəni H. II əsrdə) hədislər əksəriyyəti hafizələrdən yazıya köçürüldüyünü göstərməkdədir.

### C. HƏDİSLƏRİN TOPLANMASI (tədvinul hədis)

“Tədvin”, lüğətdə “toplamaq, cəm etmək, dağınıq şeyləri bir araya gətirmək” deməkdir. Hədis termini olaraq “tədvin”, “hafizələrdə və səhifələrdə mövcud dağınıq vəziyyətdəki hədis mətnlərinin hər hansı bir sıralama əsas alınmadan bir araya gətirilməsi” mənasına gəlir.

197 Fəzlur Rəhman, *İslam*, s. 66.

Bu tərifdə iki önəmli xüsus diqqəti cəlb edir:

1. Yazıya köçürülməmiş hədis mətnlərinin yazıya köçürülməsi

2. Yazılmış yaxud da yeni yazıya köçürülmüş mətnləri toplayarkən hər hansı bir sıralama diqqətə almamaq. Buna görə təkcə hədisləri toplayanın yazdığı yaxud əzbərlədiyi hədislər deyil, eyni zaman da başqaları tərəfindən yazılmış yaxud əzbərlənmiş hədislərin də toplamaq əsasdır.[198]

Kitabətül-hədisdən (hədisin yazılışında) bəhs edərkən həzrət Peyğəmbər həyatda ikən bəzi səhabələrin hədisləri yazaraq "səhifə" adını vərdikləri kiçik həcmdə kitablar/cüzlər meydana gətirdiklərini ifadə etmişdik. Bunlar arasında Abdullah ibn Əmrin "əs-Sadiqə" adını vərdiyi səhifəsi və ya Əbu Hüreyrədən tələbəsi Həmmam ibn Münəbbihin yazdığı "əs-Səhihə" adlı səhifəsi ən məşhurlardır. Bunlar hər nə qədər kitabətül-hədis fəaliyyəti olaraq qəbul edilmiş olsa da, əsasən öz səviyyəsində bir tədvin fəaliyyətidir. Bu mənada həm kitabət həm də -daha sonra bəhs edəcəyimiz- təsnif fəaliyyəti müxtəlif zamanlarda fərqli məqsədlər üçün həyata keçirilmiş hədis toplama fəaliyyətləridir. Tədvindən fərqli olaraq, kitabət mərhələsində toplanan səhifələrin təkcə səhabəyə aid olduğu görülməkdədir. Səhabələr Peyğəmbər əleyhissalamdan eşitdikləri hədisləri yazmışlar, ancaq başqa səhabələrin Peyğəmbər əleyhissalamdan aldıqları hədisləri toplayıb yazmağı fikirləşməmişlər, yaxud həzrət Ömərin etdiyi kimi düşünsələr də belə bir işə təşəbbüs etməmişlər. Necə ki, Abdullah ibn Amrın, "əs-Sadiqə" adlı səhifəsinə baxmaq istəyən Mücahidə: "Bu mənim Rəsulullah əleyhissalamdan eşitdiyim əs-Səhifətüs Sadiqadır. Mən ilə Rəsulullah arasında bu hədisləri mənə rəvayət edən heç bir şəxs yoxdur" deyərkən bu səhifələri, həzrət

198 Çakan, *Hadis edebiyatı*, s. 15.

Peyğəmbərdən birbaşa eşitmiş olduğu hədislərdən meydana gətirdiyinə açıq şəkildə işarə etmişdir. Bu növdən hədis toplama fəaliyyətləri həzrət Peyğəmbər və səhabə dövründə görünməyə başlamış olsa da, hədislərin məqsədə uyğun tədvin fəaliyyəti hicrətin I əsrinin sonlarına doğru başlamış və hicrətin II əsrin başlanğıcında tamamlanmışdır. ( h. 80-120 )

Böyük Tabiun dövrü deyilən bu dövrdə hədislərin tədvinini məcburi edən bəzi səbəblərdən bəhs etmək mümkündür. İbn Həcər tədvini məcburi edən səbəblərdən belə bəhs edir: "...həzrət Peyğəmbərin hədisləri, səhabə və tabiunun öndə gedənlərinin dövründə tədvin və tərtib edilməmişdi. Bunun iki əsas səbəbi var idi: Birincisi, Quran ayətləriylə qarışma təhlükəsi; ikincisi də səhabə və tabiunun hafizələrinin qüvvətli olması və bir çoxunun yazı yazmağı bilməməsi idi. Hədisləri bilən səhabələrin islam ölkəsinin hər tərəfinə yayılması üzərinə Xarici, Rafizi və Qədərilər kimi cürbəcür firqələrin ortaya atdığı bidətlər yayılmağa başladı. Haqq ilə batil bir-birinə qarışmağa üz tutdu. Bu səbəblə tabiun dövrünün sonlarında hədislər tədvin edildi. İbn Həcər vərdiyi bu bilgilərə isnad edərək hədislərin tədvinini gərəkdirən səbəbləri belə sıralamaq olar :

1. İslam ölkəsinin genişləməsilə birlikdə, hədis bilənlərin bir-birindən uzaq və müxtəlif şəhər və bölgələrə dağılmış olması.

2. Rafizilik və Xaricilik kimi siyasi cərəyanlarla, Qədəriyə, Mürciyə və Mötəzilə kimi etiqadi məzhəblərin ortaya çıxması və İslami əsaslar arasında yeni olmayan bidətlərin çoxalması.

3. Nəticədə, İslami həqiqətlərlə sonradan ortaya çıxan bir sıra batil ünsürlərin bir-birinə qarışması.

4. Ən əsası, bunlarla paralel olaraq hədis uydurma hərakatının başlaması, xüsusilə sünnənin önündə fövqəladə önəmli bir təh-

lükə olaraq ortaya çıxmışdır. Bu təhlükə bərtəraf edilməzsə "hədislərin tamamən yox olacağı qorxusu" ortaya çıxmışdır.

Məhz belə bir vəziyyət qarşısında, hədisçilər cərh və tədil fəaliyyətini başladaraq hədis rəvayət edənləri çox sıx bir şəkildə tənqidə tutulması və nəticədə hədisdə güvənilir olanlarla olmayanları ayıraraq hədislərin səhihi baxımından ayırd edilməyə çalışılmışdır.[199] Hədisçiıər bu fəaliyyəti davam etdirərkən elmi, fiqhi və təqvası ilə bilinmiş, hədis rəvayəti ilə də təmayüz etmiş xəlifə Ömər ibn Əbdüləziz (vəfatı 101), səhih hədislərin sadəcə bir kitabda toplanması halında mühafizə ediləcəyini, xüsusilə hədislərin tezliklə toplanmasını bildirmiş və Mədinə valisi Əbu Bəkr ibn Həzmə (vəfatı 120) yazdığı bu məktubda rəsmi mənada ilk tədvin (toplama) fəaliyyətini başlatmışdır. "Həzrət Peyğəmbərin hədislərini ( Amr ibn Abdurrahmanın rıvayət etdiyi hədislərlə birlikdə ) və sünnələrini incələ və yaz!. Çünki mən alimlərin ölüb getmələrindən və elmin yox olmasından qorxuram."[200]

Xəlifə Ömər ibn Abduləziz hədislərin tədvini üçün Mədinə valisinə göndərdiyi bu təlimatı, digər valilərə və hədislə məşğul olan alimlərə də göndərdiyi başa düşülməkdədir.

Xəlifənin bu əmrini alanlardan biri də İbn Sihab əz-Zöhridir (vəfatı 124). Malik ibn Ənəsin ifadəsinə görə, o, "hədisləri ilk tədvin edən şəxsdir".[201] Necə ki özü də "Bu elmi məndən qabaq heç bir şəxs tədvin etməmişdir."[202] "Ömər ibn Abduləziz bizə sünnələrin toplanmasını əmr etdi; biz də ona dəftər-dəftər yazdıq. O da idarəsi altında olan yerlərə bu dəftərlərdən bir nüsxə

199 Talat Koçyiğit, *Hadis Tarihi*, s. 203.
200 Buxari, Elm, 34; Darimi, Müqəddimə, 43.
201 İbn Əbdilbərr, *Camiu bəyanil-ilm*, I, 76.
202 Kəttani, *Risalətul-müstədrəfə*, s. 4.

göndərdi."[203] deyərək buna açıqca işarə etmişdir. Zührinin tədvin məqsədi ilə yazdığı bu hədislərin çox olması səbəbi ilə sadəcə heyvanlarla daşına biləcəyi ifadə edilməkdədir. Hətta həyat yoldaşı onun kitablarının çoxluğundan şikayət edərək, yazdığı bu kitabların üç kumaya bədəl olduğunu söyləmişdir.

Bu məlumatlar, xəlifənin tədvinlə əlaqəli əmrini ilk həyata keçirən şəxsin Zühri olduğunu göstərməkdədir. Ancaq burada diqqət edilməsi lazım olan bir xüsus var ki, Zöhri hər nə qədər hədislərin ilk müdəvvini olaraq qəbul edilmiş olmasa da, bu, rəsmi mənada belədir, yoxsa bu daha öncə belə bir fəaliyyətə heç kəs girmədi, bu fəaliyyəti sadəcə o həyata keçirmişdir mənasına gəlmir. Hədis kitabətinin ( yazılması ) hələ həzrət Peyğəmbərin həyatda ikən başladığı və gedərək yayğınlaşdığı, göz önündə olursa, tabiun arasında kitabəti yaxşı görməyən bəzi şəxslər olmaqla bərabər, səhabədən eşitdikləri hədisləri yazan şəxslərin olduğu inkar edilə bilməz. Onların bu fəaliyyətlərini də tədvin içərisində mütaliə etmək lazım olur. Bununla birlikdə Zührinin ilk müdəvvin olaraq tanınması, onun bu sahədəki fəaliyyətinin daha geniş və daha səmərəli olmasından ötrüdür.[204]

Nəticə etibari ilə, hədislərin itirilməsinin və onlara xarici təsirin qarşısını almaq sabəbiylə h. I əsrin sonu II əsrin əvvəlində (təqribən 50 il ) davam edən tədvin fəaliyyətinin sonunda hədislər, bir tərəfdən rəvayət edilərək yazılmış, digər bir tərəfdən də yazılmış olan mətnlər toplanmış və bir araya gətirilmişdir. Xüsusiylə hədis ədəbiyyatının kitablaşmış ən qədim müstəqil əsərləri bu vaxtda ortaya çıxmamışsa da, daha sonra ortaya çıxacaq əsərlər üçün önəmli bir alt təbəqə təşkil etmişdir.

203 İbn Əbdilbər, e.a.ə., I, 76.
204 Köçyiğit, e.a.ə., s. 204

## D. KİTABLARIN SİNİFLƏNDİRİLMƏSİ

Hədislərin tədvininylə birlikdə sadəcə asan bir şəkildə toplanmış olan hədis mətnlərindən faydalanmanın və axtarılan bir hədisi bunlar arasında tapmaq nə qədər çətin olduğu anlaşılmaqdadır. Elə bu çətinlik, tədvinin başlanğıcından az bir vaxt sonra hədisçilər tərəfindən maraq çəkmiş və bu toplanmış ləvazimatdan daha asan bir şəkildə faydalanmaq surətiylə, hədislərin mövzularına görə tərtib və təsnif edilməsi fəaliyyətinə başlanılmışdır.

"Təsnif", lüğətdə "sinifləndirmək", "qruplara ayırmaq", "eyni cinsdən olan şeyləri bir araya gətirmək" kimi mənalara gəlir. Hədis terminologiyasında isə "müdəvvən haldakı hədis mətnlərinin ravilərinə, yaxud mövzularına görə müəyyən şərtlər diqqətə alınmaq surətiylə sinifləndirilməsi" deməkdir.[205] Buradan anlaşıldığına görə, təsnif tədvindən sonrakı mərhələdir. Tədvin fəaliyyətindən sonra toplanmış olan hədis ləvazimatları, müəyyən bir sistem içərisində mövzular və şəxslər əsas alınmaq surətiylə bölmələrə ayrılmışdır. Beləliklə təsnif, tədvindən sistem, əhatə və zaman olaraq fərqli bir mahiyyət daşımaqdadır.

Təsnif dövrünün nə zaman başladığını müəyyənləşdirmək üçün, bu səbəblə yazılmış ilk əsərlərin nə zaman ortaya çıxdığına baxmaq lazımdır. Raməhürmüzi və İbn Həcərin bu mövzuda verdiyi bilgilərə görə, hədisləri ilk dəfə mövzularına (bablarına) görə təsnif edənlər arasında, Bəsrədə Səid ibn Əbu Ərubə (vəfatı 156) və Rəbi ibn Süheyl (vəfatı 160), Məkkədə Abdülməlik ibn Cüreyc (vəfatı 150) və Yəməndə Mamər ibn Rəşid (vəfatı 152) kimi, şəxslər yer almaqdadır. Bu məlumatlar açıqca göstərir ki, hədislərin mövzularına görə təsnif edilməsi, Zöhri ilə başlayan tədvin fəaliyyəti ilə birlikdə yaxud həmən arxasında yəni h. II əsrin başlanğıcında

205 Çakan, *Hədis Edebiyatı,* s. 18.

baş vermişdir. Amma bu şəxslərin vəfat tarixlərinə baxıldığında, bunların hicrətin 124-cü ildə vəfat edən ilk müdəvvin Zöhrinin vaxtında yaşadıqları anlaşılmaqdadır. Nəticə etibari ilə təsnif fəaliyyətinin tədvinlə birlikdə başladığını, ya da ən azından dəqiq xəttləriylə bu iki fəaliyyəti bir-birndən ayırmanın asan olmadığını söyləyə bilərik.[206]

Hər nə qədər tədvin və təsnif fəaliyyətləri arasında dəqiq zaman fərqi müəyyən edilməmişsə də, bunların ayrı-ayrı fəaliyyətlər olmadığını ifadə etməz. Lakin hər ikisinin başlanğıc tarixlərinə nəzər salsaq, bir-birindən fərqli olduğunu gərərik. Bunula bərabər bəzi qərb alimlərinin, tədvin ilə təsnif arasındakı fərqi idrak edə bilmədikləri görülür. Şərqşünas İ. Goldziher, mənbələrdə tədvin ilə təsnifin başlanğıc tarixlərinə baxaraq verilən bu bilgilərin ixtilaflı olduğunu, xüsusilə tədvinin daha sonrakı zamanlarda başladığını iddia edir. Hətta bu zaman, Zöhrinin tədvin fəaliyyətlərini heç diqqətə almadan h. III əsrin əvvəllərinə qədər götürməkdədir. Goldziher, ayrıca bu zamanda təsnif edilmiş əsərlərə sahib olunmadığını və onlar haqqında hökm verilə bilməyəcəyini irəli sürərək, ilk müsənnəf əsərin Buxarinin (vəfatı 256) "Səhihi" olduğunu iddia etməkdədir.[207]

İslam mənbələrində həm tədvin, həm də təsnif ayrı-ayrı mənalarda işlənmişdir. Tədvinlə hədislərin kitablarda toplanması, təsniflə də tədvin edilmiş hədislərin müəyyən mövzulara sinifləndirilməsi nəzərdə tutulmuşdur. Buna görə də, hər iki zaman üçün fərqli tarixlərdən bəhs edilmiş və tədvinin təsnifdən daha əvvəl olduğu müəyyənləşdirilmişdir. Həmçinin bu gün artıq "təsnifin ilk zamanlarına aid əsərlərin əldə mövcud olmadığı" nəzəriyyəsini qəbul etmək imkanı da qalmamışdır. Çünki ilk

206 Çakan, e.a.ə., s. 18
207 Çakan, e.a.ə., s. 18 (Muslim Studes, II, 216-dan nəqlən)

müsənniflərdən Məmər ibn Rəşidin (vəfatı 152) "əl-Cami" adlı əsəri yazma nüsxələri və çap olunmuş halıyla əldə mövcuddur. Bu əsər, h. II əsrin başlarında gerçəkləşdirilən təsnif fəaliyyəti haqqında kifayət qədər məlumat verir. Habelə ilk təsnif edilən əsərin Buxarinin (vəfatı 256) Səhihi olduğu iddiası, açıqca yüz illik təsnif fəaliyyətlərinin tamamını rədd etmək mənasına gəlməkdədir. O halda təsniful-kutub mərhələsini, tədvinin son zamanlarında ortaya çıxmış və tədvinlə birlikdə aparılmış bir fəaliyyət olaraq qəbul etmək lazımdır.

Təsnif fəaliyyəti, kitabət və tədvinlə müqayisə edildiyində, ən uzun zaman dövrü xüsusiyyətini daşımaqdadır. H. II əsrin ilk yarısından etibarən IV əsrin ortalarına qədər davam etdiyi görülür. Bu zaman zərfində fərqli xüsusiyyətlərə sahib çox sayda hədis kitabı təlif edilmişdir. Məşhur Kutubi-Sittə müəlliflərinin əsərlərini yazdıqları h. III əsr, "hədis tarixinin qızıl çağı" olaraq adlandırılmışdır. Təsnif dövrünün ən tanınmış misalları arasında bunları qeyd etmək mümkündür :

1. Malik ibn Ənəsin (vəfatı 176) "əl-Muvəttası",
2. Abdurrəzzaq ibn Həmmanın (vəfatı 211) "əl-Müsənnəfi",
3. Əhməd ibn Hənbəlin (vəfatı 241) "əl-Müsnədi",
4. Buxarinin (vəfatı 256) "əl-Camius- Səhihi",
5. Müslimin (vəfatı 261) "əl-Camius-səhihi"
6. Tirmizinin (vəfatı 279) "əs-Sünəni",
7. Əbu Davudun (vəfatı 275) "əs-Sünəni",
8. Nəsainin (vəfatı 302) "əs-Sünəni",
9. İbn Macənin (vəfatı 273) "əs-Sünən" adlı əsəri...

Ancaq burada bir nöqtəyə nəzər yetirmək lazımdır. Belə ki, hədis ədəbiyyatını meydana gətirən mərhələlər (əzbərləmə, kita-

bət, tədvin və təsnif) arasında ən uzun dövrü əhatə edən təsnif dövrüdür. H. II əsrin əksəriyyəti, hədis ədəbiyyatının qızıl dövrü olaraq adlandırılan hicri üçüncü əsr və orjinal hədis ədəbiyyatının məhsullarının son nümunələrinin verildiyi dördüncü əsrin ilk birinci rübü bu dövrə aiddir.




## II. TƏSNİF DÖVRÜ HƏDİS ƏDƏBİYYATI

Təsnif dövründə əsasən iki sistemə təsadüf edilir. Bunlardan biri hədisi rəvayət edən səhabənin isimlərinə görə sıralanmasını (alər-rical), ikincisi də mövzularına görə (əlal-əbvab) təsnif etməsini əsas alan əsərlərdir.

Şübhəsiz təsnif sistemləri, müsənniflərin məqsədlərinə uyğun şəkildə meydan gəlmişdir. Bu məqsədlər də təbii olaraq fərqlilik

ifadə edir. Bu fərqlilikləri də nəzərə alaraq təsnif sistemlərinə təmas etmək istəyirik.

## A. ƏLƏR-RİCAL TƏSNİF SİSTEMİ

Bu sistemdə səhabi ravilər, müxtəlif özəlliklərinə görə sıralanır və hər birindən rəvayət edilən hədislər, mövzularına diqqət edilmədən adlar altında cəm edilir.

Kriteriya olaraq da, səhabilərin müsəlman olma zamanı və həzrət Peyğəmbərə yaxınlıq dərəcələri əsas təşkil edir. Məsələn: Əbu Davud ət-Təyalisi (vəfatı 204/819) və Əhməd ibn Hənbəl (vəfatı 241/855) *Müsnəd*lərində əşərəyi mübəşşirədən ilk xəlifə həzrət Əbu Bəkirin müsnədi ilk sıradadır.

Bu sistemin məqsədi, hədis mətnlərini olduğu kimi mühafizə etmək, ricalə aid rəvayətləri bir yerə toplamaq və hökm istinbatı[208] üçün bir yerə cəm etməkdir.

Müsnədlərlə bərabər möcəmlər də bu sistemə daxildir. Ancaq, mucəmlərdə, müsənnifin xacələri ya əlifba sırasına görə, yaxud da qəbilələrinə görə sıralanır.

Etiraf etmək lazımdır ki, bu sistem, araşdırıcıya, hansı ravilərin hansı hədisləri rəvayət etdiyini müəyyənləşdirməkdən savayı başqa rahatlıq təmin etmir.

Bu sistemlə yazılmış əsərlərə ümumiyyətlə müsnəd və möcəm adı vərilir. Biz də bu bölmədə bu sistemlə yazılmış əsərlərdən ən məşhurlarını örnək olaraq təqdim edəcəyik.

---

208 Quran və sünnə nasslarını anlaya bilmə və onlardan hökm çıxarma cəhdi. (Mehmet Erdoğan, *Fıkıh və Hukuk Terimleri Sözlüğü*, s. 213)

## 1. MÜSNƏD

Bu tərtibdə yazılan əsərlər üçün bunu deyə bilərik; "İlk dövrdə səhabilərdən kəsiksiz sənədlə rəvayət edilən hədisləri Müsnəd adı vərilən əsərlərdə ələr-rical sisteminə görə tərtib etmək faydalı idi. Çünki Müsnəd müəlliflərinin məqsədi, ləfizlərin əzbərlənməsi və hökm istinbat etmək üçün hədisləri bir araya cəm etmək idi. O dövrdə, hədisləri əzbərləməyə qarşı müsəlmanların həddindən artıq marağı və arzusu vardı. Məsələn hər hansı bir şəxs, Qurandan səhifə əzəbərlər kimi bir səhabinin rəvayətlərini (məsanidi) əzbərləyirdi. Çünki onlar əzbərə etimad edirlər və hədislərin kitablardakı yerlərini və mövzularını da çox yaxşı bilirdilər.

Bu metodla yazılan ən məşhur əsər Əhməd ibn Hənbələ (vəfatı 241/855) aid olan Müsnəd adlı əsəridir. Bu əsəri daha geniş həcimdə tanıyaq:

### a. Əhməd ibn Hənbəl və Müsnədi

Əhməd ibn Hənbəl Şeyban qəbiləsindəndir. həzrət Peyğəmbər nəslindəndir. 164-cü ildə Bağdadda doğulmuşdur. Abbasilərin ən parlaq dövründə Bağdadda məskunlaşmışdır. Kiçik yaşlarından yetim olaraq elm təhsil etməyə başlamışdır.

Əhməd ibn Hənbəl h. 186-ilindən etibarən elmi səfərlərə çıxmışdır. Əvvəl Bəsrə sonra da Kufə, Vasit və Məkkə kimi elmi mərkəzlərə səfər etmişdir. O Məkkədə İmam Şafiinin dərslərində iştirak etmişdir.

Əhməd ibn Hənbəl səfər əsnasında öz alın təri ilə qazanaraq yaşamışdır. Özünü sevən müəllimlərindən belə maddi kömək qəbul etməmişdir. 40 yaşında h. 204 cü ildə Bağdadda dərs vərməyə başlamış və böyük nəaliyyətlər əldə etmişdir. Buxari, Müslim və Əbu Davud kimi məşhur hədis mütəxəssisləri ondan elm öyrənmişlər.

Xəlifə Məmun dövründə Quranın məxluqluğu məsələsindən ortaya çıxan mihnədən Əhməd ibn Hənbəl də payına düşəninə sinə gərmişdir. O, xəlifənin bu mövzudakı əmrlərinə qarşı çıxdı. Bunun üçün də 18 ay həbs edildi. Bu hadisədən ötrü 150 məmur tərəfindən qamçılanmış və biləyi qırılmışdı. Fəqət əsla fikrindən dönmədi. Bişr Xəfi, Əhməd ibn Hənbəl haqqında, "Allah, Əhmədi təmiz qızıl olaraq çıxdığı atəşin içinə atdı" deyir. O, özünə işgəncə edənlərə əleyhinə çıxmadı və onları bağışladı.

Əhməd ibn Hənbəl həpisdən çıxdıqdan sonra 8 il daha yaşadı və 77 yaşında 241-ci ildə vəfat etdi. Cənazə namazında 250-600 min nəfərə yaxın camaatın iştirak etdiyi ifadə olunur.

**Müsnəd**

Bu əsər Müsnədu Əhməd ibn Hənbəl olaraq da məşhurdur. Son illərdə əl-Əlbani tərəfindən hazırlanan fihrisdə görə 904 səhabədən rəvayət edilən 40 minə yaxın hədis ehtiva edir. Tərtib metodu olaraq hər səhabi üçün ayrı-ayrı fəsillər ayrılmış və müəllifin o səhabiyə çatan təriqindən rəvayət edilən hədislər bir yerə toplanmışdır. Müsnədu Əbi Bəkr, Müsnədu Ömər ibn Xəttab kimi.

Müsnədin bölmələri ümumiyyətlə səhabənin islam dinini qəbul etmədəki öncəliklərinə görə, sonra qəbilə, daha sonra da coğrafi mövqe əsas alınaraq bəzi səhabilərin yerləşdikləri şəhərlərə görə tərtib edilmişdir. İlk müsnədlər əşərəyi mübəşşirə əshabı və onlara yaxın olan səhabənin müsnədləridir. Sonra Əhli beyt və Bəni Haşimə mənsub səhabilərin müsnədləri yer alır.

Yuxarıda da qeyd etiyimiz kimi Əhməd ibn Hənbəlin müsnədi 40 minə yaxın hədis ehtiva edir. Bunlardan 10 minə yaxını təkrardır. Həmmam ibn Münəbbihin, Əmr ibn Əsin, Səmurənin və Əbi Sələmənin hədis səhifələri də müsnəddə yer alır.

Əhməd ibn Hənbəl bu əsəri 750 min hədisdən seçərək 200–228 illər arasında təlif etmişdir. Müsnəddə 337 sülasi rəvayət yer alır.

Əlimizdə mövcud müsnəd Əhməd ibn Hənbəlin oğlu Əbu Əbdürrəhman Abdullah ibn Əhmədin rəvayət etdiyi nüsxənin Əbu Bəkr Əhməd ibn Cəfər əl-Qati tərəfindən edilən rəvayətidir. Bu şəxslərin ikisi də müsnədə əlavələr etmişdir.

Əhməd ibn Hənbəl əsərinə aldığı hədislərin hamısının səhih olduğunu iddia etməmişdir. Ölüm döşəyində ikən də o, oğlundan müsnədindəki bir hədisi çıxartmasını istəmişdir.

Oğlu Abdullah müsnədi atasından ümumiyyətlə səma, qismən ərz, qismən vicadə, bəzi rəvayətləri səma, ərz, bəzilərini də səma, vicadə metodu ilə rəvayət etmişdir.

Əbul-Fərəc İbnul-Cövzi Hənbəli məzhəbinə mənsub olmasına baxmayaraq, Əhməd ibn Hənbəlin müsnədində 15 dənə uydurma hədisin olduğunu bildirməktədir. Bu əslində müsnədə xələl gətirməz. Çünki 40 min hədisdən 15 nin uydurmanın olması təbiidir.

**Müsnədə Yazılmış Şərhlər**

Müsnəd əsas alınaraq yazılan əsərlərin ilk sırasında Əhməd Əbdürrəhman əs-Səatii nin bablara ayıraraq yazdığı *Fəthur-rəbbani ki tərtibi Müsnədi imam Əhməd ibn Hənbəl əş-Şeybani* adlı əsəridir. Müəllif əsəri yeddi bölməyə ayıraraq hər birinə kitab adı vərmişdir.

Səati daha sonra bu əsərə şərh yazdı. Bu şərhin adı, *Büluğul əmani min əsraril-Fəthir-rəbbani*dir. Bu əsərlərin hər ikisi bir yerdə nəşr edilmişdir. [209]

209 Digər çalışmalar üçün bax. Çakan, *Hadis Edebiyatı,* s. 38-39.

## 2. MÖCƏM

Hədis ədəbiyyatında ələr-rical sisteminə görə yazılmış əsərləri ikinci növünü möcəm adlı əsərlər təşkil edir. Hədis alimləri, hədislərin səhabə, şeyxlər (hədis müəllimlər) və ya bölgələrə görə, ümumiyyətlə əlifba sırasına görə sıralandığı əsərlərə möcəm deyirlər.

Əslində müsnədlərin xüsusiyyətlərini daşmasına baxmayaraq, ilk dönəmlərdən etibarən hədis ədəbiyyatında möcəmlər ayrı olaraq incələnmiş və bu xüsusiyyətə malik bir çox əsər qələmə alınmışdır.[210] Burada bunların ən məşhuru olaraq qəbul edilən Təbəraninin möcəmləri haqqında məlumat veriləcək.

### a. Təbərani və Möcəmləri

Məşhur təfsir, hədis və fiqh alimlərindən olan, Süleyman ibn Əhməd ibn Əyyub ibn Mütayr əş-Şami ət-Təbərani 873 (H.260) ilinin Səfər ayında Şamın Təbəriyyə qəsəbəsində doğulmuşdur.

Təbərani, ömrünün ilk otuz ilini elmi səyahətlərlə keçirmişdir. Hədis təhsili üçün Suriyə, Misir, İran və Ərəbistandakı elmi mərkəzləri gəzərək mindən çox müəllimdən hədis rəvayət etmişdir. Ömrünün son qismini İsfəhanda keçirərək yüz yaşına qədər elm öyrətmiş və əsərlər təlif etmişdir.

970 (h.360) ilində 100 yaşında İsfəhan şəhərində vəfat etmişdir.

Hədis ədəbiyyatında möcəm deyiləndə Təbəraninin üç möcəmi ağla gəlir.

#### 1) Möcəm əl-kəbir

Təbəraninin əsərlərindən ən böyüyü Möcəmül kəbir adlı əsəridir. Bu əsər əşərəyi mübəşşirədən başlayaraq, qadın, kişi fərqi qoymadan, həzrət Peyğəmbərdən hədis rəvayət etdiyi, müəllifə

210 Bu əsərlərin hamısı üçün bax. Kəttani, *Risalə,* s. 112-114.

çatan səhabilərin əlifba sırasına görə sıralanmaq surəti ilə meydana gətirilmişdir. Əsər 12 cilddən ibarətdir. Hədis sayısı təqribən 25 min olaraq ifadə edilir. Sadəcə möcəm deyiləndə Təbəraninin bu əsərindən bəhs edilir.

Müəllif şəxsən özü, hər səhabidən 1, 2, 3 və ya daha çox hədis aldığını, muqillundan olanların isə bütün rəvayətlərini nəql etdiyini əsərin ön sözündə bildirməkdədir.

Möcəmül-kəbir, Ələddin Əbul-Həsən Əli əl-Hənəfi tərəfindən ələl-əbvab sistemi halına çevirmişdir.

Möcəmül-kəbirin Kütübi-Sittədən artıq olaraq ehtiva etdiyi hədislər (zəvaid), Nurəddin əl-Heysəminin *Məcməuz-zəvaid və mənbəül-fəvaid* adlı əsərində yer almaqdadır.

**2) Möcəm əl-əvsat**

Altı ciltlik bu əsərdə Təbərani hədis müəllimlərini əsas almışdır. Bu əsərdə şeyxlər əlifba sırasına görə sıralanıibn Əsərdə sayıları iki minə yaxın olduğu bildirilən şeyxlərinin nadir rəvayətlərindən otuz min qədər hədis yer alır.

Təbərani bu əsər üçün “o mənim ruhumdur” deyir. Ancaq hədislərin bir qismi zəifdir.

Əsər Mahmud Tahhan tərəfindən təhqiq edilərək nəşr edilmiş əsərdə 9485 rəvayət var.

**3) Möcəm əs-səğir**

Şeyxlərinin hər birindən ümumiyyətlə bir hədis nəql edərək meydana gətirdiyi bu əsərdə müəllif, müəllimlərinin adlarını əlifba sırasına görə sıralayır. Əsərin sonlarında bəzi şeyxlərindən birdən çox hədis rəvayət etdiyinə də təsadüf etmək mümkündür.

Əsər iki cild halında 1968 ci ildə Mədinə də nəşr edilmişdir.

## B. ƏLƏL-ƏBVAB TƏSNİF SİSTEMİ

Bu sistemdə hədislər, raviləri nəzərə alınmadan, ifadə etdiyi məna əsas alınaraq təsnif edilir. Bu sistemdə, hər hansı mövzu ilə əlaqədar əsas və ikinci dərəcəli hədisləri bir arada tapmaq mümkündür. Metodun əsas məqsədi, hədisləri uyğun olduğu mövzulara təsnif edərək onlar üçün ayrı ayrı bablar təxsis etməkdir.

Bu sistemlə meydana gəlmiş əsərlərin ümumi adı *Müsənnəf*dir.

Hədis ədəbiyyatında özəl yerə sahib olan **Camilər, Sünənlər** və bunlara bağlı olaraq qələmə alınan **müstədrək, müstəxrəc, zəvaid** kimi əsərlər də bu sistemə daxildir.

### 1. Müsənnəflər

Hədisləri mövzularına görə təsnif edən əsərlərə müsənnəf adı vərilir. Kütübi-Sittənin ən mükəmməl örnəklərini vərən müsənnəf növ əsərlər, sistemli hədis kolleksiyasını meydana gətirirlər.

Müsənnəf əsərlər olmasına baxmayaraq Cami, Sünən və Müsənnəf adlı əsərlər bəzi xüsusiyyətlərinə görə biri birindən fərqlənir. Beləki;

Dini mövzularla əlaqəli bütün hədisləri ehtiva edən əsərlərə **Camii** adı verilmişdir.

Təharətdən vəsiyyətə qədər bütün fiqhi hədisləri cəm edən əsərlərə **Sünən** deyilmişdir.

Sünəndəki mərfu hədislərə əlavə olaraq məvquf və məqtu hədisləri ehtiva edən əsərlərə də **Müsənnəf** adı vərilmişdir.

İndi də təsnif sisteminin ilk bölməsinə aid qəbul edə biləcəyimiz müsənnəf növünə aid iki əsərə nəzər salaq.

### a. İmam Malik və Müvəttə adlı əsəri

Ən çox yayılan dörd fiqhi məzhəbindən birinin imamı olaraq tanınan İmam Malik hicrətin 93-cü (miladi 711-712) ilində Mədinədə anadan olmuşdur. Ətbaut-tabiin nəslindəndir.

Kiçik yaşında Quran hafizliyini ikmal etdi. Quranı əzbərlədikdən sonra da Rəsulullahın hədislərini əzbərləməyə və elm təhsil etməyə başladı. İmam Malik, hədis və rəvayət, fiqh və rəy elmlərini təhsil etdi. Əlli il müəllimlik etmişdir.

İmam Malikin ayaqda hədis rəvayət etməkdən xoşu gəlməzdi. Hədis dərsi üçün xüsusi hazırlıq edərdi. Yuyunar, gözəl ətirlər sürtər, təmiz və təzə libaslarını geyinər, xüşu içində əyləşərdi.

Hicrətin 179-cu ilində miladi 795-ci ildə 85 yaşında Mədinədə vəfat etmişdir.

**Müvəttə**

Müvəttə kütübi-tisə[211] arasında yer alır. Ələl-əbvab təsnif sisteminə gərə təsnif edilmiş əsərlər arasında yer alır. Ancaq camilər növünə daxil ediləcək qədər əhatəli və sünənlər kimi də sadəcə fiqhi mövzuları əsas alan əsər deyil.

Müvəttə əsəri əvvəllər on min hədisi ehtiva edirdi. Ancaq hər dəfə kitabı gözdən keçirərək bəzi hədisləri çıxartmışdır. Nəticədə əlimizdə mövcud, 1720 hədisdən ibarət əsər qaldı. Müvəttədə mərfu hədislərlə bərabər məvquf və məqtu hədislər də yer almaqdadır. 1720 hədisdən

600-ü müsnəd (mərfu),

222-i mürsəl,

211 Kütübi-tisə, kütübü-sittəyə əlavə olaraq Əhməd ibn Hənbəlin Müsnədi, Dariminin Sünəni və İmam Malikin Müvəttəsini əhatə edən əsərlər toplusudur.

613-ü məvquf,

285-i də məqtudur.

Bu təsnifatda da görüldüyü kimi İmam Malik öncə Peyğəmbərin rəvayətlərinə sonra əshabın, daha sonra da tabiunun xəbərlərinə yer verir. Ən sonunda da öz rəyini bildirir.

Burada bir nöqtəyi qeyd etmək lazımdır ki, İmam Malik Mədinə xaricinə çıxmadığı üçün görüşlərinə yer vərdiyi əshab və tabiunun hamısı Mədinəlilərdir.

Malikin ən ali sənədi sünai (2-li) dir.

**Müvəttənin şərhləri**

Müvəttə üzərinə ilk zamanlardan bəri çalışmalar davam etmişdir. Bu əsərlər arasında Süyutinin (vəfatı 911/1505) *"Tənvirul-həvaliq"* adını daşıyan şərh çalışması müvəttə mətni ilə birlikdə iki cild olaraq nəşr edilmişdir.

Müvəttənin Baci (vəfatı 494/ 1100) tərəfindən qələmə alınan *"əl-Müntəqa"* adlı əsəri də ən məşhurlardan biridir. Bu əsər yeddi cilddir.

**2. Camelər**

Ələl-əvbab təsnif sisteminə görə yazılmış ikinci növ əsərlər hədis ədəbiyyatında "came" adıyla bilinir.

Came xüsusiyyətini daşıyan əsərlər bütün dini mövzuları ehtiva edir. Eyni zamanda camilər islamın düşüncə və fikir quruluşunu təsvir edir.

Bir əsərin cami hesab edilməsi üçün səkkiz fəsli əhatə etməlidir. "Kitab" olaraq bilinən bu fəsilləri belə sıralaya bilərik:

**1. İman:** İnamla (iman, islam, tövhid, etisam) əlaqəli fəsillər bu bölmədə yer alır. (Kəlam elmi)

**2. Ehkam** və ya **Sünən:** Təharətdən vəsiyyətə qədər ibadət və muamilələrə dair mövzular bu bölmədə yerləşir. (Fiqh bilgisi)

**3. Riqaq** və ya **Zöhd:** Əxlaq və nəfs tərbiyyəsi ilə əlaqəli mövzular bu bölmədədir. (Təsəvvüf bilgisi)

**4. Ətimə** və **Əşribə** və ya **Ədab:** Bəşəri münasibətlər və gündəlik həyatında hamının etdiyi işlərin İslama uyğun qaydalarını öyrədən hədislər bu bölmədə yer alır. (Fiqh və Sosyologiya)

**5. Təfsir:** Ayələri müxtəlif cəhətlərdən açıqlamasını ortaya qoyan hədislər burada yerləşir. (Təfsir elmi)

**6. Tarix, siyər, cihad:** Beynəlxalq münasibətlər, müharibə və sülh, savaşlar, cihad və cihadla əlaqəli digər mövzuları əhatə edən bölmələr burada yerləşir. (İslam Tarixi bilgisi)

**7. Mənakib:** həzrət Peyğəmbər, digər peyğəmbərlər və əshabın həyat tərzi və üstün cəhətləri haqqında məlumatlar bu bölmədə yerləşir. (Biyografiya elmi)

**8. Fitən** və **Məlahim:** Gələcək və gələcəklə əlaqəli hadisələrdən və qiyamət əlamətlərinə aid mövzular bu bölmədə yer alır. (Kəlam və Tarix elmi)

Camelər bu bölmələrdən əlava başqa mövzularla əlaqəli bölmələri də ehtiva edir. Ancaq yuxarda saydığımız bölmələrdən əgər bir belə əksik olarsa, o əsər cami olma xüsusiyyətindən məhrum qalar. Buna görə də Müslimin əsərində təfsir bölməsi nöqsan və sistemli olmadığı üçün, bəzi alimlər bu əsəri cami olaraq qəbul etməmişlər.

Camelər eyni zamanda “səhih” adıyla da adlandırırlır. Məsələn, Buxari, Müslim və Tirmizinin kitablarının adı “Camius-səhih”dir.

Tirmizinin əsəri möhtavasına görə cami olaraq qəbul edilmişdir. Ancaq hədis ədəbiyyatında “sünən” olaraq da məşhurdur.

Bu bölmədə təsnif dövrü hədis ədəbiyyatı içində önəmli yerə sahib olan camilər haqqında məlumat vəriləcəkdir.

**a. Buxari və Camius-səhih adlı əsəri**

Məhəmməd ibn İsmail ibn İbrahim əl-Buxari hicrətin 194-cü ilində şəvval ayının 13-ü Buxara şəhərində anadan olmuşdur. On yaşından etibarən hədis əzbərləməyə başlamışdır.

O, uşaq ikən kor olur. Anası gecə-gündüz oğlu üçün dua edir və Uca Allah onun görmə qabiliyyətini qaytarır. Anası hicrətin 210-cu ilində onu və qardaşı Əhmədi Həccə aparır və hədis elminə olan həvəsinə görə onu Məkkə şəhərində qoyub gedir. Tarixçilər qeyd edirlər ki, o zaman əl-Buxari artıq yetmiş min hədis əzbər bilirdi. Artıq 18 yaşında o “Tarix” kitabını yazır. Sonralar hədisləri toplamaq üçün o Şam, Misir, Bəsrə, Hicaz, Kufə, Bağdad və bir çox başqa yerlərə səyahət edir.

Mindən çox müəllimdən dərs almışdır. Əzbərlədiyi hədis sayısı, öz ifadəsi ilə, yüz min səhih cəmi üç yüz mindir.

Hicrətin 256-cı ilində şəvval ayının 1-i, 62 yaşında Səmərqənddə vəfat etmişdir.

Buxarinin hədis biliyini, zamanın alimləri insaf hüdudlarını aşacaq şəkildə yoxlanmışlar. Bir dəfə 100 hədisin sənəd və mətni bir-birinə qarışdırılaraq Buxariyə təqdim edilir. Buxari isə bunların hamısını əzbərindən düzəltmiş və soruşanları heyran qoymuşdur.

**1) Buxarinin hədis alma şərtləri**

**1. Sənəddə olan bağlılıq (sənədin müttəsil olması).** Yəni sənədin əvvəlindən (hədisi rəvayət edən şəxsdən) axırına (səhabələrə) qədər olan ravilər hədisi biri-birindən (hər biri hədisi ona rəvayət edən şəxsdən bilavasitə) eşitməlidir.

**2. Ravilərin ədalətli olması (ravinin adil olması)**. Yəni hər bir ravi həddi-büluğa çatmış, şüurlu, Allah və Onun elçisinə müti olan, əxlaqlı müsəlman olmalıdır.

**3. Ravilərin mühafizəkarlığı (ravinin zəbt sahibi olması)**. Yəni hər bir ravi eşitdiyi hədisi olduğu kimi qəlbində (əzbərdən) və ya yazılı şəkildə (dəyişdirilməməsi üçün) mühafizə etməlidir.

**4. Rəvayətlər arasında ziddiyyətin olmaması (rəvayətin şaz olmaması).** Yəni hər hansı bir ravinin rəvayət etdiyi hədis başqa ravilərin və ya ondan da üstün olan ravinin rəvayət etdiyi hədisə zidd olmamalıdır.

**5. Rəvayətdə illənin olmaması (hədisini illətli olmaması).** Yəni hədisin mətnində və ya sənədində onu zəiflədən gizli amil olmamalıdır.

**6. Eyni əsrdə yaşamaq.** Yəni hər bir ravi hədisi ona rəvayət edən şəxslə eyni əsrdə yaşamalıdır.

**7. Rastlaşma.** Yəni hər bir ravi hədisi ona rəvayət edən şəxslə bir dəfə də olsa belə rastlaşmalıdır.

**Camius-səhih**

Əsərin tam adı *əl-Camıiul-müsnədus-səhihul-muxtasar min umuri Rəsulillah və sünənihi və əyyamih*dir. Bu əsərinin yazılma səbəbini müəllif belə açıqlayır:

– O (Buxari) rəvayət edir ki, biz İshaq ibn Rəhuyanın yanında idik. O bizə dedi: “Yaxşı olardı ki, Peyğəmbərin (s) sünnəsi barəsində səhih kitab tərtib edəsiniz”. Onun təklifi çox xoşuma gəldi və “əl-Cəmius-səhih” kitabını tərtib etməyə başladım.

– O rəvayət edir ki, bir dəfə mən Peyğəmbəri (s) yuxuda gördüm. Əlimdəki yelpiklə onu yelpikləyir və üzərinə qonan milçəkləri ondan uzaqlaşdırırdım. Alimlərdən gördüyüm yuxu barəsində soruşduqda onlar mənə dedilər ki, sən Peyğəmbərin (s) adından istifadə olunaraq uydurulan rəvayətləri ondan uzaqlaşdıracaqsan. Bu da mötəbər hədisləri cəm etməyim üçün bir səbəb oldu.

Buxari Səhihini 600.000 hədisdən seçərək meydana gətirmişdir. Concordance-a görə 97 kitab və 3730 babdan meydana gəlməkdədir. Təkraralar daxil 7275 hədis ehtiva edir. İbn Həcər bu sayını 9082 olaraq verməkdədir. Təkrarlar xaric 4000-ə yaxın hədis vardır. İbn Həcər bu sayını da 2791 olaraq qeyd edir.

Təlif səbəbindən də aydın olduğu kimi Buxarinin Səhihində zəif hədis yoxdur. Bu əsər, səhih hədisləri toplamaq üçün təlif edilmişdir. Ancaq Buxari bəzən bab başlığında zəif hədislərə yer verir. Bu hədisləri sənədsiz olaraq qeyd edir. Bu hədislərdəki zəiflik xəfif bir zəiflikdir.

Buxari ümumiyyətlə bab başlıqlarında ayə və hədislərdən bəzən də fiqhi anlam ifadə edən ifadələrdən istifadə etmişdir. Buna görə də (فقه البخارى في تراجمه) “Buxarinin fiqhi görüşləri bab başlıqlarındadır” deyilmişdir.

Buxarinin bir hədisi 13 yerdə təkrar etdiyinə təsadüf etmək mümkündür. Hər dəfəsində də fərqli-fərqli sənədlərlə rəvayət edir. Beləcə həm hədisi gücləndirir həm də ləfz fərqliliyi vasitəsi

ilə fərqli hökmlərin əldə edilməsini təmin edir. Bəzən də qərib kəlmələri açıqlayır.

Buxarinin səhihində 22 ədəd sülasi rəvayət yer alır. Buxarinin ən nazil isnadı doqquzludur.

Buxari, hədis kitablarının birinci təbəqəsinə daxildir.

**Camius-səhihə yazılmış şərhlər**

Buxarinin kitabına 100 dən çox şərh yazılmışdır. Bunlardan günümüzdə ən məşhurları bunlardır:

1. Kirmani (vəfatı 388/1384), *əl-Kəvakibud-dərari*

2. İbn Həcər (vəfatı 852/1448), *Fəthul-bari*

3. Ayni (vəfatı 855/1451), *Umdətül-qari*

4. Kəstəllani (vəfatı 923/1517 ), *İrşadus-sari*

**b. Müslim və Camius-səhih adlı əsəri**

Əbul-Hüseyin Müslim ibnul-Həccac əl-Quşeyri hicrətin 204-cü ilində Nisabur şəhərində anadan olmuşdur. Məşhur Ərəb qəbiləsi olan Quşeyri qəbiləsindəndir.

Uşaq ikən hədis elmini çox sevirdi. Təhsilini ilk dəfə yaşadığı şəhərdə olan alimlərdən mənimsəmişdir. Sonralar o, Peyğəmbərin (s) hədislərini toplamaq üçün İraq, Şam, Misir, Hicaz, Xorasan, Bağdad və bir çox başqa yerlərə səyahət etmişdir.

İmam Müslim təhsilini başa vurduqdan sonra Nisaburda məskunlaşdı. Burada ticarətlə həyatını təmin edərək daima hədislə məşğul oldu. Ömrünün sonlarına doğru İmam Buxari ilə tanışdı. O dönəmdə bəzi siyasi səbəblərə görə hər kəs Buxaridən uzaqlaşarkən, İmam Müslim onu tərk deyil, əksinə ona dostluq etdi və onun elmindən faydalandı. Hətta öz müəllimi Zühlinin “kim məsələtül- ləfz mövzusunda Buxari ilə eyni fikrə sahibdirsə bizim

məclisimizdən ayrılsın”-deməsinə baxmayaraq hər kəsin gözü qarşısında İmam Müslim məclisi tərk etdi. Zühlidən dinlədiyi hədisləri bir zənbilə dolduraraq ona geri qaytardı. Buna görə Səhihində Zühlidən heç bir rəvayət yoxdur.

Hətta Müslim, Buxaridən də heç bir rəvayətə əsərində yer vərməmişdir.

İmam Müslim, hədis araşdırmaqla məşğul ikən, 261/874-cü ildə, Rəcəb ayının 2-si Nisabur şəhərində vəfat etmişdir.

**Müslimin hədis alma şərtləri**

**1. Sənəddə olan bağlılıq**. Yəni sənədin əvvəlindən (hədisi rəvayət edən şəxsdən) axırına (səhabələrə) qədər olan ravilər biri-birindən (hər biri hədisi ona rəvayət edən şəxsdən bilavasitə) eşitməlidir.

**2. Ravilərin ədalətli olması**. Yəni hər bir ravi həddi-büluğa çatmış, şüurlu, Allah və Onun elçisinə müti olan, əxlaqlı müsəlman olmalıdır.

**3. Ravilərin mühafizəkarlığı**. Yəni hər bir ravi eşitdiyi hədisi olduğu kimi qəlbində (əzbərdən) və ya yazılı şəkildə (dəyişdirilməməsi üçün) mühafizə etməlidir.

**4. Rəvayətlər arasında ziddiyyətin olmaması**. Yəni hər hansı bir ravinin rəvayət etdiyi hədis başqa ravilərin və ya ondan da üstün olan ravinin rəvayət etdiyi hədisə zidd olmamalıdır.

**5. Rəvayətdə illənin olmaması.** Yəni hədisin mətnində və ya sənədində onu zəifədən amil olmamalıdır.

**6. Eyni əsrdə yaşamaq.** Yəni hər bir ravi hədisi ona rəvayət edən şəxslə eyni əsrdə yaşamalıdır.

**Camius-səhih**

O, bu kitabı bir əsas səbəbə görə yazmışdır. Belə ki, tələbələrindən biri (Xətib əl-Bağdadi “Tarixu-l-Bağdad”[212] əsərində bu tələbənin Əhməd ibn Sələmə ən-Nisaburi olduğunu qeyd etmişdir) ondan səhih hədisləri bir kitabda cəm etməsini xahiş edir. Müslim onun bu xahişini nəzərə alıb “əl-Müsnədus-səhih” əsərini tərtib edir.

Bu əsərin xüsusiyyətlərini belə sıralaya bilərik:

1. Səhihi-Müslim adı ilə də məşhur olan bu əsəri İmam Müslim 300.000 hədisin içindən seçərək ərsəyə gətirimişdir.

2. Müəllimlərindən rəvayət etdiyi hədisləri “həddəsəna” termini ilə, özünün müəllimlərə oxuyaraq düzəltmələr etdiyi rəvayətləri də “əxbərəna” termini ilə rəvayət etmişdir.

3. İxtisar və ya başqa bir səbəbə görə Müslim kitabını bablara ayırmamışdır. Ancaq sonra İmam Müslimin əsərinə şərh yazan İmam Nəvəvi tərəfindən bablara ayrılmışdır. Günümüzdəki bablar İmam Nəvəvi tərəfindən qoyulan bablardır.

4. İmam Müslimin kitabına aldığı hədislər, ümumuiyyətlə Buxaridəki mərfu hədirlərdir. O, Buxaridə olmayan 820 mərfu hədisi də kitabına almışdır.

5. Sünən kimi Müslimin Səhihində də çox az məvquf və məqtu hədis yer alır. Bu hədislərin sayı 192-dir.

6. İmam Müslim Səhihində nə etdiyini müqəddiməsində açıqlamışdır. Kütübi-sittədə Müslimdən başqa heç bir əsərdə bu xüsusiyyət yoxdur.

212 Xətib Bağdadi, *Tarixul-Bağdad,* IV, 186.

7. Bəzi hədisləri bir neçə dəfə təkrar etmişdir. Bu hədislər 137 dənədir.

8. Müslim bir hədisin bütün təriqlərini, mütəaddid (çox sayıda) isnadlarla və əlfazı müxtəlifəsi ilə bir yerə toplamışdır. Toplama əsnasında ən əvvəl mütqin (təqva sahibi) olan hafizlərin rəvayətlərinə, daha sonra hifz və təqvada vasat (orta dərəcəli) olan ravilərin rəvayətlərinə, sonra da zəif və mətrukun rəvayətlərinə yer vərmişdir. Beləcə mövzu ilə əlaqəli bütün mətnlər diqqətə alınaraq hökm istinbat etmək də asanlaşır.

9. Mütəaddid isnadla gələn tək mətn üçün sənədlərin dəyişdiyi yerə (ح) hərfini qoyaraq bu vəziyyəti bildirir.

10. Bir hədisin mətninin bənzəri, yuxarıdakı sıralamaya görə daha aşağı dərəcədəki ravilərdən olan sənədlə gəlmişsə, o sənədləri qeyd etdikdən sonra mətnin yerinə, "misləhu" və ya "nahvəhu" deməklə kifayətlənir.[213]

11. Əsərdə 54 kitab və 1322 bab var. Təkrarlar xaric 3033 hədis yer alır. Bablar İmam Nəvəvi tərəfindən qoyulmuşdur.

12. Təfsir bölməsi tam və sistemli olmadığı üçün Müslimin Səhihini "Cami" saymaq istəməyənlər də vardır.

13. Sülasi sənəd yoxdur. Varsa da Səhihinə qoymamışdır.

14. Buxaridən heç bir rəvayət yoxdur.

**Müslimin səhihinə yazılmış şərhlər**

Müslimin Səhihinə 30 qədər şərh yazılmışdır. Bunlardan ən məşhurları bunlardır:

1. Qazı İyaz (vəfatı 544/1149), *İkmalul-mulim bi fəvaid Müslim*

213 Bu məsələyi bilmək Səhihi-Müslim ilə məşğul olanlar üçün vacibdir. Çünki bu ləfizlərə çox təsadüf edilir.

2. Əbu Zəkəriyyə Yəhyə ibn Şərəf ən-Nəvəvi (vəfatı 676/1277), *əl-Minhac fi şərhi Səhihi Müslim İbnul-Həccac*

3. Cabir Derbendi Dehli (vəfatı 1353/1934), *Fəthul-mülhim bi şərhi Səhihi Müslim*

Müslimin Səhihi M. Sofuoğlu tərəfindən türk dilinə tərcümə edilmişdir. Əhməd Davudoğlu tərəfindən də tərcümə və şərh edilmişdir.

**c. Səhiheyn**

Hədis ədəbiyyatında Buxari və Müslimin səhihlərinə "iki səhih hədis kitabı" mənası ifadə edən " Səhiheyn" deyilir.

Bu iki kitab üzərində bəzi elmi çalışmalar edilmişdir. Bu çalışmalardan ən məşhurları aşağıdakılardır:

1. Bu iki əsərdən hər ikisinin yaxud da birinin şərtlərinə uyğun olduğu halda, bunlarda yer almayan hədisləri cəm etmək üçün edilən çalışmalar vardır. Bu metodla ərsəyə gətirilən əsərlərə **"Müstədrək"** adı verilir. Müstədrəklərdən ən məşhuru Hakim ən-Neysaburinin (vəfatı 405/1014) *"əl-Müstədrək əla kitabis-səhiheyn"* adlı əsəridir. Əsər 4 cilddir.

2. Səhiheyndə olan bəzi müşkilləri aradan qaldırmaq üçün də bəzi əsərlər qələmə alınmışdır. İbn Kurkulun (vəfatı 569/1174) *"Sərhu müskilis-Səhiheyn"* ilə Səlahəddin Xəlil əl-Əlainin (vəfatı 761/1359) *"Müskilus-Səhiheyn"* əsərləri bu növə misal təşkil edir.

3. Bu iki kitabda yer alan hədisləri başqa sənədlərlə də varid olduğunu göstərmək üçün də bəzi çalışmalar edilmişdir. Bu növ əsərlərə "**Müstəxrəc"** deyilir. Səhiheyn üzərinə 9 nəfər müstəxrəc yazmışdır.

4. Səhiheynin ittifaqla təxric etdikləri hədisləri bir yerə toplayan əsərlər də vardır. Məhəmməd Fuad Əbdülbaqinin *"əl-lülü vəl-mərcan fimat-təfəqa əleyhş-şeyxan"* adlı əsər bunun ən gözəl örnəyidir.

**Səhiheynin müqayisəsi**

İslam alimləri tərəfindən Qurani kərimdən sonra ən mötəbər kitab olaraq Buxarinin Səhihini gəbul etmişlər. Buxarinin Müslimdən üstün cəhətlərini belə sıralaya bilərik:

1. Buxarinin səhihlik şərtləri daha güclüdür.

2. Ravinin, hədis aldığı şəxslə bir dəfə belə olsa görüşməyi, yəni mülaqatı şərt olaraq qəbul edir. Müslim isə, görüşməyi deyil, görüşmə ehtimalını və ya imkanının olmasını kifayət görür.

3. Buxarinin ravilərinin ədalət və zəbt cəhətləri, Müslimin ravilərindən daha güclüdür. Çünki, Buxarinin ricalında cərhə məruz qalanlar daha azdır.

4. Buxaridə tənqid olunan hədislər daha azdır.

5. Müslim Buxarinin tələbəsidir. Onun əsərlərindən istifadə etmişdir. Buna görə də Darəkutni, *"əgər Buxari olmasaydı, hədis elmində Müslim olmaz və bu mərtəbyə çıxa bilməzdi"*-demişdi.

6. Tənqidə ən az məruz qalan kitab Buxarinin kitabıdır. Əhməd ibn Hənbəl, Yəhyə ibn Məin, Əli ibn Mədini kimi alimlər dörd hədis xaric Buxaridəki bütün hədislərin səhih olduğuna şəhadət etmişlər.

**d. Tirmizi və Camius-səhih adlı əsəri**

Məhəmməd ibn İsa ibn Səvər ət-Tirmizi 209/827-ci ildə Tirmizdə anadan olmuşdur.

Tirmizi, Ərəbistan, İran və Xorasan kimi elmi mərkəzlərə hədis öyrənmək üçün səyahət etmişdi. O, Buxari, Müslim, Əbu Davudla görüşmüşdür. Ömrünün sonuna yaxın kor olmuşdur. O, 279/892-ci ildə Tirmizdə vəfat etmişdir.

**Camius-səhih**

Tirmizinin ən məşhur əsəri Sünənüt-tirmizi olaraq tanınan Camius-səhih əsəridir. Tirmizinin bu əsəri kütübi-sittənin üçüncü kitabıdır. O, kitabı haqqında *"Kimin evində bu kitab varsa orada danışan Peyğəmbər var deməkdir"*-deyərək onu tərifləmişlər. Həmçinin onun haqqında "iki hədis xaric" əsərdəki bütün hədislər məmulun bihdir (hökmü ilə əməl edilə bilər) demişdir.

Təharətdən iləlbe qədər 46 kitab ehtiva edir. Concordance-a görə Camidə 2496 bab vardır. A. M. Şakirin təhqiq etdiyi əsərdə 3956 hədis vardır.

Digər müəlliflərin "kitab" ismini vərdikləri fəsillərə Tirmizi "əbvab" ismini vermişdir. Məsələn, "əbvabut-təharə" kimi.

Bab başlıqları qısa və açıq-aydındır. Həmçinin bablarda fiqhi görüşlər də yoxdur. ümumiyyətlə bab başlıqlarında, burada yer alan hədislərdəki ifadələr yer alır. Buna görə də hədislərlə bab başlıqları arasındakı münəsibəti müəyyənləşdirmək çətin deyildir. Bab isimlərində ayələrdən nadir olaraq istifadə edilmişdir.

Görüş fərqlilikləri olan mövzulara aid bab başlıqlarında "həl" və "keyfə" kimi sual ədadlarından istifadə edilmişdir. Aralarında nəsx olan hədislərdən birinci mənsux olanı bir babda, ardından da nasixi digər babda ifadə edilərək arxa-arxaya sıralanmışdır.[214] Misal:

بَاب فِي النَّهْيِ عَنْ اسْتِقْبَالِ الْقِبْلَةِ بِغَائِطٍ أَوْ بَوْلٍ

214 Təharət fəsli 6-7, 8-9, 58-59, 61-62 də bunu görmək mümkündür.

حَدَّثَنَا سَعِيدُ بْنُ عَبْدِ الرَّحْمَنِ الْمَخْزُومِيُّ حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ عَنْ الزُّهْرِيِّ عَنْ عَطَاءِ بْنِ يَزِيدَ اللَّيْثِيِّ عَنْ أَبِي أَيُّوبَ الْأَنْصَارِيِّ قَالَ قَالَ رَسُولُ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا أَتَيْتُمْ الْغَائِطَ فَلَا تَسْتَقْبِلُوا الْقِبْلَةَ بِغَائِطٍ وَلَا بَوْلٍ وَلَا تَسْتَدْبِرُوهَا وَلَكِنْ شَرِّقُوا أَوْ غَرِّبُوا

قَالَ أَبُو أَيُّوبَ فَقَدِمْنَا الشَّامَ فَوَجَدْنَا مَرَاحِيضَ قَدْ بُنِيَتْ مُسْتَقْبَلَ الْقِبْلَةِ فَنَنْحَرِفُ عَنْهَا وَنَسْتَغْفِرُ اللَّهَ قَالَ أَبُو عِيسَى وَفِي الْبَاب عَنْ عَبْدِ اللَّهِ بْنِ الْحَارِثِ بْنِ جَزْءٍ الزُّبَيْدِيِّ وَمَعْقِلِ بْنِ أَبِي الْهَيْثَمِ وَيُقَالُ مَعْقِلُ بْنُ أَبِي مَعْقِلٍ وَأَبِي أُمَامَةَ وَأَبِي هُرَيْرَةَ وَسَهْلِ بْنِ حُنَيْفٍ قَالَ أَبُو عِيسَى حَدِيثُ أَبِي أَيُّوبَ أَحْسَنُ شَيْءٍ فِي هَذَا الْبَابِ وَأَصَحُّ

بَاب مَا جَاءَ مِنْ الرُّخْصَةِ فِي ذَلِكَ

حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى قَالَا حَدَّثَنَا وَهْبُ بْنُ جَرِيرٍ حَدَّثَنَا أَبِي عَنْ مُحَمَّدِ بْنِ إِسْحَقَ عَنْ أَبَانَ بْنِ صَالِحٍ عَنْ مُجَاهِدٍ عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ قَالَ نَهَى النَّبِيُّ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ نَسْتَقْبِلَ الْقِبْلَةَ بِبَوْلٍ فَرَأَيْتُهُ قَبْلَ أَنْ يُقْبَضَ بِعَامٍ يَسْتَقْبِلُهَا

وَفِي الْبَاب عَنْ أَبِي قَتَادَةَ وَعَائِشَةَ وَعَمَّارِ بْنِ يَاسِرٍ قَالَ أَبُو عِيسَى حَدِيثُ جَابِرٍ فِي هَذَا الْبَابِ حَدِيثٌ حَسَنٌ غَرِيبٌ

Bir bölmədə bir neçə hədisdən sonra aşağıdakı nöqtələr qeyd olunur:

1. Hədisin sağlamlığı (Həsən, səhih, zəif, qərib olduğu) mütləq ifadə olunur.

2. Ravilərin vəziyyəti və varsa sənəddəki illəti açıqlayır.

3. Hədisin digər təriqləri qeyd olunur.

4. Mövzu ilə əlaqəli digər səhabilərin də rəvayətləri varsa, onlara da “ və fil-babi an fulanin və fulan” deyərək, səhabi isimlərini qeyd edərək işarə edir.

5. Qeyd olunan mövzu ilə əlaqəli fəqihlərin görüşlərini, hədisdən necə hökm çıxardıqlarını, alimlər arasında ittifaq və ya ixtilaf olduğunu izah edir.

6. Birləşdirdiği sənədlərdə ortaq olan ilk isimdən sonra (ح) hərfini qoyar və məna fərqliliklərini qeyd edir.

Misal,

حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ حَدَّثَنَا أَبُو عَوَانَةَ عَنْ سِمَاكِ بْنِ حَرْبٍ ح و حَدَّثَنَا هَنَّادٌ حَدَّثَنَا وَكِيعٌ عَنْ إِسْرَائِيلَ عَنْ سِمَاكٍ عَنْ مُصْعَبِ بْنِ سَعْدٍ عَنْ ابْنِ عُمَرَ عَنْ النَّبِيِّ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ لَا تُقْبَلُ صَلَاةٌ بِغَيْرِ طُهُورٍ وَلَا صَدَقَةٌ مِنْ غُلُولٍ

قَالَ هَنَّادٌ فِي حَدِيثِهِ إِلَّا بِطُهُورٍ قَالَ أَبُو عِيسَى هَذَا الْحَدِيثُ أَصَحُّ شَيْءٍ فِي هَذَا الْبَابِ وَأَحْسَنُ وَفِي الْبَاب عَنْ أَبِي الْمَلِيحِ عَنْ أَبِيهِ وَأَبِي هُرَيْرَةَ وَأَنَسٍ وَأَبُو الْمَلِيحِ بْنُ أُسَامَةَ اسْمُهُ عَامِرٌ وَيُقَالُ زَيْدُ بْنُ أُسَامَةَ بْنِ عُمَيْرٍ الْهُذَلِيُّ [215]

Tirmizi hədislərin fərqli sənədlərini qeyd etdikdən sonra mətni təkrar etmir. Müslim kimi "nahvəhu", "misləhu" ifadələrini, bəzən də "nəhvə həzə" ifadəsindən istəfadə edir. Misal:

حَدَّثَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ عَنْ مَالِكِ بْنِ أَنَسٍ عَنْ طَلْحَةَ بْنِ عَبْدِ الْمَلِكِ الْأَيْلِيِّ عَنْ الْقَاسِمِ بْنِ مُحَمَّدٍ عَنْ عَائِشَةَ

عَنْ النَّبِيِّ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ مَنْ نَذَرَ أَنْ يُطِيعَ اللَّهَ فَلْيُطِعْهُ وَمَنْ نَذَرَ أَنْ يَعْصِيَ اللَّهَ فَلَا يَعْصِهِ

حَدَّثَنَا الْحَسَنُ بْنُ عَلِيٍّ الْخَلَّالُ حَدَّثَنَا عَبْدُ اللَّهِ بْنُ نُمَيْرٍ عَنْ عُبَيْدِ اللَّهِ بْنِ عُمَرَ عَنْ طَلْحَةَ بْنِ عَبْدِ الْمَلِكِ الْأَيْلِيِّ عَنْ الْقَاسِمِ بْنِ مُحَمَّدٍ عَنْ عَائِشَةَ عَنْ النَّبِيِّ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ نَحْوَهُ... [216]

215 Təharət, 1.
216 İman, 2.

Tirmiziyə aid görüşlər Camidə, “qalə Əbu İsa” deyə ifadə edilmişdir.

Tirmizinin camisinin son kitabı “iləl”dir. Bu sadəcə Tirmiziyə aid bir xüsusiyyətdir. Digər kitablarda bu xüsusiyyətə təsadüf edilmir. Əsərin sonunda yer almasına baxmayaraq müqəddimə xarakteristikası daşıyır.

Tirmizidə tək bir “sülasi” sənədli hədis yer alır.

حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ مُوسَى الْفَزَارِيُّ ابْنُ بِنْتِ السُّدِّيِّ الْكُوفِيّ حَدَّثَنَا عُمَرُ بْنُ شَاكِرٍ عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ

قَالَ رَسُولُ اللَّهِ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ يَأْتِي عَلَى النَّاسِ زَمَانٌ الصَّابِرُ فِيهِمْ عَلَى دِينِهِ كَالْقَابِضِ عَلَى الْجَمْرِ

قَالَ أَبُو عِيسَى هَذَا حَدِيثٌ غَرِيبٌ مِنْ هَذَا الْوَجْهِ وَعُمَرُ بْنُ شَاكِرٍ شَيْخٌ بَصْرِيٌّ قَدْ رَوَى عَنْهُ غَيْرُ وَاحِدٍ مِنْ أَهْلِ الْعِلْمِ[٢١٧]

Tirmizinin hədisini sağlamlığını qeyd edərkən istifadə etdiyi bəzi terminlər bunlardır:

*(Səhihun Qəribun)*: “Hədis tək sənədli olmasına baxmayaraq səhihlik dərəcəsinə çatmışdır” deməkdir.

*(Həsənun Qəribun)*: “Hədis nə səhih nə də zəifdir. Əksinə hədis həsən lizatihidir” deməkdir.

*(Həsənun Səhihun)*: “ Hədisin bir neçə sənədi vardır. Hədis həm həsən, həm də səhihdir. Belə ki, bir sənəddən səhih, bir sənddən də həsəndir” deməkdir.

*(Həsənun, Səhihun Qəribun)*: “Hədis həsən və səhih olmaqla bərabər, bəzi təriqlərində qərabət vardır” deməkdir.

217 Fitən, 73.

Əbdüləziz əd-Dihləvi (vəfatı 1239/1824) Tirmizinin əsərini dörd xüsusiyətinə görə təriflənməkdədir:

1. Tərtibi mükəmməldir və təkrar yoxdur.

2. Fəqihlərin görüşlərinə bəzən də dəlilləndirmə üsullarına işarə edir.

3. Hədislərin sağlamlıqların və xüsusən illətlərini açıqlayır.

4. Hədis ricalına aid qiymətli biliklər vərir.[218]

**Tirmizinin Camius-səhihinə yazılmış şərhlər**

Tirimizinin əsərinə yazılmış ən məşhur şərhlər bunlardır:

1. Əbdürrəhim əl-Mübarəkfuri (vəfatı 1353/1934): *"Tühfətül-əhvəzi şərhu camiut-Tirmizi"*

2. Məhəmməd ibn əl-Ərəbi (vəfatı 543/1148): *"Ərizətül-əhvəzi əla kitabit-Tirmizi"*

**3. Sünənlər**

Tarix boyunca hədis alimləri ehkam və etiqadi ilə əlaqəli hədislərə əhəmiyyət vərmişlər. Tarixə nəzər saldıqda hicrətin III əsrdən etibarən hədisşünasların sadəcə ehkam hədisləri cəm etməyə meyl etdiklərinə şahid olarıq. Bu meyilləri nəticəsində meydana gətirdikləri əsərlərə hədis ədəbiyyatında "Sünən" adı vərilmişdir.

Təharətdən vəsiyyətə qədər bütün fiqhi mövzulara aid hədisləri ehtiva edən əsərlərə sünən deyilir.

Sünənlər fiqhi görüşlərlə təlif və təsnif edildikləri üçün ümumiyyətlə, həzrət Peyğəmbərin söz, fel və təqrirlərini bizə nəql edən mərfu sünnə ləvzimatlarını ehtiva edir. Bu əsərlərdə Məvquf və məqtu xəbərlərə çox yer verilmir.

218 Bustanul-mühəddisin, s. 196.

Sünənlərin məzmununu ibadət, müamələt və üqubət bölmələrilə xülasə etmək mümkündür.

Hədis ədəbiyyatında sünən deyiləndə kütübi sittədə yer alan sünənlər ağla gəlir. Bu bölmədə Əbu Davud, Nəsai və İbn Macənin sünənləri haqqında məlumat təqdim ediləcəkdir.

**a. Əbu Davud və Sünən adlı əsəri**

Əbu Davud Süleyman ibn Əşas əs-Sicistani hicrətin 202-ci ilində Sicistanda anadan olmuşdur. İlk təhsilini aldıqdan sonra Nişabur, Xorasan, Kufə, Ərəbistan, İran, Suriyə kimi dövrün elm mərkəzlərinə elmi səyahətlər etmişdir. Hicrətin 275/888-di ildə Bəsrədə vəfat etmişdir.

Dövrün alimləri onun haqqında təqdirə layiq və tərifləyici sözlər söyləmişlər.

Müəllimi olan Əhməd ibn Hənbəl ondan bir hədis rəvayət etmişdir. Əbu Davud bununla iftixar edirdi.

Əbu Davud bütün sünnə adına dörd hədisi kifayət görməsi ilə məşhurdur.

Onun bu kəlamı məşhurdur: "خير كلام ما دخل الاذن بدون إذن" *"sözün yaxşısı, qulağa icazəsiz girəndir."*[219]

**Sünən**

Misir, Mezopotamiya, Məğrib və dünyanın bir çox bölgələrində standart bir hədis kitabı olaraq qəbul edilən və çox oxunan Əbu Davudun Sünəni Concordance-a görə 40 kitab və 1889 babdan ibarətdir. Müəllifin öz ifadəsinə görə də 4800 hədis ehtiva etməkdədir. Sünəndə bəzi kitabların babları yoxdur.[220]

219 Zəhəbi, *Təzkira*, II, 591.
220 Kitabul-luqata, Kitabul-mehdi də olduğu kimi.

Ümumiyyətlə bablarda az sayıda hədis yer alır. Bu xüsusiyyətlər Əbu Davudun məkkəlilərə yazdığı məktubda geniş şəkildə yer alır.[221]

Bab başlıqları qısadır. Fəqət hər hansı bir görüş ortaya qoyacaq şəkildə deyildir. Ancaq aşağıdakı hədis oxunanda bab başlığındakı ifadənin məqsədi nə oluduğu aydınlaşır. Məsələn, باب من ادرك من الجمعة ركعة başlığı altındakı hədis oxunanda "bir rəkatına çatan şəxsin cümənin tamamına çatmış" sayıldığını anlamaq mümkündür.

Ehtiyac gördüyü yerdə şəxs (rical) haqqında məlumat verir. Bəzən bir şəxs haqqında irəli sürülən iki ayrı isimlə əlaqəli seçimini bildirmədən açıqlama verir. Bəzən başqalarından nəql edərək, bəzən də öz görüşünə görə cərh və tədil edir.

Zəif hədisi qeyd etdikdən sonra səbəbini açıqlayır.

Məkanlar haqqında məlumat verir.

Hədisin səbəbi vurudunu bildirir.

Sünəndə heç sülasi hədis yoxdur.

Bukaiyə görə Əbu Davudun Sünənindəki hədislər altı qrupdur.

1. Səhih. Buna səhih lizatihi demək olar.

2. Səhihə bənzər (şibhuhu). Bu səhih liğeyrihi deyə bilərik.

3. Səhihə yaxın (muqarib). Bu həsən lizatihidir.

4. Şiddətli vəhn olan hədislər. Müəllif bunları açıqlayır.

5. "Haqqında bir şey demədiklərim salihdir" dedikləri. Bunların da xəfif vəhnli olduqlarını anlamaq mümkündür.

221 Məktub üçün bax. Çakan, *Hadis Edebiyatı,* s. 82.

6. Dəstəklənərsə həsən liğeyrihi ola biləcək olanlar.[222]

Zəhəbi isə bu qrupları belə sıralayır:

1. Şeyxanın birlikdə təxric etdikləri hədislər

2. Şeyxandan sadəcə birinin kitabına aldığı hədislər.

3. Səhiheyndə olmasa da, sənədi ceyyid olan və eyni zamanda şaz və illətli olmayan hədislər.

4. İsnadı səhih olan iki və ya daha çoxunun leyyin təriqdən rəvayət edildiyi üçün alimlərin qəbul etdiyi hədislər.

5. Ravidəki hafizə nöqsanlığına görə isnadı zəif qəbul edilən hədislər. (bu növ hədislər haqqında müəllif sükut edir)

6. Ravidəki zəifliyi çox açıq olan hədislər. (bu cür hədislərin zəifliyini müəllif ümumiyyətlə açıqlayır).[223]

Əbu Davud əsərində zəif hədislərin mövcud olduğunu şəxsən özü söyləmişdir. Ancaq o alimlərin ittifaqla tərk etdikləri hər hansı bir hədisi kitabına almamışdır.

**Sünənə yazılmış şərhlər**

Əbu Davudun əsərinə bir çox şərh yazılmışdır. Bunlardan ən məşhurları aşağıdakılardır:

1. Əbu Süleyman əl-Xəttabi (vəfatı 388/998), *Məalimus-sünən*

2. Məhəmməd əl-Əzimabadi, *Avnul-mabud şərhu Sünəni Əbi Davud.*

3. Səxarənfuri (vəfatı 1346/1927), *Bəzlul-məchud fi halli Əbi Davud.*

222 Kəşfuz-zunun, II, 1005.
223 Zəhəbi, *Siyər*, XII, 214-215.

### b. Nəsai və Sünən adlı əsəri

Əbu Abdurrəhman Sinan ibn Dinar ən-Nəsai 214/829-cu ildə Nəsada anadan olmuşdur. Hədis öyrənmək üçün dövrün elmi mərkəzlərinə səyahətlər etmiş İshaq ibn Rahuyə, Əbu Davud kimi məşhur alimlərdən hədis təhsil etmişdir.

Uzun müddət elm öyrənmək üçün məskunlaşdığı Misirdən 302-ci ildə Şama gəlmişdir. Buraya gələn Muaviyyə haqqında suallar soruşuldu. Onun fəzilətləri və həzrət Əlidən üstünlüyü haqqında rəvayətlər söyləməsini istədilər. O da bu mövzuda *"Allah onun qarnını doyurmasın"*[224] hədisindən başqa rəvayət bilmədiyini söylədi. Buna görə Muaviyə tərəfdarları İmam Nəsaiyi məscidin içində döyməyə başladılar. Hadisədən sonra Məkkəyə getmək üçün yola çıxdı. Rəmlədə və ya Məkkəyə çatmadan 303/915-ci ildə vəfat etmişdir.

#### Sünən

Nəsai dövrünün ən məşhur hədis sahəsində nüfuz sahibi şəxslərdən biridir. Fiqhi hədisləri bir yerə cəm etdiyi *Sünəni-kəbiri* səhih və illətli hədisləri də ehtiva etməkdə idi. Daha sonra istəyə görə Nəsai bu kitabını sadəcə səhih hədisləri cəm etmək düşüncəsi ilə ixtisar etdi. Bu əsərə də *əl-Müctəba* adını vərdi.

Müctəba, sünənlərdən ən az zəif hədis və cərh edilmiş ravilərin olduğu kitab olaraq bilinir. Buna görə də, səhiheyndən sonra üçüncü sırada olduğu fikrini müdafiə edənlər olmuşdur.

Nəsai, hədislərdəki kiçik rəvayət fərqliliklərini belə, hədisi başından sonuna qədər təkrar etmək surətilə göstərmişdir. Buna görə də, bəzi hədisşünaslar tərəfindən *"xırda işlərlə məşğul olmaq"* kimi tənqidlərə məruz qalmışdır.

224 Müslim, Birr, 96.

Nəsai Tirmizini etdiyi kimi hər hədis üçün ayrı dəyərləndirmə etməz. Onun dəyərləndirməsi hədisi kitabına almış olmasıdır.

Sünəndə 51 kitab və 2400 bab 5761 hədis vardır.

Müctəbada sülasi hədis yoxdur.

Sünəni Nəsai deyiləndə qeyd olunan əsər müctəbadır.

**Sünənə yazılmış şərhlər**

Süyuti, Zəhrur-ruba ələl-Müctəba

**c. İbn Macə və Sünən adlı əsəri**

İbn Macə hicrətin 209-cu ilində Qəzvində doğulmuşdur. Dövrün alimləri kimi o da, İran, Mezopatamiya, Ərəbistan, Suriyə və Misirə elmi səyahətlər etmişdir.

Sünəndən başqa təfsir və tarix sahəsində də dəyərli əsərləri vardır.

273/886-cı ilin Ramazan ayında vəfat etmişdir.

**Sünən**

İbn Macənin sünəni müqəddimə xaric 37 kitab, 1515 bab və 4341 hədisdən ibarətdir. Bu hədislərdən 3002 dənəsi kütübi-sittənin digər müəllifləri tərəfindən rəvayət edilmişdir. 1339 hədis isə sadəcə İbn Macə tərəfindən rəvayət edilmişdir. Bunlardan

428 dənəsinin ricalı siqa (güvənli), isnadları səhihdir.

199-unun isnadı həsəndir.

613-ünün isnadı zəifdir.

99-unun isə isnadı yox dərəcəsində (vahi) və ya münkər yaxud da yalanlanmışdır.

İbnul-Cövzi kimi uydurma hədislərlə əlaqəli əsərlər təlif edən şəxslər, sünəndəki şəxs, qəbilə və şəhərlərə aid rəvayətlərin uydurma olduğunu söyləmişlər.

İbn Macənin sünəni tərtibinə və təkrarlar olmadığına və qısa olduğuna görə çox dəyərli bir əsərdir.

Sünəndə 5 ədəd sülasi rəvayət var.

**Sünənin şərhləri**

Süyuti, *Misbahuz-zücacə əla Sünəni İbn Macə*

## III. TƏSNİF DÖVRÜ SONRASI HƏDİS ƏDƏBİYYATI

Təsnif dövründən sonrakı hədis ədəbiyyatı mövzusunda incələnəcək əsərlər fərqli xüsusiyyətlərə malik əsərlərdir.

Bu bölmədə incələnəcək əsərlər, hədis araşdırmalarında hədis mətnləri üçün mənbə olanlar (müstədrək və müstəxrəc) ilə "ümumi" və ya "əsas" mənada "mənbə" olmayan əsərlərdir. Qeyd etmək lazımdır ki, bu ikinci dərəcəli mənbələr əsas mənbələr üçün köməkçi və rəhbərdir.

Bu bölmədə haqqında məlumat vəriləcək əsərlər, təqribən on əsr qədər uzun bir zaman zərfində meydan gətirilmişdir. Bunların sayılar olduqca çoxdur. Buna görə də bunlardan ən önəmli olanları haqqında məlumat vəriləcəkdir.

### A. MÜSTƏDRƏK VƏ MÜSTƏXRƏCLƏR

#### 1. Müstədrək

İstidrak kəlmə olaraq əksik olanı tamamlamaq, qüsuru yox etmək və tənqid edərək qüsuru göstərmək mənalarını ifadə edir. Termin olaraq bir müəllifin şərtlərinə uyğun olduğu halda kitabına almadığı hədisləri müstəqil bir əsərdə cəm etmək mənasına

gəlir. Bu məqsədlə təlif edilmiş əsərlərə də müstədrək adı verilmişdir. Xüsusilə Səhiheyn üçün müxtəlif müstədrəklər təlif edilmişdir. Bunlardan ən məşhuru Hakim ən-Neysaburinin (vəfatı 405/1014) müstədrəkidir.

əl-Hakim, bu əsərdə, Buxari və Müslimin və ya sadəcə Buxarinin yaxud da təkcə Müslimin şərtlərinə uyğun olduğu halda, bu iki kitabda yer almamış hədisləri bir araya cəm etməyə çalışmışdır. Ancaq, mühəddislər, əl-Hakimin, hədislərə "səhih" hökmünü verərkən mütəsahil davrandığı üçün, bir çox hədis haqqındakı hökmünün həqiqəti əks etmədiyini söyləmişlər.

Zəhəbi, əl-Müstədrəki ixtisar edərək, əl-Hakimin hədislər haqqında verdiyi hökmləri tək-tək incələmiş, səhv olanların səbəblərini qeyd edərək bəyan etmişdir. Beləcə yüz qədər hədisin mövzu deyiləcək qədər şiddətli zəif olduğu görülmüşdür.

Səhiheyn üzərinə Darəqutni və Əbu Zərr əl-Hərəvi də (vəfatı 434/1042) müstədrək yazmışlar.

### 2. Müstəxrəc

Məşhur bir müəllifin kitabındakı hədisləri, bu kitabda mövcud olan sənədlərindən fərqli sənədlərlə, kitabın müəllifləri ilə, müəllifin şeyxində və ya daha yuxarda birləşmək şərtilə müəyyənləşdirmə və bir kitabda cəm etmək surətilə meydan gətirilən əsərlərə müstəxrəclər deyilir. Belə olduğu halda, üzərinə istixrac edilmiş əsərlərdəki hədislərin təriqləri artaraq sağlamlıq dərəcəsi daha da güclənmiş olur.

Kütübi-sittə əsərlərinin çoxu üçün müstəxrəclər edilmişdir. Buxari misalında olduğu kimi bəziləri üçün bir neçə müstəxrəc edilmişdir. Məsələn, Buxari və Müslim üzərinə əl-Müstəxrəc ələs-Səhiheyil-Buxari və Müslim adı ilə Əbu Nuaym əl-İsfəhani (vəfatı

430/1038), Əbu Zər əl-Hərəvi, Əbu Məhəmməd əl-Həsən İbn Əbi Talib (vəfatı 439/ 1047) və s. müəlliflərin bir çox müstəxrəci vardır. Sadəcə Buxari üzərinə Əbu Bəkr Əhməd İbn İbrahim əl-İsmaili əl-Cürcani (vəfatı 371/981), Əbu Bəkr Əhməd İbn Musa İbn Mərduyə əl-İsbəhani (vəfatı 410/1019), və s. Səhihi Müslim üzərinə Əhməd İbn Sələmə ən-Neysaburi əl-Bəzzar (vəfatı 286/899), Əbul-Vəlid Hisan İbn Məhəmməd İbn Əhməd əl-Qəzvini (vəfatı 344/955) və s. Əbu Davud üzərinə Əbu Abdillah Məhəmməd İbn Əbdil-Məlik İbn Eymən əl-Qurtubi (vəfatı 330/941 ), Əbu Bəkir Əhməd İbn Əli İbn Məhəmməd İbn Mərcuyə əl-İsbəhani (vəfatı 486/1093), Tirmizi üzərinə Həsən İbn Əli ət-Tusi (vəfatı 312/924) və Əbu Bəkr İbn Mərcuyə müstəxrəc etmişdir.

## B. ÖZƏL SİSTEMLƏ MEYDANA GƏTİRİLƏN ƏSƏRLƏR

### 1. Bəğavi və Məsabihus-sünnə adlı əsəri

Əbu Məhəmməd əl-Bəğavi (vəfatı 516/1122) "Muhyis-sünnə" və "rüknüs-sünnə" olaraq tanınır. Mərv və Hərat arasında bir yer olan Bağ və ya Bağşura nisbətlə əl-Bəğavi deyilmişdir. Fəqih, mühəddis və müfəssirdir. Bu sahələrdə dəyərli əsərlərə sahibdir.

**Məsabih əs-sünnə**

Bəğavi, abidlərin əlində Qurandan sonra sünənlərdən ibarət mənbəyin olması və onların itaətlərinə kömək etmək məqsədi ilə hədis alimlərinin kitablarında qeyd etdikləri hədislərdən seçmələr etmək surətilə bu kitabı meydan gətirdiyini söyləyir və kitabın xüsusiyyətlərin belə açıqlayır:

"Hədis imamlarının rəvayətlərinə güvəndiyim və uzatmaq istəmədiyim üçün hədislərin sənədlərini tamamən tərk etdim. Bəzən sadəcə səhabi ravini ismini qeyd etdim.

Hər mövzunun hədisləri sihah və hisan olaraq iki qismə ayırdım. Sihah qismində qeyd olunan hədislər, Buxari və Müslimin ikisinin birlikdə və ya sadəcə birsinin təxric etdiyi hədislərdir. Hisan qismində qeyd olunan hədislər isə Əbu Davud, Tirmizi və digər hədis imamlarının kitablarındakı hədislərdir. Burada yer alan hədislər də adil ravilərin bir-birilərindən rəvayət etdikləri üçün səhihdir.

Zəif və qərib hədislərə mütləq işarə etdim. Münkər və mövzu hədisləri heç almadım.

Qeyd etmək lazımdır ki, Bəğavini sihah və hisan ayırımı qaynaqlarına əsasən, xoş qarşılanmamış və tənqid edilmişdir.

Məsabihus-sünnədə 4931 hədis mövcuddur.

Məsabihdə kütübi-sittə və Dariminin sünəni əsas alınmışdır.

**2. Təbrizi və Mişqat əl-məsabih adlı əsəri**

Əbu Abdullah əl-Xətib ət-Təbrizi (vəfatı 737/1336) Məsabihus-sünnəyə 1511 hədis əlavə edərək Mişqatul-məsabihi meydana gətirdi.

Təbrizi hər babı üç bölməyə ayırmışdır.

a) I. Bölmə. Bəğavini sihah dediyi rəvayətlər.

b) II. Bölmə. Bəğavini hisan diyərək qeyd etdiyi hədislər.

c) III. Bölmə. Burada da Bəğavinin, baba uyğun olduğu halda əsərində qeyd etmədiyi hədisləri əlavə etmişdir. Təbrizi hər nə qədər Bəğavi kimi sadəcə mərfu hədisləri seçmə üsuluna bağlı qalmamışsada, metod tədbiqində Bəğaviyə bağlı qalmışdır.

Mişqat əsli olan Məsabihdən daha çox bəyənilmişdir. Alimlər oxumaq, oxutmaq və şərh yazmaq surətilə Mişqata olan etimad-

larını göstərmişlər. Əsərin ən məşhur şərhi Əli əl-Qarinin yazdığı *"Mirqatul-məfatih şərhu Mişqatil-məfatih"* adlı şərhdir.

## C. CƏM ÖZƏLLİYİNƏ MALİK ƏSƏRLƏR

### 1. Cami əl-usul li əhadis ər-rəsul

Əsərin müəllifi İbn əl-Əsir əl-Cövzidir (vəfatı 606/1209).

Müəllif əsəri məbadi, məqasid və xəvatim deyə adladırdığı üç əsas bölməyə ayırmışdır.

Camiul-üsul mərfu və məvquf hədislərdən ibarətdir. Tabiun və sonrakı təbəqələrdəki ravilərin görüşlərinə nadir olaraq təsadüf etmək mümkündür.

Müəllif, hədisləri uyğun olduğu bablarda, təkrar etmədən və uyğunluğu əsas alaraq qeyd etməyə çalışmışdır.

Əlifba sırası əsas alaraq tərtib edilmişdir. Ancaq sıralamada hədislər deyil bölmə (kitab) isimlər və kitab isimlərinin ilk hərfi əsas qəbul edilmişdir. Sadəcə müəyyənlik artiklı olan əlif lam hərfləri diqqətə alınmamış ondan sonrakı hərf əsas alınmışdır.

Əsas mövzunun alt mövzuları, sıralamaya uyğun olmasada, mövzunun bütünlüyünü əsas alaraq həmən mövzunun altında qeyd etmişdir. Əsas sıralamada yeri gələndə mövzunun qeyd edildiyi yer göstərilmişdir. Məsələn, Cihad mövzusunun ayrılmaz hissələri qəbul edilən qənimətlər, fey, ğülul, nəfl, xums və şəhadət kimi mövzuları kitabul-cihadın yer aldığı cim hərfində qeyd etmiş, bu kəlmələrin baş qismindəki hərf ilə əlaqəli yerə gələndə, mövzunun sonunda "ğülul və qənimətlər, kitabul-cihadda keçdi" şəklində bir cümləyə yer vərmişdir. Camiul-üsuldan faydalanmaq üçün bu xüsusiyyətlərə diqqət etmək lazımdır.

Müəllif yer-yer hədislərdə keçən qərib kəlmələrə da açıqlıq gətirir. Əsər 9523 hədisdən ibarət olub XI cilddir.

Camiul-üsul əsəri, İbn Dəyba tərəfindən *Təysirul-vusul ilə camiul-usul* adı ilə ixtisar edilmişdir. Bu əsər İbrahim Canan tərəfindən Kütubi-sittə adı ilə tərcümə və şərh edilmişdir. Ayrıca Camiul-usul da Kamal Sandıkçı tərəfindən türk dilinə tərcümə edilmişdir.

**2. Əli ən-Nasif və ət-Tacul-cami**

Əzhər Univərsiteti alimlərindən biri olan Mənsur Əli Nasif tərəfindən 6 il ərzində meydana gətirilən *ət-Tacul-cami* Buxari, Müslim, Əbu Davud, Tirmizi və Nəsainin kitablarından seçmə hədislər əhatə etməkdədir.

Müəllif bəzi mövzular haqqında bu beş kitabda tapa bilmədiyi hədisləri Şafi və Əhməd ibn Hənbəlin *Müsnəd*lərindən, İmam Malikin Muvəttəsindən, İbn Macənin *Sünən*indən və Hakimin *Müstədrək*indən tamamlamışdır. Bunu da həmin yerdə açıqlamışdır.

Tac dörd əsas bölmədən ibarətdir.

a) İman, elm və ibadət

b) Müamələt, əhkam və adətlər (buyu, nikah, taam, libas və.s.).

c) Fədail, təfsir və cihad

d) Əxlaq və səmiyyat (ədəb, zühd, əzkar, fitən, qiyamət və. s.)

İlk iki bölməsi fiqh bablarına görə tərtib edilmişdir.

Müəllif eyni növ əsərlərdən fərqini belə qeyd edir.

a) *Məsabih*də hədislər ravisiz və qaynaqsız qeyd edilməklə yanaşı Təfsir bölməsi heç yoxdur.

b) *Təysirul-vusul*, *Camiul-üsul*un muxtəsəridir və kitab (bölmə) isimləri əlifba sırasına görə sıralanmışdır. Fiqhi bir tərtib yoxdur.

c) *əl-Müntəqa* isə sadəcə əhkam hədislərini ehtiva edir. Fəzail, əxlaq və səmiyyat bölmələri yoxdur.

Müəllif *ət-Tacı* bu üç əsərin nöqsanlarını aradan qaldıracaq şəkildə hədisləri səhabi ravisi və beş əsərdən hansında yer aldığını qeyd edərək, ilk iki bölməsini də fiqhi tərtibdə və bütün bölmələri əhatə edəcək şəkildə təlif etdiyini bildirməkdə və buna görə də əsərinin alimlər arasında etibar gördüyünü qeyd etməkdədir.[225]

Tacda 5887 hədis yer almaqdadır.

## D. ƏLİFBA SIRASINA GÖRƏ YAZILMIŞ ƏSƏRLƏR

### 1. Süyuti və Camius-səğir adlı əsəri

Yüzlərlə əsərin müəllifi olan Cəlaləddin əs-Süyutinin (vəfatı 911/1505) hədis sahəsindəki əsərlərindən olan *əl-Camius-səğir min əhadisil-bəşir vən-nəziri*, yenə də ona aid olan *Cəmul-cəvami* adlı, bütün hədisləri bir yerə cəm etmək məqsədilə təlifə başlanmış, fəqət yarım qalmış olan əsərin xülasəsidir. Bu əsər 10031 hədis ehtiva etməkdədir.

Camius-səğirdə, demək olar ki, əhkam hədisləri heç yoxdur. Əsərə uydurmacı və yalancı şəxslərin tək başına rəvayət etdikləri heç bir hədis alınmamışdır.

Hədislər, ilk kəlmələr əsas alınaraq əlifba sırasına görə sıralandığı üçün sənədləri tamamən həzf edilmişdir. Hər hədisdən sonra hədisin yer aldığı mənbələr müəyyən rəmzlərlə qeyd edilmişdir. Əsərdə istifadə edilən rəmzlər belədir:

225 Bax. Tac, I, 20.

| | |
|---|---|
| (ت) | Tirmizi |
| (تخ) | Buxari fit-tarix |
| (خ) | Buxari |
| (خد) | Buxari fil-ədəb |
| (خط) | Xətib (əl-Bağdadi) |
| (حب) | İbn Hibban fi səhihihi |
| (حل) | Əbu Nuaym fil-hilyə |
| (حم) | Əhməd ibn Hənbəl fi müsnədihi |
| (د) | Əbu Davud |
| (ش) | İbn Əbi Şeybə |
| (ص) | Səib ibn Mənsur |
| (طب) | Təbərani fil-kəbir |
| (طس) | fil-əvsat |
| (طص) | fis-səğir |
| (ع) | Əbu Yala fi müsnədih |
| (عب) | Əbdurrəzzaq fil cami (əl-Müsənnəf) |
| (عد) | İbn Ədiy fil kamil |
| (عق) | Ukayli fid-düəfa |
| (عم) | Abdullah ibn Əhməd ibn Hənbəl fi zəvaidih |
| (فر) | Dəyləmi fi müsnədil-firdəvs |
| (ق) | Buxari və Müslim birlikdə |
| (قط) | Darəkutni |
| (ك) | Hakim fil-müstədrək |
| (م) | Müslim |
| (ن) | Nəsai |
| (ة) | İbn Macə |
| (هب) | Beyhaki fi şuabil-iman |
| (هق) | Beyhaki fis-sünən |
| (٤) | Əbu Davud, Tirmizi, Nəsai, İbn Macə |
| (٣) | Əbu Davud, Tirmizi, Nəsai[226] |

226 Bu ixtisarlar müqəddimədə müəllif tərəfindən qeyd olumuşdur.

Hədis mətnləri və yuxarıdakı rəmzlər qeyd ediəndən sonra, o hədisi hansı səhabinin rəvayət etdiyi də qeyd edilmişdir. Hər hədisin sağlamlıq dərəcəsi (ض) (ح) (صح) rəmzlərilə göstərilmişdir.

Müəllif (كان) ilə başlayan feli hədislər üçün xüsusi bir bab ayırmış və bu cür hədislərin həzrət Peyğəmbərin şəmaili ilə əlaqəli olduğunu qeyd etmişdir. Həmçinin həzrət Peyğəmbərin qadağalarını "babul-mənahi"də (نهى) ilə başlayan hədisləri sıralamaq surətilə vərmişdir.

**Camius-səğirə yazılmış şərh**

Camius-səğirə yazılmış ən önəmli şərh Abdurrauf əl-Münavinin (vəfatı 1032/1623) etirazları da qeyd etmək surətilə yazdığı *Feyzul-qədir şərhul-Camiis-səğir"* adlı şərhdir.

## E. XALQ ARASINDA MƏŞHUR OLAN SÖZLƏRLƏ ƏLAQƏLİ ƏDƏBİYYAT

### 1. Əcluni və Kəşful-xəfa

İsmail ibn Məhəmməd əl-Əcluni 1087/1676-cı ildə anadan olmuşdur. Quran oxumaqla başladığı təhsilini Şamda fiqh, hədis, təfsir və ərəb dili öyrənməklə davam etdi. Şamda məşhur müəllimlərdən dərs aldı. 1119-cu ildə Anadoluya getmişdir. Sonra təkrar Şama qayıdaraq ömrünün geri qalan hissəsini dərs vərməklə keçirmişdir. 1162-ci ildə Şamda vəfat etmişdir.

Əcluninin əsərlərindən ən məşhuru *Kəşful-xəfa*dır. Müəllif, el arasında məşhur olan sözlər haqqında mövcud bir çox əsərdən hər birinin özünə məxsus xüsusiyyətinin olduğunu müəyyənləşdirmiş və bu xüsusiyyətləri bir yerdə cəm etmək üçün Kəşful-xəfanı yazmışdır.

Əsərdə Məqasidul-həsənə əsəri əsas qəbul edilmişdir. Müəllif sadəcə səhabi ravisini qeyd etməklə kifayətlənmişdir. İbn HəcərinLəalil-mənsura kimi mötəbər mənbələrdən də istifadə etmişdir.

*Qalə (zəkəra) fil-məsnua sözü ilə İbn Həcərin bu əsərinə*

*Qalə fil-əsl* və ya *fil-Məqasid* sözü ilə Səxavinin *Məqasidul-həsənə*sinə

*Qalə fit-təmyiz* sözü ilə İbn Dəybanın *Təmyizut-tayyib*inə

*Qalə fid-Dürər* sözü ilə Süyutinin *Dürərül-Müntəha*sına

*Rəvahu Əbu Nuaym* sözü ilə Əbu Nuaymın *Hilyətül-əvliya*sına

*Rəvahu Bəyhaki* sözü ilə Bəyhakinin *Şuabul-iman*ına

*Qalən-Nəcm* sözü ilə Nəcməddin əl-Ğazzinin *İtqanu mə yuhsən minəl-əxbar*ına

*Qalə Qari* sözü ilə Əli əl-Qarinin *Mövzuat*ına

*Qalə Səğani* sözü ilə Məhəmməd əs-Səğaninin *əl-Mövzuat*ına işarə edilir. Bunların xaricindəkilər tam isimləri ilə bərabər açıqlanır.

İki cild olan bu əsərdə 3281 sözü incələnir. Rəqəmlərdən sonra kəlmələr mötərizədə əlifba sırasına görə tədqiq edilir. Əsərdə hədis kəlməsindən istifadə edilməmişdir.

Əcluni hədis olmayan sözlərə "leysə bihədis" ifadəsilə işarə etmişdir. Bunun məqsədi o sözün "hikmətli söz" və ya "səhabə qövlü" yaxud da "bir alimin sözü" olduğunu bildirməkdir.

## F. UYDURMA HƏDİSLƏRLƏ ƏLAQƏLİ ƏDƏBİYYAT

### 1. Əli əl-Qari və Mövzuat adlı əsəri

Əl-Qari deyə məşhur olan Nurəddin Əli ibn Soltan Məhəmməd əl-Hərəvi Həratda anadan olmuşdur. Xorasan və ətrafındakı alimlərdən dərs aldıqdan sonra Məkkəyə yerləşmişdir. İldə bir dəfə yazdığı Müshəfi sataraq illik ehtiyacını təmin edirdi. Müəllif 1014/1605-ci ildə Məkkədə vəfat etmişdir. Vəfat xəbərini alan Misir üləması, Əzhər camesində qiyabında cənazə namazı qılaraq təqdirlərini ifadə etmişlər.

**Mövzuat**

Əli əl-Qarinin son əsəri olan Mövzuat və ya əl-Mövzuatül-kübra isimlərilə məşhur olan *"əl-Əsrarul-mərfua fil-əxbaril-məvzua"*, "daha rahat istifadə edilməsi üçün xalq arasında dolaşan hədislərdən sadəcə mövzu və ya əsilsiz olanlarını bir yerə toplama" düşüncəsilə təlif edilmişdir. Müəllif uydurma olduğu ixtilaflı olan hədisləri almadığını bildirməkdədir.

Bu əsər ələl-əhruf (əlifba sırasına görə) sistemə görə yazılmışdır.

Beləki; bu əsər

1. Xalq arasında hədis deyə məşhur olan sözləri incələyən əsərlərdən seçilmişdir.

2. Bu xüsusiyyətə malik əsərlərdəki sadəcə uydurma və əsilsiz xəbərləri bir araya gətirmişdir.

3. Xəbərlər əlifba sırası əsas alınaraq sıralanmışdır.

Buna baxmayaraq müəllif bəzən alimlərin uydurma qəbul etdikləri hədisləri müdafiə edərək onlara müxalifət etmişdir.

Sıralamada iki hərf və ya kəlmə əsas götürülmüş ikinci və ya üçüncü kəlmələrdə əlifba sırasa əsas alınmamışdır.

Əsər üç ana bölmədən meydana gəlməkdədir.

1. Mən kəzəbə aləyyə mütəammidən hədisinin təxrici (bu bölmədə hədisin 102 fərqli sənədi qeyd edilmişdir)

2. Əlifba sırasına görə sıralanmış 625 ədəd mövzu hədis. Müəllif bu bölmədə, Səxavinin, İbn Cövzinin, İbn Deybanın və Süyutinin mövzu hədislər haqqındakı əsərlərini əsas almışdır.

3. Mövzu hədis haqqında texniki məlumatlar.

Əli əl-Qari, bu əsərində əsasən hədis mətnlərini tənqid etmişdir.

## G. RİCAL ƏDƏBİYYATI

Rical çalışmaları əsasən II əsrdə başlamış, III əsrdə isə klassik əsərlərini ərsə gətirmişdir. Sonrakı dövrlərdə bu çalışmalar genişləndirilərək müxtəlif növlərə ayrılmışıdır.

1. Siqa və zəif raviləri ehtiva edən kitablar,

2. Sadəcə siqa raviləri ehtiva edən kitablar,

3. Sadəcə zəif raviləri ehtiva edən kitablar,

4. Kizbi və hədis uydurmacılığı ilə tanınan raviləri ehtiva edən kitablar,

5. Səhabilər üçün müstəqil kitablar,

6. Tabiun üçün müstəqil kitablar,

7. Bəzi kitabların raviləri üçün kitablar,

İndi də bu növlərin ən məşhurlarından bir neçəsi haqqında məlumat veriləcəkdir.

### 1. Siqa ve zəif ravilərlə əlaqəli kitablar

Bu sahədə ilk təlif edilən əsərlərlədən biri Katibul-Vakidi deyə məşhur olan Məhəmməd İbn Səədin (vəfatı 235/849) ət-Təbəqatül-kübrasıdır. Səhabə, tabiin və ətbaut-tabiindən bir çoxlarını incələyir. Bəziləri haqqında uzun, bəziləri haqqında da qısa məlumat verir. Səkkiz ciltdir. Son cild qadınlara təxsis edilmiştir.

Bu qruba Xəlifə ibn Həyyatın (vəfatı 230/844), Nəsainin (vəfatı 303/915), Müslimin (vəfatı 261/874) ət-Təbəqətləri, İbn Əbi Heysəmənin (vəfatı 279/892) Tarixi, Buxarinin ət-Tarixul-kəbir, ət-Tarixul-əvsat və ət-Tarixus-səğir adlarını daşıyan üç ədəd tarixi, Əli İbn Mədininin səhabə üzərinə təlif etdiyi əsərlər, İbn Həzm adıyla məşhur olan Hüseyin İbn İdris əl-Ənsari əl Hərəvinin (vəfatı 301/913) Tarixi və s. daxildir.

Eyni zamanda Əbu Yala əl-Xəlilinin (vəfatı 446/1054) əl-İrşad, Xətib əl-Bağdadinin Tarixu Bağdad, İbn Kəsirin (vəfatı 774/1372) ət-Təkmil fî əsmais-siqat vəz-zuafa vəl-məcahilini də qeyd etmək olar.[227]

Burada qeyd ediləcək ən önəmli əsərlərdən biri də şübhəsiz ki, Zəhəbinin Siyəridir.

#### a. Zəhəbi və Siyəru-alamin-nübəla adlı əsəri

Tarixçi və hədisçi Zəhəbinin bu əsəri mənbələrdə, Siyəru alamin-nübəla, Tarixun-nübəla, Tarixul-uləmain-nübəla, Kitabun-nübəla, Əyanun-nübəla, Siyərun-nübəla adları ilə yer alır.

Kitabda haqqında ilk məlumat verilən şəxs, əşərəyi mübəşşirədən Əbu Ubeydə ibn əl-Cərrah (I, 5-23), son şəxs isə hicrətin 657-ci ilində vəzifəsindən uzaqlaşdırılan Mənsur Əli ibn Aybək ət-Türkidir (XXIII, 381-382).

227 İbrahim Canan, *Kutub-i Sitte Tercüme ve Şerhi*, I, 284-285.

Siyər təqribən 700 il müddətində İslam ölkələrində yaşamış, məşğul olduqları sahədə mütəxəssis olan 5925 xəlifə, məlik, əmir, soltan, vəzir, qazi, qari, mühəddis, fəqih, ədib, lüğətçi, nəhvçi, şair, kəlamçı və fəlsəfəcilərin tanıdımı və tənqidlərini ehtiva edir. Ancaq haqqında məlumat verilən şəxslərin əksəriyyətini hədisçilər təşkil edir.

Hər şəxsin rəvayətlərinin Kütübi-sittə müəlliflərindən kimlər tərəfindən təxric edildiyini göstərən rəmzlərə yer verilmişdir. Bu rəmzləri belə sıralamaq olar:

| | |
|---|---|
| (ع) | Kütübi-sittə |
| (٤) | Əbu Davud, Tirmizi, Nəsai, İbn Macə |
| (خ) | Buxari |
| (خت) | Buxari taliqən |
| (بخ) | Buxari, əl-ədəbul-müfrəd |
| (م) | Müslim |
| (د) | Əbu Davud |
| (ت) | Tirmizi |
| (س) | Nəsai |
| (ش) | İbn Macə |

Siyəru aləmun-nübəla 25 cild olaraq nəşr edilmişdir. Son iki cildi fihrisddir.

Bu əsər rical sahəsində ən məşhur əsərdir. Siyərə baxmadan bir şəxs haqqında məlumat verilməməlidir.

**2. Sadəcə Siqa ravilərə aid əsərlər**

Bu bölməyə aid əsərlər Kitabus-siqat deyilir. Əhməd İbn Abdullah əl-İclinin (vəfatı 261/874), İbn Hibbanın (vəfatı 354/965), Xəlil İbn Şahinin, Zeynəddin Qasım İbn Qatlubuğanın (vəfatı

879/1469) Kitabus-siqatları vardır. Bu növ əsərlərin ən məşhurlarından biri də Zəhəbinin Təzkiratul-huffazıdır.

### a. Zəhəbi və Təzkiratul-huffaz adlı əsəri

Zəhəbi tərəfindən yazılan Təzkiratul-huffaz əsəri adından da məlum olduğu kimi, hədis hafizləri haqqında məlumat verir. Səhabədən etibarən 21 təbəqədə 1176 biyoqrafiya haqqında məlumat verilir.

Əsər əlifba sırası əsasında təlif edilməmişdir. Ancaq sonunda əlifba sırasında görə mündəricat əlavə edilmişdir.

Əsərdə hər şəxsin başında, o şəxsin sıra içindəki nömrəsini, neçənci təbəqənin neçənci sırasında yerləşdiyini və kütübi-sittədən hansılarına aid ricaldan olduğunu göstərən rəqəmlər qoyulmuşdur. Məsələn,

١٧٦ $\frac{٢٣}{٥}$ ع ———————— سعيد بن ابي عروبه

Bu sətir, Səid ibn Əbi Ərubənin Təzkiratül-xüffazdakı 176-cı hafiz 5-ci təbəqənin 23-cü şəxsi olduğunu və bu şəxsin kütübi-sittənin hamısında rəvayətinin olduğunu anladır.

Təzkiratul-huffaz X əsrə qədər yaşamış hədis hafizləri haqqında məlumat verir.

### 3. Sadəcə Zəif ravilər haqqında məlumat verən əsərlər

Müxtəlif xüsusiyyətlərinə görə cərh edilmiş və buna görə də zəif qəbul edilmiş ravilər, ümumiyyətlə Kitabuz-zuafa adını daşıyan kitablarda toplanmışdır.

Buxari, Nəsai, Məhəmməd İbn Əmr əl-Ukayli (vəfatı 322/933) Əbul-Fərəc Abdurrəhman İbn Əli əl-Cövzi (vəfatı 597/1200), Həsən İbn Məhəmməd əs-Sənani, İbn Hibban, Darəqutni, Ələddin

əl-Mardini və İbn Ədiyin əl-Kamil fi marifətiz-züəfa adlı əsərlər bu növə aid əsərlərdən bəziləridir.

**a. Zəhəbi və Mizanul-itidal adlı əsəri**

Zəhəbi tərəfindən zəif raviləri tanıdmaq məqsədilə İbn Ədinin əl-Kamilindən də istifadə edərək hazırladığı Mizanul-itidal fi nəqdir-rical əsəri 11053 zəif şəxs haqqında məlumat verməkdədir.

Əsər, zəif ravilər haqqında məlumat vermək məqsədini güdməsinə baxmayaraq bəzi güvənli raviləri də ehtiva etməkdədir.

Mizanul-itidal əlifba sırasında görə səkkiz qisimdən meydana gəlməkdədir.

1. Kişi-qadın adları (I-IV, 487 arasında)

2. Kişilərə aid ləqəblər (I-IV, 487-589)

3. Ata adları ilə tanınanlar (IV, 590-598)

4. Nisbələr (IV, 599-601)

5. İsmi məchul olan kişilər (IV, 602-603)

6. İsmi məchul olan qadınlar (IV, 604-610)

7. Qadınlara aid ləqəblər (IV, 611-614)

8. İsimsizlər "Validətu filan" kimi (IV-ci cildin sonunda 130 səhifəlik bir fihrist (IV, 620-749) yer alır).

Zəhəbi, haqqında məlumat verdiyi şəxslərin kütübi-sittə ricalından olub-olmadıqlarını, bu altı kitabdan hansının ricalından isələr onu müxtəsər olaraq bildirmişdir.

Altı kitabın hamısı üçün ع, dörd sünən üçün عو rəmzlərindən istifadə etmişdir.

#### 4. Səhabilər haqqında təlif edilən əsərlər

İlk zamanlar səhabilər haqqında məlumat ilə tabiun və ətbaut-tabiin ricalı haqqında məlumat birlikdə yer alırdı. İbn Sədin ət-Təbəqatul-kübrası ilə Buxarinin ət-Tarixul-kəbiri kimi.

Ancaq, sonrakı dövrlərdə səhabilər haqqında müstəqil əsərlər qələmə alınmışdır. Bu sahədə ilk müstəqil əsərin kimin tərəfindən təlif edildiyi dəqiq olaraq məlum deyildir.

Əli İbnul-Mədini (vəfatı 234/848), Abdullah İbn Məhəmməd İbn İsa əl-Mərvəzi (vəfatı 293/905), əl-Həsən İbn Abdullah əl-Əsgəri (vəfatı 382/992), Əbu Nuaym əl-İsfəhani (vəfatı 430/1038), Əbul-Qasım əl-Bəğavi (vəfatı 516/1122), Əbu Həfs İbn Şahin (vəfatı 385/995), Əbu Hatim İbn Hibban (vəfatı354/965) kimi bir çox müəllif səhabilərin həyatların əsas alan əsərlər təlif etmidir. Bunlardan sonrakı dövrlərdəki əsərlər isə, onlar əsas alınaraq yazılan əsərlərdir.

Səhabələr haqqında təlif edilmiş və günümüzdə çox istifadə edilən əsərlərdən bir neçəsi haqqında müəyyən məlumat vermək istəyirik:

##### a. əl-İstiab fi marifətil-Əshab

Bu əsəri Əbu Ömər Yusif İbn Abdillah İbn Məhəmməd İbn Əbdilbərr (vəfatı 463/1070) təlif etmişdir. İsmindən məlum olduğu kimi, müəllif bu əsərdə bütün səhabiləri cəm etmək istəmişdir. Buna baxmayaraq səhabilərin hamısı haqqında burada məlumat tapmaq mümkün deyil. Ancaq, özündən əvvəlkilərdən daha mükəmməldir.

Burada 4225 səhabinin həyatı haqqında məlumat yer alır.

**b. Usdul-ğabə fi marifətis-səhabə**

Əsər İzzəddin İbnul-Əsir Əbul-Həsən Əli İbn Məhəmməd əl-Cəzəri (vəfatı 630/1232) tərəfindən yeddi cild olaraq təlif edilmişdir. Son cildində qadın səhabələrin həyatı incələnmişdir. Müəllif özündən öncə yazılmış əsərlərdən çox istifadə etmişdir. Ancaq bu əsərlərdən fərqi əlifba sisteminə əsasən yazılmış olmasıdır. Bu əsər sayəsində 7554 səhabənin həyatı haqqında məlumat əldə etmək mümkündür.

**c. əl-İsabə fi təmyizis-səhabə**

İbn Həcər əl-Əsqəlani (vəfatı 952/1545) tərəfindən təlif edilən bu əsər əshabın həyatı haqqında yazılan ən mükəmməl əsərdir. Özündən əvvəl yazılmış bütün əsərləri incələmiş və buradakı qüsurları düzəltmişdir.

Müqqədimədə səhabənin tərifi, ədaləti, təbəqələri haqqında məlumat verdikdən sonra hərflərə görə qisimlədnirilmişdir: Hərful-əlif, hərful-bə, hərful-cim...kimi.

Hər bir hərf də dörd qisimə ayrılmışdır:

a) Birinci qisimdə biri şəxsin, *səhabə olduğu hərhansı bir dəlil ilə yəni özündən və ya başqasından gələn rəvayətlərlə sabit olanlar* yer alır. Bu şəxslərin adları əlifba sırasına görə sıralanmışdır. Səhabə olduğunu bildirən rəvayətlərin səhih, həsən və ya zəif olması nəticəni dəyişdirmir.

b) *Səhabə arasında yer alan uşaqlar.* Burada Rəsulullahı (s) təmyiz yaşından öncə görən səhabə uşaqlar yer alır. Belələrin səhabə sayılıb-sayılmadığı haqqında ixtilaf olduğu üçün, İbn Həcər belə bir metoddan istifadə etmişdir.

c) *Burada muxadram haqqında məlumat verilir*. Muxadram, Rəsulullahın (s) müsəlman olduğu halda onu görmə şərəfinə nail ola bilməyən müsəlmanlara deyilir. Ümmət içərisində onların da ayrı bir şərəf və məqamları vardır.

d) *Özündən əvvəlki əsərlərdə səhvən səhabi olaraq qeyd olunan səhabilər.*

Bu kitbdan faydalı istifadə etmək üçün, qeyd olunan xüsusiyyətləri bilmək şərtdir.

Kitab 1328-ci ildə Misirdə dörd cild olaraq nəşr edilmişdir. Əsərin kənarında əl-istiab da yer almaqdadır. İçərisində 11027 ədəd tərcümeyi hala yer verilmişdir.

Rical haqqında ədəbiyyatı belə sxemləşdirmək mümkündür:[228]




228 Bu sxem Lütfi Çakanın *Hadis Edebiyyatı* kitabından alınmışdır. s. 281.

## H. HƏDİS AXTARMA METODLARI

### 1. Concordance

Əsərin Fransızca adı *ed İndices de la Tradition Musulmane,* Ərəb dilində adı isə, *əl-Mucəmul-müfehres li əlfazil hədisin-Nəbəvi*dir. *Concordance* (konkordans) olaraq məşhur olan fihrist xüsusiyyəti daşıyan bu əsər Amsterdam krallığı akademiyası başçılığı və müxtəlif ölkələrə aid 15 akademiya və inistitutunun elmi və iqtisadi dəstəklərilə meydana gətirilmiş dəyərli bir əsərdir.

Kütübi-sittəyə əlavə olaraq Dariminin *Sünən*i, İmam Malikin *Muvəttə*sini və İmam Əhməd ibn Hənbəlin *Müsnəd*ini ehtiva edən *Concordance*ın hazırlanması üçün çalışmalar 1916-cı ildə Juynboll, Wensick, Horovitz və digər bəzi müstəşriklərin planlaması ilə başlamışdır. Müxtəlif ölkələrin 40-a yaxın elm adamı tərəfindən davam edilən əsərin ilk meyvəsi, birinci cildi 20 il sonra 1936-cı ildə Leidendə nəşr edilmişdir. VIII cildi isə 1988-ci ildə nəşr edilmişdir.

VIII cild şəxs və yer isimlərinə təxsis edilmişdir. Digər cildlərdə isə, kütübi-tisa da yer alan hədislərin önəmli ifadələri, lüğət metodu əsas alınaraq qeyd edilmişdir.

*Concordance*ın ehtiva etdiyi kitablar üçün aşağıdakı qısaltmalardan istifadə edilmişdir:

1. Buxari (خ)
2. Müslim (م)
3. Əbu Davud (د)
4. Tirmizi (ت)
5. Nəsai (ن)
6. İbn Macə (جه)
7. Darimi (دي)
8. Muvəttə (ط)
9. Əhməd ibn Hənbəl (حم)

Bu qısaltmalar hər səhifənin altında göstərilmişdir.

Kütübi-tisa üçün *Concordance* əsas alınaraq göstərilən rəqəmlər müxtəlif mənalar daşıyır. Bu rəqəmləndirməyi belə göstərə bilərik:

1. Bölmə (kitab) adından sonra bab (fəsil) nömrəsi göstərilənlər:

Bunlar, Buxari, Əbu Davud, Tirmizi, İbn Macə, Nəsai və Dariminin kitablarıdır. Məsələn: **Buxari, Elm, 2; Əbu Davud, Təharət, 3,** kimi.

2. Bölmə adından sonra hədis nömrəsi göstərilənlər:

Bunlar sadəcə İmam Müslimin Səhihilə, İmam Malikin Muvattasıdır. Məsələn, **Müslim, İman, 93; İmam Malik, Muvəttə, Hüsnül-Xuluq, 3** və ya **Muvatta, Hüsnül-Xuluq, 3**, kimi.

3. Sadəcə cild və səhifə nömrəsi göstərilən:

Buda, sadəcə Əhməd ibn Hənbəlin Müsnədidir. Məsələn, **Əhməd ibn Hənbəl, Müsnəd, V, 25**, və ya **Müsnəd, V, 25** kimi.

*Concordance*dan, hədis haqqına qısa zamanda məlumat əldə etmək üçün, o hədisdə yer alan "ən nadir və müştaq" kəlməni müəyyənləşdirmək və o kəlməni əsas alaraq axtarmaq lazımdır.

Bir hədisi tapmaq üçün, bir neçə kəlmə əsas alaraq axtardıqdan sonra bu hədis haqqında məlumat tapılmazsa, o hədisin *Concordance*ın ehtiva etdiyi doqquz kitabda yoxdur, deyə düşünməmək lazımdır. Axtarma üçün fərqli kəlmələrə də müraciət edilməlidir. Çünki, bəzən hazırlayıcıların hansı kəlməni önəmli qəbul etdiklərini təxmin etmək mümkün olmur. Təxmin edilməyən bir kəlmədən də o hədisi almış ola bilərlər.

*Concordance*da kəlmələr, mazi müzari, əmr,…məlum, məchul sırası ilə və şəxs əvəzlikləri və əmsiləyi müttaridə sırasına görə sı-

ralanmışdır. Bu xüsuslara da diqqət edilərsə qısa zamanda nəticə əldə edilər.

*Concordance*dan səmərəli istifadə etmək üçün bu iki nöqtə də bilinməlidir:

1) Müslimin Səhihində sadəcə sənədi zikr edilmiş fəqət mətni vərilməmiş rəvayətlər qeyd edilməmişdir.

2) Müvəttədəki sadəcə mərfu hədislər qeyd edilmiş, İmam Malikə və digər alimlərə aid görüşlərə (əsər) işarə edilmişdir.

Bir örnəyi incələyərək bu ifadələrə daha da aydınlıq qazandıraq:

Əlimizdə belə bir mətn var

لا يلدغ المؤمن من جحر واحد مرتين

Ən qısa yoldan bu hədis haqqında məlumat ala bilmək üçün *Concordance*dan "lə yüldəğu" kəlməsinin mazisi olan (لدغ) və (جحر) kəlmələrindən baxa bilərik.

"lədəğa" maddəsindən baxdıqda *Concordance*ın VI cildinin 111 səhifəsinin ikinci sütununda bu ifadələr yer alır:

(باب) لا يلدغ المؤمن، المؤمن من جحر (واحد) مرتين

خ أدب ٨٣، م زهد ٢٣، د أدب ٢٩

جه فتن ١٣، دى رقاق ٢٥، حم ٢، ١١٥، ٣٧٩ .

Əgər "cuhr" kəlməsindən baxsaq, *Concordance*ın I cildinin 322 səhifəsinin ikinci sütununda bu ifadələrlə qarşılaşarıq:

لا يلدغ المؤمن من جحر واحد مرتين خ أدب ٨٣ ، م زهد ٢٣،

د أدب ٢٩، جه فتن ١٣

حم ٢، ١١٥، ٣٧٩

Həmçinin bu hədis üçün “mömin” kəlməsinin mazisi olan “əmənə” maddəsindən yola çıxaraq, əl-mömin kəlməsinin mərfu olaraq yer aldığı sətirlərə baxa bilərik. Bu hədisi *Concordance*ın I cildinin 114-cü səhifəsinin ilk sütununda bu ifadələrlə tapa bilərik:

لا يلدغ المؤمن من جحر مرتين خ أدب ٨٣، م زهد ٢٣،

جه فتن ١٣، دى رقاق ٢٥،

حم ٢، ١١٥، ٣٧٩ .

Birinci kəlmədən bu hədisi tapa bilmək üçün maddənin baş qismi olan “lədəğa” kəlməsindən başlayaraq təqribən bir sütun, “cuhr” kəlməsindən etibarən təqribən 1/3 sütun, “əl-mömin” kəlməsi üçün isə “Əmənə” kəlməsindən başlayaraq 12 sütünu izləmək lazımdır. Buna görə bu hədisi ən qısa yoldan tapa bilmək üçün “cuhr” kəlməsinə baxmaq lazımdır. Həqiqətən də hədisdəki ən nadir müştaq kəlmə odur.

Yuxarda qeyd olunan qısaltmaları belə açıqlamaq olar:

(خ أدب ٨٣،) : Buxarinin Kitabul-ədəbinin 83-cü babı

(م زهد ٢٣، ) : Müslimin Kitabuz-zühdün 63-cü hədisi

(د أدب ٢٩ ) : Əbu Davudun Kitabul-ədəbinin 29-cu babı

(جه فتن ١٣،) : İbn Macənin Kitabul-fitəninin 13-cü babı

(دى رقاق ٢٥،) : Dariminin Kitabul-riqaqın 65-ci babı

(حم ٢، ١١٥، ٣٧٩ ) : Əhməd ibn Hənbəlin Müsnədinin II cildinin 115 və 379-cu səhifələri.

Elmi araşdırmada bu mənbələr belə göstərilməlidir:

Buxari. Ədəb 83; Müslim, Zühd 63; Əbu Davud, 29; İbn Macə, Fitən 13; Darimi, Riqaq 65; Əhməd ibn Hənbəl, Müsnəd, II, 115,

379. Bu müəlliflərin adları, kitabların yerinə keçməkdədir. Ayrıca Səhih, Sünən kimi kitab adlarını qeyd etməyə ehtiyac yoxdur.

### 2. Bir hədisin qanyağını tapmaq üçün ehtimal və əsərlər

Bir hədisin mənbəyini tapmaq üçün, hər şeydən əvvəl araşdırılacaq mətnin hədis olub-olmadığını bilmək lazımdır. Sonra da mətnin mövcud bölməsinin, mövzusuna və ya səhabə ravisinə və s. müxtəlif vəziyyətlərə görə ehtimallar ələ alınır.

İndi də, qeyd olunan bu ehtimalların hər birini tək-tək ələ alaraq, hansı ehtimalın hansı əsərlərdən faydalanaraq tapa biləcəyimizi göstəriləcəkdir.

İlk öncə araşdırılacak söz üçün iki ehtimal vardır.

1. (Bu söz) hədisdir.

2. Hədis olduğu dəqiq deyildir.

**1. Araşdırılacaq söz hədisdir.**

Bu halda dörd ehtimal vardır.

***a. Hədisin mətni bilinir.***

Belə olduğu halda da iki ayrı ehtimal mövcuddur.

1) Hədisin ilk kəlməsi əldədir.

Əgər hədisin ilk qismi bilinirsə, hədis mətnlərini əlifba sırasına görə ehtiva edən və mənbə göstərən *əl-Camius-səğir, Ramuzul-əhadis* kimi əsərlərə, ikinci olaraq da Muslim, İmam Malik, İbn Macə və *Müşkatul-məsabih* kimi sonunda və ya müstəqil olaraq əlifba sırasına görə fihristi olan kitablara müraciət etmək lazımdır.

Bilinən bu kəlmə müştaq kəlmə isə şüphəsiz *Concordance* əsərinə müraciət edilməlidir. Ayrıca, hədis olub-olmadığı dəqiq məlum olmayan mətnlər üçün müraciət ediləcək mənbə olan *Kəşful-xəfa* və *Məqasidul-həsənə* kimi əsərlərə muraciət edilməlidir.

2) Hədisin hər hansı bir və ya bir neçə kəlməsi əldədir.

Belə olduğu zaman, kəlmələri tək-tək ələ alaraq Concordance-dan axtarmaq lazımdır.

Əldə mövcu kəlmələr hədisin ana mövzusu haqqında da bir fikir vərə bilər. Əgər hədisi *Concordance*dan tapa bilməsək, *Miftahu künüzüs-sünnə* adlı mövzu fihristlərinə (mündəricat) müraciət etmək olar.

***b. Hədisin mövzusu bilinir.***

Belə olan halda, ilk əvvəl mövzuyu *Miftahu künuzüs-sünnə*də axtarmaq lazımdır.

Bundan başqa miftahın xaricində qalan mövzular üçün Zəvaid, Mütədrək, Müstəxrəc və Camiul-üsul, Kənzul-ümmal və ət-Tac kimi ələl-əbvav əsərlərə müraciət etmək lazımdır. Əgər hədisin ana mövzusu, mütəqil hədis kitablarında incələnmiş, ədəb, tərğib-tərhib, zikir-dua, dəlail, şəmail, siyər və s. kimi bir mövzu isə, o halda bu mövzulara təxsis edilmiş əsərlərə müraciət etmək ən doğru qərar olar.

***c. Səhabi ravisi bilinir.***

Əgər hədisin sadəcə səhabi ravisi bilinirsə, heç şübhəsiz müraciət edilcək əsərlər, ələr-rical təsnif sisteminə görə yazılmış Müsnəd və Möcəm əsərləridir. Bunun üçün də, Əhməd ibn Hənbəlin Müsnədi ilə Təbəraninin əl-Möcəmül-kəbiri müraciət ediləcək ilk əsərlərdir.

***d. Hədisin əsas*** *(müəyyən edici)* ***xüsusiyyətlərdən hər hansı biri bilinir.***

Belə halda üç ehtimaldan bəhs edə bilərik. Beləki, müəyyən edici xüsusiyyət

1) Hədisin sənədindədir.

Məsələn, atanın oğlundan rəvayəti, mürsəl və ya müsəlsəl bir sənəd xüsusiyyəti varsa, bu mövzularda yazılmış Xətib əl-Bağdadinin *Rəvayəul-əba ənil-əbna,* Əbu Davudun *əl-Mərasil* və Cəlaləddin əs-Süyutinin *əl-Müsəlsələtul-kubra* adlı əsərlərə müraciət edə bilərik.

2) Hədisin mətnindədir.

Məsələn, mətndə qüdsi hədis olduğuna və ya uydurma hədis olduğuna aid bir xüsusiyyət varsa, o halda, Qüdsi hədislərə və Mövzu hədislərə aid əsərlərə müraciət etmək lazımdır.

3) Hədisin sənəd və mətnindədir.

İllət və ibham kimi xüsusiyyətlər hədisin həm mətnində həm də sənədində ola bilər. Belə olduğu halda, Əbu Hatim ər-Razinin hər mövzuda illətli hədisləri ələl-əbvab sistemə görə ehtiva edən *İləlul-hədis*ə, Əbu Zura Əhməd ibn Əbdurrəhman əl-İrakinin *əl-Müstəfad min mübhəmatil-mətn vəl-isnad*a, İbnul-Cövzinin *əl-İləlul-mütənahiyə*sinə baxmaq lazımdır.

**2. Araşdırılacaq sözün hədis olduğu qəti bəlli deyildir.**

Bu halda iki ehtimala müraciət edilməlidir.

***a. Xalq arasında məşhur sözlərdəndir.***

Bu növ hədisləri (sözləri) əldə etmək üçün, *Məqasidul-həsənə* və *Kəşful-xəfaya* müraciət etmək lazımdır.

***b. Hədis diyə uydurulmuş sözlərdəndir.***

Bu sözlər üçün Mövzuat ədəbiyyatına müraciət etmək lazımdır. Məsələn, İbn Ərraqın *Tənzihuş-şəria* və ya Əli əl-Qarinin *əl-Əsrarul-mərfua* və ya *əl-Məsnu* kimi əsərlər.

## I. HƏDİS ELMLƏRİ (ULUMUL-HƏDİS)

Elmlər tarixi incələndiyində, inkişaf səviyyəsi müəyyən səviyyəyə çatmış hər elm sahəsinin zamanla öz içərisində müstəqil elm sahələrinə ayrıldığını görürük. Bunun təbii bir təkamül zamanı olduğunu söyləmək mümkündür. Bu zaman zərfi, hədis elmi üçün də mövzu bəhsdir. Hədis elmi də, müxtəlif elmi sahələri, təməlində toplayan zəngin bir elmi xəzinəyə sahibdir.

Quruluşu etibarilə hədis elmi, “rəvayətül-hədis” və “dirayətül-hədis” olmaq üzrə iki əsas sahəyə ayrılır.

1. Rəvayətül-Hədis Elmi, həzrət Peyğəmbərə, səhabəyə və tabiuna nisbət edilən söz, fel, təqrir və sifətlərdən ibarət olan yazılı rəvayətin həssas bir şəkildə nəqlini əsas alan elm sahəsidir. Qısaca hədisin ehtivası ilə maraqlanır. Hədislərin yazılı şəkillərini əhatə edən hədis kitabları (yəni səhihlər, camilər, sünənlər, möcəmlər, müsnədlər və. s.) bu elm sahəsinə girir.

2. Dirayətül-Hədis Elmi isə, sənəd ilə mətnin məqbul olub olmaması nöqteyi-nəzərindən vəziyyətlərini göstərən qaydalar elmidir. Hədisin nəqlində, dəyərləndirilməsində, şərhində və hökm çıxarmada xətadan uzaq qala bilmək, ancaq bu elmin təsbit və təyin etdiyi qaydalar sayəsində mümkündür. Bu elmə “Üsulu hədis elmi” də deyilməkdədir.

Bu elm aşağıdakı xidmətləri göstərmiştir:

a) İslam dinini pozulmaq və dəyişdirilməkdən mühafizə etmişdir. Çünki isnad (sənədləndirmə) sistemi sayəsində hərkəs

hədis rəvayət edə bilməmişdir və uydurmalar ortaya çıxarılıb, zərərli təsirlərdən qorunmuşdur.

b) Rəsulullaha (s) yalan nisbət edənlərə aid olan cəzadan alimləri gurtarmışdır. Onlar üsul gaydaları səbəbiylə rəvayət ettikləri hədislərin sağlamlığına güvənmiş və könül rahatlığı ilə rəvayət etmişlər.

## A. HƏDİS ELMİNİ İNKİŞAF ETDİRƏN AMİLLƏR

Hədis elminin təkmilləşməsində iki amil əsas rol oynamıştır: Səhabənin bildiklərini başqalarına çattırma vəzifələri və Rəsulullah (s) adına yalan söyləməmə incəlikləri.

### 1. Təbliğ vəzifəsi

Rəsulullah (s) dinin ilk təbliğçisi idi. O, Quran ayələrini əshabına çatdırır və özüdə hər il həzrət Cəbrayıl ilə bərabər Quranı qarşılıqlı olaraq müqabilə etmişdir.

Əshabını da müxtəlif vəsilələrlə dini və fikri cəhətdən yoxlayır, anladıqlarını gördükdə təbrik edirdi.

Əshab Rəsulullahın təbliğ etdiyi xüsusları öyrənir və anlayıb həyata kəçirirdi. Onlardakı bu öyrənmə həvəsi sadəcə elm üçün deyil, daha çox öyrənikləri məlumatları həyatlarında tətbiq etmək üçün idi. Çünki bilik yaşanaraq yerləşər və unudulmaz.

Əshabdakı bu arzu və istək sadəcə ayələrlə məhdud deyildir. Onlar Rəsulullahın açıqlamalarına və davranışlarına da çox əlaqə göstərmişlər. Beləcə Rəsulullahın sözləri əzbərlənib, felləri nəql edilmişdir. Rəsulullahın həyatı heç bir peyğəmbərə nəsib olmayan şəkildə, bütün incəlikləriylə aydınlığa çıxarılmışdır. Həyatındakı hər şey nəql edilmişdir.

Əshab dinləyib öyrənmiş, həm də öyrəndiklərini digər müsəlmanlara nəql edərək sünnənin yayılmasına səbəbkar olmuşdular. Beləcə, əshabda təbliğ adət halına gəlmişdir. Ancaq burada bunu da ifadə etmək lazımdır ki, İslamın ilk illərində Quran ilə qarışma ehtimalına görə Rəsulullahın hədislərinin yazılması qadağan idi. Bu qadağan hədislərin əzbərlənməsinə səbəb olmuşdur.

Quran yaxşıca qavranılınca hədislərin yazılmasına icazə verilmişdir. Beləcə hədislərin həm şifahi, həm də yazılı nəqli ilə, elmi bir fəaliyyət başlamış oldu. Əshab da rəvayətül hədis elmini başladan nəsil olaraq hədis tarixindəki yerini aldı.

Rəsulullah mövzuya aid təşviq və tövsiyələrinin birində belə buyurur: "*Sözümü eşidib gözəlcə yerinə gətirən və yerinə gətirdiyi kimi başqalarına təbliğ edən kimsənin üzünü Allah(c.c) ağ etsin.*" Bir başqa sözü isə təbliğ vəzifəsini açıqca xatırladır. "*Burada olanlarınız , olmayanlara eşitdiklərini xəbər versin*." Bu sövqlər Əbu Zərrin sözlərində belə cavabını tapır: "*Qılıncı boynuma dayasanız , məndə bir hədisi başım kəsilincəyə qədər təbliğə vaxt tapa bilsəm, o sözü əlbətdə rəvayət edərdim*.

İslam cəmiyəti sünnə cəmiyəti deməkdir. İslam mədəniyyəti sünnədən ibarətdir. Sünnə isə həzrət Pəyğəmbərə aid hər şeydir. Bunun İslam cəmiyəti içində yayılması isə ümumiyətclə şifahi rəvayətlər, imkan daxilində yazılı mətnlər sayəsində gərçəkləşmişdi.

**2. Pəyğəmbər üzərinə yalan söyləməmə diqqəti**

Rəsulullah bir hədisi şəriflərində belə buyurmuşdular: "*Biləbilə mənim adımdan yalan söyləyən cəhənnəmdəki yərinə hazırlansın*"

Bu hədis bizə zamanla bəzi insanların hədisin dəyərindən istifadə etmək istəyəcəklərini xəbər vərməkdədir. Yəni bir çox insan dinin ikinci qaynağını öz mənfəətləri üçün istifadə etmək

istəyəcəklər. Rəsulullahın adından sözlər uyduraraq öz mənfəətlərinə xidmət edəcəklər.

Bu hədis, hədis uydurma fəaliyyətlərinin qarşısını almamışsa da hədis uyduranların işini pozmuşdur. Çünki, hədisin səhihini zəyifindən və uydurma olanından ayırmaq üçün elmi tədbirlərin alınmasına və hədis elmlərinin ortaya çıxmasına səbəb olmuşdur. Hədis elmlərinin çoxuna, bu hədisin təbii nəticəsi olaraq baxmaq mümkündür.

Bu hədisin digər bir cəhəti ümumi məna ifadə etməsidir. Yəni uydurulacaq sözün lehində vəya aleyhində olması mühim deyil. Mühim olan bir yalanın Rəsulullaha aid edilməsidir. Rəsulullahın adına yalan söyləyən hər kəs, hədisin xəbər verdiyi cəza ilə qarşılaşacaqdır.

Quran misilsiz bir kitabdır. Bir ayəsinin belə bənzəri gətirilə bilməz. Buna görə dini pozmaq istəyənlər, onun açıqlayıcısı olan Pəyğəmbərin sözlərini təhrif etmə və yalanlarına hədis adı vermə yolunu seçmişlər. Bu səbəblə hədisləri qorumaq zəruri hala gəlmiş və cəmiyyəti yalanların zərərli təsirindən qorumaq ehtiyacı hiss edilmişdir. Beləliklə də hədis elimləri inkişaf etdi deyə bilərik.

Nəticə olaraq, bu iki elm növü haqqında bunu deyə bilərik ki, Dirayətül hədis elmi usul və qaydaları ortaya qoyan, Rəvayətül hədis elmi də bu qaydalara görə hər hədisi araşdırıb dəyərləndirən elm növləridir.

Dirayətül hədis elmi, ilk zamanlarda hədis elmiylə əlaqəli bir-birindən müstəqil bir çox mövzunu içinə alırdı. Bu mövzular əlaqəli əsərlərdə `bab` yaxud `növ` deyə təbir edilən başlıqlar altında incələnirdi. Ancaq hədislərin tədvin və təsnifiylə birlikdə, dirayətül-hədislə maraqlanan alimlər, zamanla bu mövzularda ixtisaslaşmış və müstəqil əsərlər meydana gətirmişlər. Bu

sahələşmədən sonra hədis elmləri çoxalmış və müxtəlif yönlərdən hədislərin vəziyyətini incələyən bir çox elm sahəsi ortaya çıxmışdır. Bunlardan ən əsaslarına burada qısaca qeyd etmək istəyirik.

### B. HƏDİS LÜĞƏTLƏRİ (qəribul-hədis)

Hədisləri doğru anlamaq üçün ilk ədəbiyyat növü "qəribul-hədis" ada sahib hədis lüğətləridir.

Qəribul-hədis ədəbiyyatını, sadəcə kəlmə açıqlamaları ehtiva edən özəl şərhlər olaraq qəbul etmək mümkündür.

Qəribul-hədis elmi; hədis mətnlərində yer alan və az istifadə edilmələri səbəbiylə başa düşülməsi çətinə olan sözləri izah edən elmdir.

Peyğəmbərimiz (s) ərəb dilini yaxşı bilən və ən gözəl danışan adamlardan biri olduğu üçün onun sözlərində –ərəb dilini bilən şəxslər üçün başa düşülməsi çətin olan qapalı ifadələr yoxdur. Buna baxmayaraq səhabilər, Peyğəmbərimizin sözləri içərisində başa düşmədikləri bir söz və ya ifadə varsa onları Peyğəmbərə soruşub öyrənmişdilər. Peyğəmbərimizin vəfatından sonra ərəblərdən başqa digər millətlərə mənsub şəxslərdən müsəlman olanların, ərəbcənin öz ifadə xüsusiyyətləriylə söylənmiş olan hədisləri tam və doğru olaraq başa düşə bilməmələri problemi ortaya çıxmışdır. Buna görə hədis alimləri, hədislərin hər kəs tərəfindən başa düşülməsi üçün belə bir fəaliyyətə başlamışlar. Bu mövzudakı fəaliyyətləri, sonradan bir elm qolu halına gəlmiş və bu elmə qəribul-hədis, yəni hədislərdə olan başa düşülməsi çətin sözləri və ya ifadələri izah edən elm deyilmişdir.

Bu sahədə yazılmış ən məşhur lüğət əsərləri bunlardır:

**1. Zəməxşəri və əl-Faiq fi qəribil-hədis adlı əsəri**

**2. İbnul-Əsir əl-Cəzəri və ən-Nihayə fi qəribil hədis adlı əsəri**

## C. RAVİLƏR ELMİ (ilmur-ricalil-hədis)

“Ricalul-hədis”, hədis rəvayət edən yaxud hədis elmiylə məşğul olan şəxslərə deyilir. Bu elm, raviləri hədis rəvayəti nöqteyinəzərindən tədqiq edən, tanıdan bir elm sahəsidir. Bu, ravilərin bioqrafiyalarından və təbəqələrindən bəhs edir. Habelə bir mənada ravilər tarixi deməkdir.

Buxarinin (vəfatı 256/870) “Tarixul-Kəbiri” ilə İbn Sadın (vəfatı 230/845) “ət-Tabaqatul-Kubra” adlı əsəri bu sahədə yazılmış ən önəmli əsərlərdəndr. Xüsusiylə səhabənin həyatıyla əlaqəli yazılan İbn Abdilbərr əl-Qurtubinin (vəfatı 368/979) “əl-İstiab fi marifətil-əshabı”, İbnul-Əsirin (vəfatı 360/971) “Üstul-ğabə fi marifətis-səhabəsi” və İbn Hacər əl-Əsqalaninin (vəfatı 852/1451) “əl-İsabə fi təmyizis-səhabə” adlı əsəri bu sahədə yazılmış əsərlər arasında yer almaqdadır.

## D. ƏSBABU-VÜRUD ELMİ (ilmu əshabı vürudil-hədis)

Hədislərin söylənmə yaxud fel isə meydana gəlmə səbəblərindən bəhs edən elm sahəsinə `əshabı vürud elmi` deyilir. Quran elmləri içərisində əshabı nüzulun yeri və əhəmiyyəti nə isə hədis elmləri üçün də əshabı vürud elminin o dərəcə əhəmiyyəti var. Hədislərin bir qismi bəzi hadisələr üzərinə, bir qismi də soruşulan suallara cavab olmaq üzərə varid olmuşdur. Gərək bu hadisələr, gərəksə səhabənin müxtəlif vəsilələrlə soruşduqları suallar, qar-

şılığında söylənən sözün yaxud verilən cavabın səbəbi-vürudunu təşkil etməkdədir.

Bu elm, hədislərin anlaşılmasını asanlaşdırır, hədislə əlaqəli problemlərin aydınlığa qovuşmasında önəmli ölçüdə köməkçi olur. Hökmlərin mahiyyətinə açıqlıq qazandırır. Əshabı-vürudun xatırladılması nəticəsində, bənzər bir hadisəyə rahatca hökmün tətbiq edilməsi təmin olunmuş olur.

Bu elm sahəsi hədislərin xronologiyasına da işıq tutur.

Əshabı-vürud elmiylə əlaqəli də önəmli əsərlər təlif edilmişdir. Bunlar arasında Süyutinin (vəfatı 911/1510) "Əshabı vürudil-Hədisi" ilə İbn Həmzə əd-Dəməşqinin (vəfatı 1120/1619) "əl-Bəyan vət-tərif fi əsbabi vürudil-Hədisi-Şərif" adlı əsəri bu sahədə yazılmış önəmli əsərlərdəndir.

## E. MÜXTƏLİFUL-HƏDİS ELMİ

Müxtəliful-hədis elmi, bir-birlərinə zidd olan məna və hökm ifadə edən hədislərlə mənaları bir-birinə zidd olmadığı halda zahirən zidd görünən hədisləri incələyən elmdir.

Peyğəmbərimizə aid olduğu müəyyən edilən (səhih) hədislər içərisində bir-birinə zidd məna və hökm daşıyan hədislər yoxdur, bir-birindən fərqli mənalara gələn hədislər vardır. Təzadlıq ilə fərqlilik eyni şeylər deyildir. Məsələn, Rəsulullah (s), bir gün özünə "*Hansı əməl daha fəzilətlidir*?"-deyə soruşulduqda; "*Allaha və Rəsuluna imandır"* buyurmuşdur.[229]

Bir başqa gündə bir başqa səhabi eyni sualı vermişdir. Rəsulullah, ən fəzilətli əməlin, vaxtında qılınan namaz olduğunu söyləmişdir.[230] Diqqət edilərsə bu iki hədisin mənaları və göstər-

229 Tac, I, 32.
230 Müslim, İman, 137.

dikləri hökmlər bir-birindən fərqlidir. Ancaq bu fərqlilik bir təzad deyildir. Bu cür hədislərdə sual soruşan adamın halı, vəziyyəti, sualı soruşan zaman və məkan çox vacibdir. Ancaq bu fərqlilik bir təzad təşkil etmir. İlk hədis, İslamın ilk dövrlərində, ikinci hədis isə daha sonrakı günlərdə söylənmiş ola bilər. Çünki İslam dininin təbliğ edilməyə başlandığı ilk dövrdə ediləcək ən əhəmiyyətli şey, Allaha və Rəsuluna iman etməkdir; Çünki iman olmadan ibadət olmaz. Bundan başqa namaz da o dövrdə hələ fərz olmamışdır. Daha sonralar isə imanın əhəmiyyəti tam olaraq başa düşülüb qəbul edildiyindən; artıq Allaha və Rəsuluna iman etmiş olan bir adamın edəcəyi ən əhəmiyyətli ibadət, namazı vaxtında qılmaqdır. Başqa bir sözlə iki hədis arasında hər hansı bir təzad yoxdur.

Dini əmrlərin hər birinin özünə görə əhəmiyyəti və fəziləti vardır. Ancaq bəzi zamanlarda bəzi əmrləri yerinə yetirmək, digərlərindən daha əhəmiyyətli hala gələ bilər. Məsələn; müsəlmanların hücuma məruz qaldığı, vətənlərinin işğal edildiyi bir zamanda cihad, daha çox əhəmiyyət qazanır. Belə bir halın olmadığı zamanlarda isə bir başqa ibadət, cihaddan daha əhəmiyyətli ola bilər. Elə bəzi hədislərin fərqli məna və hökm ifadə etməsi, ümumiyyətlə bu cür səbəblərdən qaynaqlanmışdır.

Peyğəmbərimiz dövründə heç bir səhabə Rəsulullaha: "*Ya Rəsulullah! Sən, dünən belə demişdin, bu gün belə deyirsən*"-deyə hər hansı bir sual soruşmamışlar ya da etiraz etməmişlər. Çünki onlar hədisləri bilavasitə eşitdiklərinə görə, söylənən hər hədisin səbəbini, məqsədini, mənasını və hökmünü bilirdilər. Buna görə də "hədislərdə ixtilaf"-deyə bir məsələ yox idi. Sonrakı dövrlərdə hədislər toplanıb bir araya gətirilirkən, fərqli məna və hökm ifadə edən hədislərlə qarşılaşınca, bunların söyləndikləri –və ya hədis bir feli ifadə edirsə o felin edildiyi- zaman, vəziyyət, məkan və digər təsirlər tam olaraq müəyyən edilmədiyindən, bu hədislərin

uzlaşdırılması məsələsi ortaya çıxmışdır. Bu məsələni həll etməyə çalışan mühəddislər, ixtilaflı hədislərdən bir qismini uzlaşdırmışlar (bir-birinə zidd görünən iki hədis arasında bir təzadın olmadığını, əksinə hər iki hədisin bir-birinə uyğun olduğunu ortaya qoymuşlar), uzlaşdıra bilmədikləri hədislər arasında da seçmə aparmışdırlar.

Buna görə ixtilaflı hədislər, iki qrupda dəyərləndirilmişdir:

**a. Birinci qrup:** Bir-biriylə uzlaşdırılması mümkün olan ixtilaflı hədislərdir.

Bu cür hədislərdə məna və hökm baxımından bir-birinə ziddiyyət var kimi görünsə də əslində belə bir təzad yoxdur. Bu hədislər incələnib dəyərləndirildiyində bir-birlərinə uyğun olduqları açıq-aydın görünür.

**Misal**:

Peyğəmbərimiz (s) belə buyurmuşdur:

لاَ عَدْوَى وَ لاَ طِيَرَةَ وَلاَ هَامَةَ... وَ فِرَّ مِنَ الْمَجْذُومِ كَمَا تَفِرُّ مِنَ الْاَسَدِ

*"Xəstəliyin yoluxucusu yoxdur. Quşların oxumasında da uğursuzluq olmaz... Cüzzam xəstəliyinə tutulmuş adamdan, aslandan qaçdığınız kimi qaçın."*[231]

Bu hədisə diqqət edildiyi zaman, içərisində, yəni mənasında ziddiyətlik var zənn edilir. Çünki hədisdə həm xəstəliyin yoluxucu olmadığı göstərilməkdə həm də cüzam xəstəsindən uzaq durulması tələb olunur. Əgər xəstəlik yoluxucu deyilsə, xəstə olan adamdan nə üçün uzaq durmaq lazımdır?

231 Buxari, Tibb, 19.

Hər nə qədər bu cür hədislərin bir-biriylə təzad təşkil edən ifadələr olduğu zənn edilirsə də həqiqətdə heç bir təzad yoxdur. Belə ki:

1. Xəstəliklərdən bəziləri yoluxucudur, bəziləri də yoluxucu deyildir. Yoluxucu olmayan xəstəliklərin də bir başqasına yoluxması olmaz. Başqa bir ifadəylə hədisdəki məqsəd, bu cür xəstəliklərdir. Hədisdə, cüzzamlı olan adamdan uzaq durulması istənməklə cüzzam kimi bəzi xəstəliklərin yoluxucu olduğu da göstərilir. Demək ki, hədisin mənası doğrudur və aralarında təzad yoxdur.

2. Yoluxucu olan xəstəliklər, xəstə olan adamla təmasda olmaq, onun istifadə etdiyi əşyaları istifadə etmək kimi səbəblər olmadığı müddətcə yoluxmazlar. Hədisin ilk cümləsində bu hal izah edilmədən, yəni xəstəliyin, bir səbəb olmadan öz-özlüyündən yoluxmayacağı göstərilir. İkinci cümləsində isə yoluxucu bir xəstəliyə yaxalanmış olan adamdan uzaq durulması istənməklə, xəstə olan adamla təmasda olmanın, bu xəstəliyin yoluxmasına səbəb olacağı ifadə edilir. Cümlələr bir-birini tamamlayıcı mahiyətdə olub aralarında hər hansı bir təzad yoxdur.

**b-İkinci qrup:** Bir-biriylə uzlaşdırılmamış olan ixtilafi hədislərdir.

Bu hədislərin bir qismi, nəsxə aid olan hədislərdir. Nəsx; dini bir hökmün yenə dini bir dəlil ilə ləğv edilməsidir. İslamın təblğ edildiyi ilk dövrdə, sadəcə o dövrə məxsus olmaqla –insanların o günkü hallarına uyğun olaraq- Allah tərəfindən ortaya qoyulan hökmlərdən bəziləri daha sonra yenə Allah tərəfindən ləğv edilmişdir. Ləğv edilmiş hökmə **mənsux**; o hökmü ləğv edən hökmə isə **nasix** deyilir. Rəsulullah (s) da Allah Təala hökmlərini izah

edən, öyrədən və tətbiq edən bir peyğəmbər olduğu üçün, onun hədisləri içərisində də nasix və mənsux olanları vardır.

**Misal:**

Əbu Hüreyrə Rəsulullahın belə buyurduğunu rəvayət etmişdir:

تَوَضَّؤُا مِمَّا مَسَّتِ النَّارُ

*"Atəşin toxunduğu (atəşdə bişən) bir şeyi yediyiniz zaman dəstəmaz alın."*[232]

Bu hədisdən çıxan hökm, atəşdə bişirilmiş hər hansı bir yeyəcək yeyildiyi zaman dəstəmaz alınmasının şərh olduğudur. Buna qarşılıq bəzi səhabilər peyğəmbərimizi, atəşdə bişirilmiş yeməyi yedikdən sonra dəstəmaz almadan namaz qıldığını rəvayət etmişlər.[233] Peyğəmbərimizin bu tətbiqindən çıxan hökm isə, atəşdə bişirilmiş hər hansı bir xörək yeyildiyi zaman dəstəmaz alınmasının şərt olmadığıdır. Bu halda peyğəmbərimizin sözü ilə tətbiqi arasında bir fərqlilik mövcuddur. Atəşdə bişirilmiş hər hansı bir şeyi yedikdən sonra dəstəmaz almaq lazımdırsa Rəsulullahın da dəstəmaz alması, əgər deyilsə o təqdirdə, *"atəşin toxunduğu (atəşdə bişən) bir şeyi yediyiniz zaman dəstəmaz alın"*-deyə əmr etməməsi lazım gələrdi.

Peyğəmbər əleyhissalamın sözü ilə tətbiqinin bir-birindən fərqli olması əslində bir ziddiyyət deyil, bir hökm dəyişikliyinin ifadəsidir.

İslamın ilk dövrlərində, atəşdə bişirilmiş hər hansı bir xörəyi yemək, dəstəmazı pozan hallardan qəbul edilərdi. Rəsulullahın (s), atəşdə bişən bir şey yeyildikdən sonra dəstəmaz alınmasının

232 Müslim, Heyz, 352
233 Buxari, Vudu, 50; 51

əmr edilməsinin səbəbi budur. Ancaq bu hökm, daha sonra nəsx edilmiş onun əvəzinə, ataşdə bişirilmiş xörəyi yeməyin dəstəmazı pozmadığı hökmü ifadə edilmiş, peyğəmbərimiz də bunu öz tətbiqi ilə göstərmişdir.

Bu misalda görüldüyü kimi, fərqli məna və hökm daşıyan, aralarında da uzlaşma mümkün olmayan hədislər, nəsxlə əlaqəli hədislərdir.

Hədislərin varid olduqları yəni, söyləndikləri – əgər hədisdə bir feli ifadə edirsə, həmin felin edildiyi – zaman diqqətə alınmaq surətilə nasix və mənsux olanları təsbit edilmişdir. Əvvəl varid olan hədis mənsux, sonra varid olan hədis nasix qəbul edilmiş və nasix olan hədisə üstünlük verilib onunla da hökm verilmişdir. [234]

### 1. Hədislərin seçilməsi

Hədislərin seçilməsi; məna və hökm yönündən bir-birinə zidd görünüb də uzlaşdırıla bilməyən iki hədisdən birini seçib digərini tərk etməkdir.

Məna və hökm cəhətdən bir-birinə zidd kimi görünən iki hədisdən hanısısıyla əməl ediləcəyi mövzusu, hədis elminin əhəmiyyətli mövzularından biridir. Çünki belə iki hədislə qarşılaşdığı zaman bunların nasix və mənsux olanlarını müəyyən etmək lazımdır. Əgər hədislər nasix ya da mənsux deyilsə ikisinin arasını tapmaq, yəni bu hədislər arasında hər hansı bir ziddiyyət olmadığını ortaya qoymaq lazımdır. Bu mümkün olmazsa iki hədisdən biri seçilir. Bu seçilmədə hədislərin bəzi xüsusiyyətləri diqqətə alınır ki, bunlara **seçilmə səbəbləri** deyilir.

Hədislər arasındakı seçilmə səbəbləri bunlardır:

---

234 Talat Koçyiğit, *Hadis Terimleri Sözlüğü*, s. 389-390, 481

**Ravinin vəziyyətinə görə üstünlük vermə**

Hədislərin, ravi vəziyyətinə görə seçilməsi bu əsaslara görə edilir:

1. Çox şəxs tərəfindən rəvayət edilən, daha az şəxs tərəfindən rəvayət ediləndən üstün tutulur.

2. Ali isnadla rəvayət edilmiş olan hədis, nazil isnadla rəvayət ediləndən üstün tutulur, Faqih (fiqh elmində üstün bilik sahibi) şəxslər tərəfindən rəvayət edilən hədis, fəqih olmayan ravilər tərəfindən rəvayət edilən hədisdən üstün tutulur.

3. Hədisi əzbərləyən adamın rəvayət etdiyi hədis, əzbərləməyib yazan adamın rəvayət etdiyi hədisdən üstün tutulur.

4. Leksik elmində daha üstün olan ravilər tərəfindən rəvayət edilən hədis, bu elmdə digərləri qədər bilik sahibi olmayanlar tərəfindən rəvayət edilən hədisdən üstün tutulur.

**2. Hədisin əldə ediliş şəklinə görə seçilməsi**

Bir hədisə onun əldə ediliş şəklinə görə üstünlük verilməsi, aşağıdakı şəkildə edilir:

1. Hədisi, yetkinlik çağına girdikdən sonra almış (öyrənmiş) olanın rəvayət etdiyi hədis, bu çağa girmədən əvvəl almış olanın hədisindən üstün tutulur.

2. Hədisi səma yoluyla almış olanın rəvayəti, digər yollardan biriylə almış olanın hədisindən üstün tutulur.

3. Hədisi arz yoluyla alan kimsənin rəvayəti, icazət, münavələ, mükətəbə, ilam, vasiyyə və ya vicadə yollarındn biriylə almış olanın hədisindən üstün tutulur.

4. Hədisi icazət yoluyla alan adamın rəvayəti, münavələ, mükətəbə, ilam, vasiyyə və ya vicadə yollarındna biriylə almış olanın hədisindən üstün tutulur.

5. Münavələ yoluyla alan adamın hədisi, mükətəbə, ilam, vəsiyyə və ya vicadə yollarından biriylə almış olanın hədisindən üstün tutulur.

6. Mükətəbə yoluyla alan adamın hədisi, ilam, vasiyə və ya vicadə yollarından biriylə alınmış olanın hədisindən üstün tutulur.

7. İlam yoluyla alan adamın hədisi, vasiyyə və ya vicadə yollarından biriylə almış olanın hədisindən üstün tutulur.

8. Vasiyyə yoluyla alan adamın hədisi, vicadə yoluyla alanın hədisindən üstün tutulur.

**a. Rəvayət şəklinə görə seçilməsi**

Rəvayət şəklinə görə seçilmə, bu prinsiplərə görə edilir:

a) Həm ləfzi həm də mənası ilə rəvayət edilən hədis, sadəcə mənasıyla rəvayət edilən hədisdən üstün tutulur.

b) Vürud səbəbi göstərərək rəvayət edilmiş olan hədis, vürud səbəbi göstərilmədən rəvayət edilən hədisdən üstün tutulur.

c) Bütün ravilərə görə mərfu (Peyğəmbərimizə aid) olaraq rəvayət edilən hədis, ravilərin çoxu tərəfindən mərfu olaraq rəvayət edilən hədisdən üstün tutulur.

d) Rəvayət şəkli ixtilfasız olan hədis, ixtilaflı olandan (fərqli-fərqli rəvayət ediləndən) üstün tutulur.

e) Ravinin hədisi bilavasitə aldığına dəlalət edən حدثنى (Mənə, hədis olaraq söylədi.), سمعت (eşitdim) kimi ləfzlərlə rəvayət edilən hədis, başqa ləfzlərlə rəvayət ediləndən üstün tutulur.

**1) Hədisin vürud zamanına görə seçilməsi**

Hədisin vürud zamanına görə seçilməsi aşağıdakı prinsiplərə görə edilir:

a) Mədəni (hicrətdən sonra) varid olan hədis, Məkki (hicrətdən əvvəl) varid olandan üstün tutulur.

b) Peyğəmbərimizin vəfatına yaxın varid olan hədis, daha əvvəl varid olandan ya da vürud zamanı bilinməyəndən üstün tutulur.

c) Çətinlik bildirən hədis, asanlıq bildirən hədisdən üstün tutulur.

**b. Hədisin ləfzinə görə seçilməsi**

Hədisin ləfzinə, yəni mətninə görə seçilməsi aşağıdakı kimi edilir:

a) Ləfzi xas (xüsusi hökm ifadə edən) hədis, ləfzi amm (ümumi hökm ifadə edən) hədisdən üstün tutulur

b) Ləfzi həqiqət olan hədis, ləfzi məcaz olan hədisdən üstün tutulur

c) Mənası açıq və dəqiq olan hədis, mənası açıq və dəqiq olmayan hədisdən üstün tutulur.

**c. Hədisin daşıdığı hökmə görə seçilməsi**

Hədisin hökmünə görə seçilməsi, bu əsaslar daxilində edilir:

a) Bir şeyin haram olduğunu bildirən hədis, o şeyin mübah olduğunu bildirəndən üstün tutulur.

b) Bir mövzuda yeni bir hökm gətirən hədis, o mövzudakı köhnə adəti ifadə edən hədisdən üstün tutulur.

c) Hökmləri, tətbiq etmədə ehtiyata daha yaxın olan hədis, digərindən üstün tutulur.

**d. Digər səbəblərə görə seçilməsi**

Hədislər arasında, göstərdiyimiz səbəblərdən başqa bu səbəblərə görə də seçilir:

a) Qurani-Kərimin zahiri (açıq) mənasına uyğun olan hədis, uyğun olmayandan üstün tutulur.

b) Eyni mövzudakı başqa hədislərlə dəstəklənmiş olan hədis, dəstəklənməmiş, yəni o mövzuda tək qalmış olandan üstün tutulur.

c) Rəşidi Xəlifələrin, yəni həzrət Əbu Bəkir, həzrət Ömər, həzrət Osman və həzrət Əlinin tətbiq etdikləri hədis, onların tətbiq etmədikləri hədisdən üstün tutulur.

## İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYAT


Aydınlı, Abdullah, *Hadis Tespit Yöntemi*, İstanbul 2003.

Bağdadi, Əbu Bəkir Əhməd ibn Əli ibn Sabit, *Təqyidul-elm*, Beyrut 1974.

-------------, *Tarixu-Bağdad*, Beyrut,trs.,

-------------, *Şərəfu əshabil-hədis,* Ankara 1971.

Bəlazuri, Əbu Abbas, *Futuhul-buldan,*( tərc. Mustafa Fayda), Ankara 2002.

Buxari, Məhəmməd ibn İsmail, *əl-Camius-səhih,* İstanbul 1987.

Çakan, İsmail Lütfi, *Hadis edebiyatı,* İstanbul 1997.

-------------------, *Anahatlarıyla Hadis,* İstanbul 1999.

-------------------, *Hədis Usulü*, İstanbul 1998

Darimi, Abdullah ibn Abdurrərman, *Sünən*, Mədinə 1386/1966.

Dehlevi, Əbdüləziz ibn Şah Vəliyullah, *Bustanul-Muhaddisin* (tərc. Ali Osman Koçkuzu), Ankara 1997.

Erdoğan, Mehmet, *Fıkıh və Hukuk Terimleri Sözlüğü*, İstanbul 1998.

Əbdürrəzzaq əs-Sənani, *Müsənnəf*, Beyrut 1983.

Əbu Davud, Süleyman ibn Əşas, *Sünən*, Misir 1371/1952.

Əcluni, İsmail ibn Məhəmməd, *Kəşful-xəfa,* Beyrut, 1351/1932.

Əhməd ibn Hənbəl, *Müsnəd*, Misir 1313.

Əli Nasif, *ət-tacul-cami ili-usul fi əhadisur-rusul*, Sana 1993.

Fazlur Rahman, *İslam*(tərc. Mehmet Dağ, Mehmet Aydın), Ankara 1981

Hakim ən-Neysaburi, *Mərifətu ulumil-Hədis*, Qahirə 1937.

Hakim ən-Nisaburi, *Marifətu ulumil-Hədis,* Qahirə 1937.

Hayri Kırbaşoğlu, *İslam Düşüncesinde Sünnet,* Ankara 1997.

Heysəmi, *Məcmauz-Zəvaid*, Beyrut 1982.

Həmidullah, Muhamməd *Məcmuatül-Vəsaiq*, Beyrut 2001.

İbn Əbdilbərr, *Camiu Bəyanil-ilim,* Qahirə 1388/1968.

İbn Ərraq, *Tenzihuş-şeria,* Qahirə trs.

İbn Həcər, əl-Əsqəlani**,** *Şərhu Nuxbətil-Fikər fi Mustalahi əhlil-əsər* (tərc.Talat Koçyigit), Ankara 1971.

-----------, *Fəthul-bari şərhu səhih Buxari,* Misir 1959.

İbn Həzm, *İhkam,* Misir 1345.

İbn Kəsir, Əbul-Fida İsmayıl ibn Ömər, *əl-Baisul-həsis şərhu ixtisari ulumil-Hədis*, Qahirə 1370

İbn Qüteybə, *Uyunul-əxbar*, Beyrut 1986.

İbrahim Canan, *Kutub-i Sitte Tercüme ve Şerhi*, Ankara 1994.

Koçyiğit, Talat, *Hadis Terimleri Sözlüğü*, Ankara 1992.

Koçyiğit, Talat, *Hadis Usulü,* Ankara 1997.

Qasımi, Cəmaləddin, *Qavaidut-təhdis,* Dəməşq 1353/1925.

Qəttani, Məhəmməd ibn Cəfər, *Risalətul-müstədrəfə li bəyani məşhuri kütübis-sünnətil müşərrəfə,* Qaraçi 1379/1960.

Malik ibn Ənəs, *Müvəttə*, Misir 1371/1951.

Müslim, Əbul-Hüseyin Məhəmməd ibn Müslim Həccac, *Səhihi-Müslim,* Misir 1374, İstanbul 1988

Nəsai, Əbu Əbdürrəhman Əhməd ibn Şuayb, *əs-Sünən*, Beyrut 1406.

Ramahurmuzi, Həsən ibn Əbdürrəhman, *əl-Mühəddisul-fasil beynər-ravi vəl-vai,* Beyrut 1971.

Selman Başaran, M. Ali Sönmez, *Hadis Usulü ve Tarihi*, Bursa 2001.

Süyuti, Tədribur-Ravi Şərhu Təqribin Nəvəvi, Misir, 1307,1379

Tahhan, Mahmud, Teysirul-mustalahil-hədis (tərc. Cemal Ağrıman), Sivas 1999.

Uğur, Mücteba, Hadis İlimleri Edebiyatı, Ankara

Yardım, Ali, *Hadis I-II,* İstanbul 2000.

Zəbidi, *Səhihi-Buxari muxtasarı Təcridi-sərih,*, (tərc. Müqəddimə Əhməd Naim), Ankara 1957.

Zəhəbi, *Təzkirətul-huffaz,* Heydərabad 1376/1956

## HƏDİS LÜĞƏTİ

### A

**Ahad hədis:** Hər təbəqədə bir ravi tərəfindən rəvayət edilən və sənədi müttəsil olan hədisdir.

Mütəvatir olmayan hədis növlərinin hamısına verilən ortaq ünvan. Mütəvatir olmayan hədis deməkdir

### C

**Cami**: Əqaid, əhkam, zühd, ədəb, təfsir, siyər, fitnələr, mənakib mövzularına aid hədisləri cəm edən əsələr deyilir.

**Cibril hədisi:** Peyğəmbərimiz əshabı ilə oturarkən, Cəbrayıl (ə.s) insan surətində gəlib, İslamı, imanı və ihsanı soruşanda Peyğəmbərimizin verdiyi cavabları bildirən hədis.

### Ə

**Əda**: Hədisi başqasına rəvayət etmək.

**Əşərəi-Mübəşşirə:** Cənnətlə müjdələnən on səhabəyə verilən ad.

**Əshab:** Peyğəmbərimizi (s) görən, onun söhbətində olan, iman edən və müsəlman olaraq ölən kəslərdir.

**Əsər:** (Xorasanlı fəqihlər) Hz. Peyğəmbərin dostları olan müsəlmanların (sahabənin) sözlərinə ***əsər*** demişlər.

**F**

**Fasiq:** Allahın yolundan azmış olan kəs, Onun hökmləriylə əməl etməyən kimsə.

**Fəsahat:** Düzgün, açıq, anlaşılan və gözəl söz söyləmə.

**Fitrət:** Yaradılış, təbiət, xarakter, xasiyyət.

**H**

**Hadis:** Sonradan olan, yaradılan.

**Həsən hədis**: Sənəddəki ravilərdən birisinin hafizəsi siqa ravilərin dərəcəsindən zəif olan, amma səhih qəbul edilən hədis.

**Həvari:** Hz. İsaya inanıb ona yardımçı olan xristianlara verilən ad.

**Hüdüs:** Sonradan var olmaq.

## X

| | |
|---|---|
| **Xas hədis:** | Bir nəfər üçün söylənmiş hədis. |
| **Xaşiyə:** | Əlavə izah, şərh, haşiyə. |
| **Xəbər:** | Hz. Peyğəmbərdən başqalarından rəvayət olunan sözlər üçün istifadə olunmuşdur. |
| **Xələf məzhəbi:** | Sonrakı dövrlərdə yetişən alimlərin fikirlərinin məcmusu. |
| **Xürafat:** | Heç bir dəlilə isnad olunmayan və əsli olmayan inanc və ya fikir. |

## İ

| | |
|---|---|
| **İsnad etmə:** | Söykəndirmə. Bir şeyi bir kimsəyə aid qılma. |
| **İsrailiyyat:** | Yəhudilikdən qalma əsilsiz xəbərlər. Həqiqətə zidd məlumatlar. |
| **İttifaq:** | Birləşmə, bütünləşmə. Fikir birliyi. |
| **İttiham etmək:** | Günahlandırmaq. |
| **İxtilaf:** | Ayrılıq, ziddiyyət, anlaşmazlıq. |
| **İxtilaful-hədis**: | Sağlamlıq dərəcələri eyni olub bir-birinə zidd olan hədislərin arasındakı ixtilafı çözməklə məşğul olan elmi sahə. |
| **İmam (hədis imamı):** | 300 mindən çox hədisi raviləri ilə bərabər əzbərləyən hədis alimi. Buna hədis müctəhidi də deyilir. |

## K

**Kütübü-sittə**: Hədis kitablarının sağlamlığına görə ən qüvvətli olan altı kitaba verilən ad. (Buxari, Müslim, Tirmizi, Əbu Davud, İbn Macə, Nəsai)

## Q

**Qavi hədis**: Rəsulullahın hədis söylədikdən sonra, arxasınca ayə oxuduğu hədis.

**Qərib hədis:** Sadəcə bir şəxsin bildirdiyi səhih hədis. Həmçinin, aradakı ravilərdən birinə, bir hədis aliminin müxalifət etdiyi hədis.

**Qüdsi hədis:** Mənası Allaha, kəlmələri isə Peyğəmbərə aid olan hədis.

## M

**Məqtu hədis**: Söz və ya felin tabiiyə aid olan hədis.

**Mərfu hədis**: Peyğəmbərə (s) aid olan hədis.

**Mərdud hədis:** Mənası olmayan və rəvayət şərtlərini daşımayan hədis.

**Məşhur hədis:** Təvatür sayına çatmadan, hər təbəqədə ən azı üç və daha çox ravisi olan hədislərə məşhur hədis

**Mənsux hədis**: Peyğəmbərimiz tərəfindən ilk zamanlarda söylənib, sonra dəyişdirilən hədis.

**Möhkəm hədis**: Təvilə (yoruma, açıqlamaya) möhtac olmayan hədis.

**Mövsul hədis**: Səhabinin, "Rəsulullahdan eşitdim, belə buyurdu"-deyərək xəbər verdiyi hədis. Bunda, Rəsulullaha qədər rəvayət edənlərin heç birində kəsinti olmaz.

**Mövquf hədis**: Söz və ya felin səhabəyə aid olan hədis.

**Mövzu hədis**: Uydurma hədis. (Saxta hədis)

**Mövzuat kitabları**: Əsilsiz olduqlarını bildirmək məqsədi ilə hədisləri toplayan əsərlər.

**Müctəhid:** İslam hüququnda kifayət qədər biliyə sahib olub, mənbələrdən hökm çıxarma səlahiyyətini qazanmış şəxs.

**Müdərris:** Mədrəsədə təlim-tərbiyə ilə vəzifəli olan şəxs. Professor .

**Müəlləq hədis:** Başından bir və ya bir neçə və yaxud heç bir ravisi bilinməyən hədis.

**Müfəssir:** Təfsirçi. Təfsir elmində söz sahibi olan şəxs.

**Münfəsil hədis:** Aralardakı ravilərdən birdən çoxu unudulmuş hədis.

**Müftəra hədis:** Müseyləmətül-kəzzabın və ondan sonra gələn münafiqlərin, zindiqlərin, müsəlman görünən dinsizlərin uydurma sözləri. Əhli sünnə alimləri müftəra hədisləri araşdırıb taparaq ayırmışlar. Din alimlərinin kitablarında belə sözlərdən heç biri yoxdur.

**Mürsəl hədis:** Səhabənin ismi söylənmədən, tabiin nəslindən birinin bilavasitə Peyğəmbərdən "Rəsulullah belə buyurdu"-deyərək rəvayət etdiyi hədis.

**Müshəf:** Qurani-Kərimin kitab halına gətirilmiş şəklinə verilən ad.

**Müsnəd**: Hədisləri,səhabə ravilərini əsas alaraq sıralayan əsərlərə verilən ad.

**Müsnəd münqatı hədis:** Səhabidən başqa bir və ya bir neçə ravisi bildirilməyən hədis.

**Müsnəd müttəsil hədis:** Peyğəmbərə qədər ravilərdən heç biri əksik olmayan hədis.

**Mütəvatir hədis:** Doğru sözlü, güvənilir, bir çox kəs tərəfindən qəbul edilib bildirilmiş olan doğru xəbər ya da məlumat.

**Müttəqi:** Təqva sahibi. Allahdan qorxan və onun əmrlərini yerinə yetirib, qadağan etdiklərindən həssaslıqla uzaq duran müsəlman.

**Müttəsil hədis**: Sənədində kəsiklik olmayan hədis.

**Mühəddis(hədis alimi)**: Hədis sahəsində mütəxəssis. Çox hədis toplayıb, sənəd və mətnlərilə əzbərləyən, ravilərin cərh və tədil baxımından vəziyyətlərini bilən, bu elm sahəsində ixtisas qazanıb kitablar yazmış olan alim.

**N**

**Nazil**: Sənəddəki ravi sayısının çox olması.

**Nəqdir-rical**: Hədis rəvayət edən şəxslərin rəvayət əhli olub-olmadığını araşdıran elm sahəsi (cərh və tədil də deyilir).

**R**

**Ravi:** Hədisi rəvayət edən şəxs.

**S**

**Səhih hədis:** Doğru, düzgün, sağlam və səhhətli .

**Səma**: Hədisi tələbənin şeyxindən dinləməsi, eşidməsi.

**Sənəd**: Hədisi rəcayət edən ravilərdən ibarət zəncir.

**Şeyx**: Ravinin hədisi aldığı kəs. Hədis müəllimi.

| | |
|---|---|
| **Siqa**: | Hədis rəvayətinə əhil olan şəxs. Güvənli ravi. Ədalət və zəbt sifətlərinə tam olaraq sahib olan ravi. |
| **Sünən**: | Sadəcə namaz, oruc, təharət və.s ehkam hədislərini ehtiva edən əsərlər. |

**T**

| | |
|---|---|
| **Tabiun:** | Səhabəni görmüş və onlardan elm öyrənmiş |
| **Talib**: | Hədisi alan ravi. Hədis tələbəsi. |
| **Təbəut-Tabiin:** | Tabiini görmüş və onlardan elm öyrənmiş olan müsəlman kimsə. |
| **Təhrif etmək:** | Əslini dəyişdirmək. |
| **Təsəlsül:** | Bir şeyin bir-birinə bağlı olaraq ardıcıl şəkildə gəlməsi. Zəncirləmə. |
| **Təsnif:** | Sinifləndirmə. Qruplandırma. |
| **Təvatür:** | Hər əsrdə güvənilən bir çox kimsə tərəfindən qəbul edilib bildirilmiş olma. Doğru xəbər. |

**V**

| | |
|---|---|
| **Vədda:** | Hədis uyduran kəs. |

## Z

**Zəbt**: Hafizənin qüvvətli və ya zəif olması xüsusiyyəti.

**Zəif hədis**: Ümumiyyətlə səhih və həsən hədisin şərtlərini, sənəddəki kəsiklik, ravilərin bir və ya bir neçəsinin zəif olması, illət və digər səbəblərə görə özündə cəm etməyən hədis.

# MÜNDƏRİCAT



## BİRİNCİ BÖLMƏ
## HƏDİS ELMİNƏ AİD BƏZİ TERMİNLƏR

## İKİNCİ BÖLMƏ
## HƏDİS ELMİNİN FORMALAŞMASI

## ÜÇÜNCÜ BÖLMƏ
## HƏDİSLƏRİN TƏSNİFATI

# DÖRDÜNCÜ BÖLMƏ
# HƏDİS ƏDƏBİYYATI

## BEŞİNCİ BÖLMƏ
## HƏDİS ELMLƏRİ